Tarix üzərinə təktərəfli yanaşmalar və ona mədhiyələr yağdırmalar, tarix bilincinin inkişafını önləyərək düşüncə imkanlarını qısıtlamışdır. Bu əsərdə Türk tarixi üçün bilinməyən “şüubiyə”nin fəaliyəti üzərində durulmuş, Səfəvilərlə şüubiyə hərəkətinin əlaqələri geniş ölçüdə araşdırılmışdır. Kitabda Səfəvi kimliyinin doğuşu və iqtidara yüksəlişi bir çox qaynaqlar araşdırılaraq incələnib dəyərləndirilmişdir.

***Heç bilənlə bilməyən bərabər olurmu?***

Quran-Kərim 39-cu surə (Zumər) 9-cu ayət.

**İçindəkilər**:

## İkinci yayına ön söz

“Səfəvilər” kitabının birinci yayını oxucular tərəfindən yaxşı qarşılandı. Kitabı alqışlayan və tənqid edənlər oldu. Birinci yayında bir çox yazı xətaları da mövcud idi. İkinci yayında bu xətalar qaldırılmışdır. Ancaq bəzi yazı quralları ortaq Türkçəyə görə düşünülmüşdür. Bunlar imla xətaları olaraq görülməməlidir. Türkçənin ortaq tələffüzünə və ortaq imlasına doğru atılan addımdır. Örnəyin “ğu, ğun” əklərinin yerinə ağzımızda tələffüz etdiyimiz kimi “qu-qun” qullanılmışdır. “Duyğu-uyğun” kimi sözlər daha yumşaq tələffüz biçiminə görə “duyqu-uyqun” olaraq yazılmışdır. “Ğ” hərfi bu kimi törəmə sözlərdə dilimizdəki tələffüzü Türkçənin genəl musiqisindən ayıraraq Ərəbcənin və Farsçanın tələffüz biçiminə yaxınlaşdırır. Bunun dışında geniş ölçüdə kitabda Türk dilinin “ünsüzlərin

bənzəşimi” quralına uyulmuşdur. Türk dilində əklərin ilk hərfini kök sözün son hərfi özünə bənzəşdirər. Kök sözün son hərfi küysüz ünsüz isə, ona əklənən ək də küysüzləşər. Küylü isə, əkin də ilk hərfi küylüləşər. Bu, Türkçənin ahəng və bənzəşim quralıdır. Bütün sözlərə “çı” əki əkləmək dilin musiqisini pozmaqdadır. Burada əkin “cı”, ya da “çı” olmasını kök sözün son hərfinin küylü, ya da küysüz olması bəlli edər. “Balıqcı-yalancı-dəmirci-yabancı” kimi sözlərdə ək doğru olduğu kimi “siyasətçi, bəkçi, savaşçı” kimi sözlərdə də doğrdur. “Gi-ki” əkləri də bənzər biçimdə qullanılmışdır. Sonu küysüzlə bitən kök sözə “gi” və sonu küylü ilə bitən kök sözə “ki” əklənmişdir. “Bilgi, silgi” və “etki, təpki” örnəklərində olduğu kimi. Bu kitabın ortaq Türkçənin oluşumunda və tarix bilgilərimizin sorqulanmasında etkli olmasını ümid edirəm.

guntay_1@yahoo.com

## Ön söz

Tarix yazarlığı bir aydınlanma hərəkətdir. Keçmişi və indiki zamanı aydınlığa qovuşdurma çabasıdır. “Aydınlanma nədir?” sorusunu soran Kant düşüncələrini açıqlayaraq bu sualı özət olaraq ağlın qullanılması şəklində cavablamışdı. Aydınlanma geniş anlamı ilə həm də tarixi aydınlatmaqdır. Çünkü tarixdən gələn dürtülər günümüzdə insan ağlını öz basqısı altında tutaraq ağıl düzənəyinin (mexanizmasının) çalışmasını öz etkisi altına almaqdadır. Batıda Renesansla başlayan sürəc tarixdəki

olumsuzluqların indiki zamanı əsir almaması yönündə çalışmalar bütünü olmuşdur. Bu nədənlə tarixi aydınlatmaq insan ağlının görəvlərindən biri olsa gərək. İnsan qurtuluşu, dolayısıyla tarixin qurtuluşu ilə mümkündür. Keçmiş zamanlarda bəsit inancların karizmatik öndərlərinin uyquladıqları yaşam biçimi sonsuza qədər insan həyatını öz etkisi altına almamalıdır. Dini mətnlər üzərinə yapılmış olan açıqlamalar hər zaman ağlın yarqısına açıq olmalıdır. Olmazsa, bütün dönəmlər keçmişdəki bəlli bir dönəmin əsarətində bulunar. Doğuda və batıdakı orta çağ qaranlığı da bu olmuşdur. Bütün dönəmlər bəlli bir dönəmin əsarətinə keçmişdir.

Bu açıdan tarix yazarlıq, yalnızca zamanlama sırasıyla olayların ard-arda düzüşümü deyildir. Tarix yazarlıq bunun yanı sıra bir də insan ağlının tarixiliyini göz önündə bulunduraraq aydınlanma görəvini də üstlənməlidir. Aydınlanmanın tək yolu soru sormaqdır. Çünkü böyük həyəcanlarla qurulmuş olan sistemlər öz içində qapanmışlığı arxasınca gətirər. Toplumsal quruluşlar bu şəkildə olmuşdur. Sovet devrimindən tutmuş başqa quruluşlara qədər bənzər yazqı yaşamışlar. Səfəvilik də, Osmanlılıq da qapanmışlıq içində davam edən sistemlər olmuşlar. Osmanlı qapanmışlığı ortadan qaldırılmışdır.* Ancaq Səfəvi qapanmışlığı çox güclü bir şəkildə davam etməkdədir. Həm düşüncələrdə, həm

* Cəmil Meriç bir neçə əsərində, özəlliklə “Sosyoloji notları” əsərində Osmanlının öz qapanmışlığının qaranlığında boğulduğunu söylər.

gələnəklərdə, həm də sosial-siyasi bir düzən olaraq İran ortamında davam etməkdədir. Bu qapanmışlıq davam etdikcə də heç bir qurtuluş söz qonusu olamaz.

Qapanmışlıq heç bir zaman insan tərəfindən açılmaz. Yalnız insan çabası olmadan da kəndi başına açılamaz. Qapanmışlığın açılması üçün necə hazırlıq yapıla bilər? Hər halda suallardan qaçaraq deyil, soru soraraq bu qapanmışlığın açılımına olanaq sağlamaq olar. Soru sormaq qapanmışlığın içində nəyin egemən olduğunu düşünməkdir.[1] Bu açıdan tarix fəlsəfəsinin əsas amacı tarixi aydınlatmaq, tarixə ışıq tutmaqdır. Tarixi oluşdurmaq və ya tarixi yenidən qurmaq deyildir. “Işıq aydınladar, oluşdurmaz.”[2] Keçmişin doğrularını kəşf etmək və doğru olmayanları ifşa etmək, yalnız bu ışıq dolayısıyla mümkün ola bilər. Bu açıdan tarix, keçmiş olayların bitmişliyi haqqında bilgidən ziyada günümüzdə ağlımızı qurcalayan və yeni soruları ilə bizdən cavablar bəkləyən düşündürücü yataq kimi qarşımıza çıxar. Martin Heidegger “keçmişin kökü gələcəkdədir”[3] söylər. Tarixi aydınlatmaq bu açıdan gələcəyə doğru aydınlatma çabaları içinə girməkdir. Tarixi incələmək onun bataqlıqlarında ilişib qalmaq deyil, gələcəyə doğru yeni bir yol açmaqdır. Yoxsa günümüzdə davam edən əskiliklər gələcəkdə də öz basqıcıl yöntəmlərini sürdürəcək, düşüncələri susduracaqdır. Bu

[1] Ünal Nalbantoğlu “Martin Heidegger ve modern çağ” İmge kitabevi 1997 s. 24.
[2] Eyni qaynaq s. 25.
[3] Eyni qaynaq s. 61.

bağlamda tarixi bir olqunu fenomenolojik yanaşma ilə dəyərləndirməkdə yarar var. Yəni "bilincə görünən şeyi incələmək"[4] və görünənlərdən görünməzlərə doğru hərəkət. Olayı bilgilərinə, davranışlarına və ülkülərinə görə incələmək gərəkir. Bu kitabda mən Səfəvi olayına bu açıdan yanaşmağa çalışmışam. Səfəviyətin tarixi gəlişmə sürəci necə olmuşdur? Səfəviyətin bilgiləri və din üzərinə açıqlamaları necə olmuşdur? Səfəviyətin ülküləri, idealları nələr olmuş və nələri gerçəkləşdirmək istəmişlər? Gerçəkləşdirdiyi ülküləri bölgə həyatının gələcəyini, özəlliklə Azərbaycanın gələcəyini necə etkiləmişdir? Bilgiləri və ülküləri arasındakı davranış şəkilləri necə olmuşdur? Fenomenolojik yaxlaşım olayı "bilgi, davranış və ülkü" üçlüyü bağlamında incələr. Bu yöntəmlə səfəviyəti incələməyə çalışmışam. Bu yöntəm kəndiliyindən tənqidi yanaşmanı da bərabərində gətirəcəkdir.

Hər tarixi olqunun mərkəzində kəsinliklə güclü bir inac mövcud olmuşdur. Mərkəzdə duran bu inanc kəndi yan dirəklərini, yəni siyasi, əxlaqi, iqtisadi və kültürəl söyləmlərini oluşdurmuşdur. Bu bağlamda tarixi fenomenin arxasında gizlənmiş olan inancın incələnməsi bir çox sorulara cavab verə bilər. Yalnız siyasi dönüşümlər (transformasion) üzərinə dayanaraq tarixin aydınlığa qovuşması mümkün olmayacaqdır. Bu açıdan tarix metdolojisi olaraq aşağıdakı yöntəmlə olayları bir bütün şəklində

[4] Jean- Françios Lyotar "Fenomenoloji" Dost kitabevi yayınları, 2007- Ankara, s. 9.

incələmə bir çox sorular oluşdurar və bir çox sorulara cavab verməyə çalışar:

1- Siyasi dönüşüm tarixi. Siyasi iqtidarın şəkillənmə sürəcini incələmə, yalnızca durumun olqunlaşmış şəklini incələməklə yetinməməlidir. Toplumun içindəki siyasi duyqunun dialektik etmənlərini (faktorlarını) ələ alaraq sorular sormalı, sorqulamalıdır. Siyasi niyyətin tarixi və dini köklərinin toplumsal yaşamdakı yeri bəlirlənməlidir. Örnəyin yurdunu və varını-yoxunu Anadoluda buraxıb Azərbaycana qoşan qızılbaşların siyasi yüksəlişlərinin tarixi niyəti nə idi?

2- Dini dönüşüm tarixi. Məzhəbi və dini inancların içəriyi incələnmədən siyasi hərəkətliliyə nədən olan əxlaqi dürtülər də bilgi olaraq bilinməyəcəkdir. Bütün mədəniyyətlərin orta dirəyi bir inanc olmuşdur. Bu inanc bir din və ya məzhəb biçimində somutlaşmışdır. "Mədəniyyət, bir inanc və əxlaq düzəni olaraq kültür doğuran ruh enerjisi və ilham qaynağıdır."[5] Heç bir siyasi və toplumsal hərəkət inancsız oluşmamışdır. Böyük Moğol imperatorluğunun mərkəzində bir inanc durmuşdu. Çingiz Xan azınlıqda olan Moğollara böyük bir inanc aşılamışdı. Bu inanc və bu inanca bağlı siyasi və əxlaqi düzən çərçivəsində dünyanın ən böyük imperatorluğu azınlıqda olan bir qövm tərəfindən qurula bilmişdir. Müxtəlif qəbilələr biçimində Sasani və Bizans əlində oyuncaq olaraq qullanılan Ərəbləri də İslam inancı bütünləşdirərək dövlət və imperatorluq

[5] Yılmaz Özakpınar "İnsan düşüncəsinin boyutları" Ötüken yayınları 2000, s. 205.

qurma yoluna sövq etmişdi. “İnanc və iman insan həyatında biolojinin doğurduğu psikolojik bir ehtiyacdır.”[6] Sosial psikolojinin qaynaşması və coşması olmazsa, heç bir siyasi hərəkət olmaz, heç bir dəyər icad ediləməz. Siyasi qalxınmalar və dəyərlərin icadı bir inanc mehvərli gəlişmələrin ürünüdür. Bu bağlamda səfəviliyi tarixə soxan inanc nə idi? Hansı imkanları öz yapısında barındırmaqda idi? İnanc həm viran edici, həm də yüksəldicidir. Bunun örnəklərinə tarixdə çox rast gəlinməkdədir. Ələvi inancındakı coşqular nəyi icad etdi? Nədən icad etdi? Nədən icad edilən miras qızılbaşların özünə qalmadı da başqa bir etnosu yüksəldib tarixə soxdu? “Tarixin verdiyi ən önəmli dərs budur ki, dinin min canı var. Hər ölümündən sonra yenidən dirilib canlanar.”[7] O zaman hər dirilişində və ya hər yüksəlişində bu qədər zərərli olmaması üçün dinin ussallaşdırılması (rasionalizasionu) necə mümkün ola bilər? Tarix bir çox rəqabətlərə meydan olduğu kimi bu rəqabət inanclar arasında daha qanlı olaraq canlılığını sürdürmüşdür, sürdürməkdədir. Bir dinin öz içindən parçalanaraq məzhəblərə dönüşməsi, daha sonra o məzhəbin yenidən başqa təriqətlərə və məzhəblərə dönüşməsi bu rəqabətin göstərgəsidir.

3- Düşüncələrin dönüşüm tarixi. Doğuda tarixi sürəcdə düşüncənin ya rolu olmamış, ya da axsaq olmuşdur. Doğu tarixi düşüncə yatağından daha çox inanc yatağı olmuşdur.

[6] “Türk yurdu” dergisi sayı 134 Yılmaz Özakpınar “Tepkiler tarixi”

[7] Will Dunrant “Mədəniyət tarixi” giriş kitab.

Mövcud düşüncələr də siyasi həyatı etkiləməmişdir. Sadəcə inancın qurallarına uymaq düzeyində insan ağlı qullanılmış, bunun ötəsinə çıxmaq istəyən ağıl susdurulmuşdur. Doğu tarixində siyasi fəlsəfənin doğmaması da bu üzdən olmuşdur. Siyasi fəlsəfə ussal (əqli) çalışmaların ürünüdür, inancsal çalışmaların deyil. Siyasi fəlsəfə soru sormağa imkan tanıyan siyasi ortamlarda gəlişə bilər. Siyasi fəlsəfə mütləq qurallar üzərində inşa ediləməz, düşüncələrin düşünülməyə açıldığı ortamda ortaya çıxar. Şərq tarixinin siyasi fəlsəfədən yoxsun olaraq modern çağda batılılaşmağa üz tutmasının səbəbi bu olmuşdur. Bu baxımdan düşüncə tarixi açısından Doğu tarixində yoxsunluq açıqca görünməkdədir. "Tarix, tarix haqqında bilginin və düşüncənin oluşduğu yerdədir."[8]

4- Elmin dönüşüm tarixi. Burada tarixi sürəc içində elmi buluntular ortamının incələnməsi ilə tarixə elmi yanaşma bir yerdə ələ alınır olsa gərək. Elmi tapıntılar öz qoşulları içində gəlişmiş olur. Elmi buluntular və tarix üzərinə elmi incələmə söz qonusudur. Elmin tarixi və tarix elmi. Tarixin elmi analizi səbəb araşdırmaq, nəticəni gözləmləmək, səbəb-nəticə ilişkilərinin dialektik bağlantılarını incələməklə mümkündür. Bunun təməlini tarixdə İbni-Rüşdün dərin etkisi altında olan İbni-Xəldun qoymuşdur. Yalnız elmi incələmə ilə də tarix aydınlatılamaz. Çünkü "tarixdə də elm və siyasət kimi nisbilik hakimdir

[8] Karl Yaspers "Tarixin başlanqıcı və sonu" Farscaya çevirən Məhəmmədhəsən Lütfi, Xarəzm yayın evi (1363 h.ş) Tehran, s. 49.

və bütün verilərə şübhə ilə yanaşmaq gərəkir."[9] Elmin oluşduğu tarixi ortamların incələnməsi tarixi gerçəklərin anlaşılması doğrultusunda ipucları verə bilər. Ancaq "tarix qismən elmdir. Elmdən daha çox sənət və fəlsəfədir."[10] Gerçəyi bulma sənətdir.

5- Sənətin dönüşüm tarixi. Sənət türlərinin tək-tək incələnməsi tarixi fenomenin idrakına qolaylıq sağlar. Bu açıdan tarixə yanaşma özü də bir sənətdir. Sənətçi bir ruh halı və sənətçi dünya görüşü ilə sənətsəl verilərin incələnməsi üzərində duruldüğunda tarixi gerçəklərin alqılanma imkanları artmış olur. Bütün dövlətlər əsasən öz inanc və iqtidar imkanlarını memarlıqlarında sərgiləmişlər. Memari bir əsər siyasi iqtidarın iqtisadi imkanlarının, onun dünyaya baxışının və inancının göstərgəsi olmuşdur. Bu bağlamda üç tür memarlıqla qarşı-qarşıya gəlməkdəyik: 1- Dini memarlıq. 2- Savunma nitəlikli hərbi memarlıq. 3- Sivil memarlıq. Bu üç memarlıq sənəti eyni zamanda bir yerdə olmaya bilər. Ancaq hər halda zaman durumundan asılı olaraq hansısa daha ön planda olmuşdur, ya da bir yerdə olmuşlar. Örnəyin Səfəvi dövləti oturuşduqdan sonra sünni dünyagörüşünün, sünni məzhəbinin memarlıq görüntülərini sərgiləyən camiləri yıxdı, şiə məzhəbinin memarlıq görüntüsünü onun yerinə icad etdi. Bir şeir parçası, bir rəsm əsəri, ədəbi bir mətn də dönəmin sosial psikolojisində çağlayan duyquların, inancın içəriyi haqqında bilgi verə bilər. Bu sənət türlərindəki görüntülər

---

[9] Will Duran "Mədəniyyət tarixi" giriş kitab.
[10] Eyni Qaynaq.

bəlli tarixi sürəcdəki durumun metafizik baxışlarını açıqlamış olar. Metafizik baxışlar özəlliklə dildə qavramsallaşdırılar. Örnək üçün Səfəvilərdən sonra türk dilindəki metafizik qavramlar kökdən dəyişimə uğradı. Türk dilinə əskidən mövcud olmayan anlamsız və anlamsızlaşdırıcı yabancı sözlər əkləndi. Səfəvi dövlətinin quruluşuna gətirib çıxaran dil ürünlərinin incələnməsi ilə Səfəvi sonrası dil ürünlərinin incələnməsi iki fərqli pozision ortaya qoymaqdadır. Birinci sürəc Ələvi yüksəlişidir və ikinci sürəc Ələvilərin siyasətdən və mədəni həyatdan uzaqlaşdıran fars şiəçiliyinin yüksəlişdir.

İngiliz Filosof Maykl Okşat[*] ilginc bir tarix metodolojisi gəlişdirmişdir. Okşata görə təcrübə dünyası fəlsəfə, tarix, elm və əməli bir yerdə bir bütün olaraq içərməkdədir.[11] Fəlsəfi təcrübə önvarsayımsız bir təcrübədir, mükəmməlliyə doğru yönəlişdir. “Fəlsəfədə parçanı bütünün ışığında görməyə çalışırıq. Tarix fəlsəfəsində indiki zamanı keçmişin ışığında görmək və yorumlamaq istəyirik.”[12] Təcrübə düşüncələrdən oluşan bir dünyadır. Fəlsəfə bu təcrübələrin bütününü içinə alar. Tarix, elm və əməl üzərinə fəlsəfi bir baxışla yanaşa bilərik. Ancaq fəlsəfəni elmi, tarixi və əməli olaraq yorumlaya bilmərik. Bütün təcrübənin qonusu düşüncələrdir.

[*] Michael Oakeshott

[11] “Ettelaate siyasi-iqtisadi” dərgisi ”20-ci əsrdə siyasi hərəkətlərin və düşüncələrin tarixi” Michael Oakeshott “Təcrübənin boyutları” , il 1375, sayı 105-106, s. 4-10.

[12] Will Duran “Mədəniyət tarixi” giriş kitab.

Təcrübənin bir yönü olaraq tarix, tarixçinin ürünüdür. Olduğu kimi keçmiş zamanı anlamaq mümkün deyildir. Tarix bir fenomen olaraq mövcddur. Fenomen olaraq nə olduğunu anlaya bilmərik, anlamağa çalışarıq. Bir də bilgi olaraq insan qafasında tasarlanan tarix mövcuddur. Tarix bilgisi olaraq. Tarixçilər həm tarixi yaradırlar, həm də yaratdıqları tarix haqqında obyektiv meyarlar oluşdurmağa çalışırlar. Ancaq tarixçinin təsvir etdiyi keçmiş zamanla keçmişdə insanların təcrübəsi olaraq gerçəkləşən tarix arasında fərq vardır. Tarix keçmişi keçmiş üçün açıqlamaqdır. Tarixi yazmaq onu oluşdurmanın tək yoludur. Əməl dünyası da təcrübənin bir başqa boyutudur. Əməl, iradəni təhrik edən bir düşüncə şəkli olaraq açıqlanmalıdır. Ancaq əməl dünyasında düşüncənin həqiqəti, tarixi, elmi və fəlsəfi təcrübədəki düşüncənin həqiqətindən fərqlidir. Məzhəb və əxlaq da təcrübənin əməl qatına aiddir. Çünkü bunlar yaşantının ayrılmaz parçalarıdır. Okşata görə hər məzhəb əməli yaşam üçün bir sürü davranışları caiz sayar. Hər məzhəbin də gerçək üzünü onun metafizik anlayışında deyil, əməldə uyqulamaq istədiyi davranış biçimlərində axtarmaq gərəkir. Çünkü məzhəblər əslində düşünmə metodları deyil, yaşama metdodurlar. Elmi təcrübə səbəb-nəticə dialektikası bağlamında ələ alına bilər. Elmi düşüncənin “yalnız əqli çərçivə var və insanın bütün tanımlarını onun içində yerləşdirmək olar” kimi iddiası, özəlliklə tarix planında qəbul ediləməz. Təcrübənin elmi qatının digər qatlara üstünlük təşkil etdiyini savunmaq olmaz. Təcrübələrin müxtəlif dünyaları var və hər

dünyanın da öz daxili tarixi və məntiqi vardır. Fəlsəfənin də təməl amacı təcrübənin müxtəlif yönlərini kəşf etməkdir. “İnsan qüdrət arxasınca qoşan varlıq olaraq zamana bağlıdır, keçmişinə görə tutum sərgilər və buna görə bir gələcək istər.”[13] Bəzi keçmişlərə görə tutum sərgiləmək indiki zamanı və gələcəyi də tutumsuzluğa batırmış olar. Keçmişə görə tutum sərgiləmək yerinə, keçmişin indiki zaman müdaxiləsini mümkün olduqca əngəlləmək gərəkir.

Yaşantı olaraq davam edən tarixi, açıqlamaq çətin olmasa gərək. Çünkü gələnəklər zaman içində qeyri-şüuri olaraq gəlişər və təcrübənin özəlliklərini özündə əks etdirər. Səfəvilik hələ tarixə gömülməmişdir. Onun gələnəkləri davam etməkdədir. Yaşantı və gələnəkdə davam edir. Örnəyin Osmanlı artıq tarixin arşivində, ancaq Səfəvilik öz törələri, nifrəti, lənəti, “təbərra”, “təvəlla” və “təqiyyə” kimi gələnəyi ilə davam etməkdədir, özəlliklə İrandakı İslam Devrimi Səfəviliyi güncəlləşdirdi. Bu bağlamda bu gələnəyi yaşadanların bu sürəclə zehnlər arası ilişkiləri incələnərək səfəviyət üzərinə geniş bilgi əldə etmək mümkündür. Burdaca tarix fəlsəfəsinin önəmli düşünürlərindən biri olan Kolinqvudun[**] bu anlatısını xatırlatmam gərəkəcək. Kolinqvud deyir ki, bilimin doğanı açıqlaması kimi, tarix fəlsəfəsinin tarixi anlama və açıqlama çabası olmalıdır.

Bu zehniyətlə Səfəvilər üzərinə araşdırmalarımı mətnləşdirmək qərarına gəldim.

---

[13] Babək Əhmədi “Heidegger və köklü sorular” s.560.
[**] Colingwood.

Ümumən rəsmi tarix görüşləri tarixi öz çıxarları doğrultusunda və duyqusal ehtiyacları gedərmək amacı ilə açıqlayıb, bəzən də onu idealizə edib yaşayan nəslin zehnini tarixin dumanlığında həbs edər. Tənqid gerçəklərin ortaya çıxışına zəmin yaradar. Doğu ölkələrində yayqın olan tarixpərəstlik bu türdəndir. Nitşe Almanların tarix heyranlığına qarşı savaş başlatmış və Heidegger kimi onun davamçıları da bu yolda yürümüşlər. "Almanların tarix heyranlığı bir tür cahilcə məftunluqdur."[14] Tarix heyranlığından qurtuluş olmadan tarixi gerçəkləri anlamaq və dolayısıyla gələcəyə doğru aydınlıq ortamı oluşdurmaq da mümkün olmayacaqdır. Çünkü anlam və anlamsızlıq oluşdurmaq da bu yolla mümkün olur. Teodor Lisinq[*] "Tarix anlam və anlamsızlıq oluşduran bir durumdur"[15] deyir. Tarix üzərinə yanaşım biçimi ilə indiki zamanı dərinləşdirmək və düşüncəni hərəkətləndirmək də olar, indiki zamanı keçmişin nostaljisi içində duyqulanıb duran duruma da çevirmək olar. Bu məntiqlə yola çıxaraq bizim nəsil üçün də tarixlə qarşılaşmanın zamanı gəlmişdir. Yeni tarixə girmənin də yolu bu tarixlə inancda və düşüncədə qarşılaşmaqdan keçməkdədir.

Nədən Səfəvilər üzərində durmamın bir cavabı vardır. Mənə görə İslam sonrası türk tarixinin ontolojisi və sürəci içərisində səfəviyət

[14] Babək Əhmədi "Heidegger və köklü sorular" s. 652.
[*] Theodor Lessing.
[15] Babək Əhmədi "Heidegger və köklü sorular" s. 652.

yer almamaqdadır. Türk tarixi və türk kimliyi Səfəvilərlə eyni zamanda öz mehvərindən çıxaraq yabancıya təslim edilmişlik sürəci içərisinə girmişdir. Özəlliklə bu sürəc, nəticəsi etibarı ilə başqa bir istiqamətə yönəlmişdir. Bölgə tarixi yanlış yönə sapmışdır. Bu sürəcin nəticəsi öncə İran Pəhləvi və daha sonra molla rejimi olmuşdur. 19-cu əsrin sonlarına doğru ortaya çıxan milli düşüncə və modern dövlət yapısı oluşdurma doğrultusunda İranda və Qafqazlarda düşünsəl çalışmalar ortaya çıxmışdır. Səfəviliyin nəfəsi ilə zəhərlənmiş, düşüncəsi devşirilmiş türklər modern fars milliyətçiliyinin əsasını oluşdurdular. Yüzlərcə oxumuş insandan oluşan bu qələm sahiblərinin içində fars insanı yox dərəcəsindədir. İranda sayı 1-2 milyon arasında olan türkmənlər fars milliyətçiliyinin fikirsəl oluşumu yolunda qatqıda bulunmadılar. Bir tək türkmən, kürd, bəluç və ərəb yoxdur bu axımın içində. Yalnız Səfəvi tətbiqatı sürəcində Səlcuqluya, Elxanlıya, Qaraqoyunluya, Bayındırlıya mənsubiyət duyqusunu itirmiş və tarixi hafizəsi zədələnərək səfəviyətə qapanmış olan türklər fars milli dövlətinin quruluşu yolunda fikrən, hissən və təşkilatçılıq olaraq siyasi fədakarlıqda bulundular. Tək səfəvizədə türklər bu gün, hətta ana dilində yazıb-oxuma kimi ibtidai haqlardan yoxsunlar. Səttar Xan kimi qəhrəmanlar yetişdirmişdir Səfəviyət. Nə istədiyinin bilincində olmayan. “Nədən savaşırsan?” sorusuna Səttar Xan “Nəcəfi-əşrəfin ayətullahlarının buyuruqları

yolunda cihad edirəm”[16] cavabını vermişdi. Türk-İslam tarixində qurulan dövlətlər əsasən bir türk boyunu təməl alaraq qurulmuşdu. Səlcuqlar qınıq, Osmanlılar qayı, Bayındırlılar bayındır, Qaraqoyunlular baharlı boyundan olmuşlar. Yalnız Səfəvilər bu gələnəyin dışına çıxaraq özlərini ərəb soylu bilmiş, soylarını şiənin 7-ci imamı olan Musa Kazıma bağlamışlar. Bu, Səfəvilərin türklük orbitindən çıxmasının başlanqıc nöqtəsi olmuşdur.

Təbriz mərkəzli məşrutə nə istəyirdi? Məşrutənin hazırladığı ana yasanın birinci maddəsi bu idi: “Məclisə girən və dövlət orqanında çalışan hər kəs fars dilini bilməlidir.” Səttar Xan özü də fars dilini bilmirdi. O zaman nəyin yolunda savaşırdı? Sadəcə Səttar Xan deyildi nə istədiyini bilməmiş olan. Məşrutənin məramnaməsini yazan da səfəvizədə türklər idi. Hansı millətin tarixində belə şey var ki, nə yazıldığını bilmədiyi istəklər yolunda fədakarlıq etsin? Səfəvilik bizi öyləsinə farsın məzhəbi tuzağına soxmuş ki, fars öz yerində rahatca oturmuş, ağlı devşirilmiş səfəvizədə türk isə, onun böyük bir dövlətə sahib olması yolunda hər növ fədakarlıq etmişdir. Etnik mənsubiyət duyqusu səfəvilərdən başlayaraq sönməyə doğru getmişdir. “Etnik təşxisin təməlində insanın duyqusu yer alar. İnsan daha çocuqluq yaşda kəndi etnosuna aid olduğunu anlar.”[17] Səfəviyət bu doğal duyqunu türk ulusunda

---

[16] Əhməd Kəsrəvi “Məşrutə tarixi”, s. 14.

[17] L. N. Gumilev “Kavimlerin türeyişi ve yer yüzündeki yaşam bölgeleri” çeviren Nuri Eyüpoğlu Ötüken-2001, s. 57.

söndürmüşdür. Közərən qismini də bu duyqusu sönmüş və söndürülmüş olan ağlı devşirilən oxumuş türklər özləri söndürməyə çalışmışlar. Tarixsəl sosial psikoloji inanc dəyişimi sırasında kökündən dəyişmiş ola bilir. Çünkü məzhəb dəyişimi ilə milli bilincaltı təxrib edilə bilir. “Hindistanın yerlisi müsəlmanlığı qəbul etdikdən sonra hindli olmaqdan çıxmışdır, çünkü vətəndaşları arasından qopmuş və zümrələr dışında qalmışdır.”[18] Milli bilincaltının dəyişməsi ilə etnik ölümə doğru sürüklənmə olayı baş qaldırmış olur. “Etnik ölümlər biolojik olmaqdan daha çox sosial bir olaydır.”[19] Son 500 illik zaman sürəci içində bütün toplumsal hərəkətliliklərin təməlində səfəviyətin devşirdiyi toplum və ağıl gerçəyi durduğundan sürəkli fars kimliyi yolunda çabalara tanıq olmuşuq. Sosial hərəkətliliklər etnik intihar əməliyatı olmuşdur. Sanki Səfəvilərdən öncə nə bayındırlı Dədə-Qorqud mədəniyəti olmuşdur, nə Səlcuqlu. Hər şey silinib süpürülmüşdür. Oyanış demək sözün gerçək anlamında türklüyün Səfəvilər öncəsi bilincaltını aydınlığa qovuşdurmaq deməkdir. Dədə Qorqudu var edən tarixi bilinci kəşf edib onarmaq deməkdir. Toplumdan topluma aydınlanmanın fərqi vardır. Bu açıdan aydınlanma Səfəvi devşirməçiliyindən öncəki dönəmi diriltmək anlamında olsa gərək. Toplumların həyatındakı bütün dəyişimlər onun dilinə yansıyar. Səfəvi sonrası tariximizdə Dədə Qorqudun sayqınlığa və dostluğa çağrış öyüdlərinin yerini nifrət, kin, yalan və böhtan

[18] Eyni qaynaq s. 69.
[19] Eyni qaynaq.

kimi sözlər almışdır. Dilimizdə nifrət, kin və lənət dalğalanmağa başlamışdır. “Dilin tarixi, minlərcə ilin axışı içində, bölüm-bölüm izlənər”[20] Səfəvi dönəmi dilimiz incələndiyində nifrətdən, lənətdən, kindən başqa heç bir şeyə rast gəlmirik. “Əbubəkirə lənət”, “Ömərə lənət”, “Osmana lənət”, “Ayişəyə lənət”, “Yəzidə lənət” kimi nifrət çağrışdıran ifadələr dildə dalğalandı. İnsanı ikiüzlü və riyakar olmağa zorlayan “təbbərra” və “təvəlla” qavramları irqçiliyi və içə qapanmışlığı çağrışdırdı. Bu qədər nifrət içində əlbəttə ki, fərdin və toplumun psikolojisi pozular. Bu nifrət ortamında doğruluğun nə olduğu bəlli olmaz. Çünkü doğruluq, çeşidli yollarla (bir tək yolla deyil) sürəkli hərəkətlilik ortamında gerçəkləşən eyləmdir, dialoqdur. Səfəvi nifrəti gözləri kor, qulaqları kar etdi. 500 il bu ifadələr camilərdə xalqın şüuruna yerləşdirilərək onun davranışlarına yansıtıldı və alışqanlıq halına gəldi. Çocuq bu nifrət kültürü ortamında dünyaya göz açır. Bu açıdan baxıldığında milli oyanış həm də bu tarixi xəstəliyə çarə bulmaq anlamında olsa gərək.

Səfəvilər üzərinə araşdırmam və bu kitabı hazırlamam bununla da sınırlı deyildir. İran-İraq savaşında əsgər idim. Əsgərlikdə İranda yaşayan bütün qövmlərin gəncləri ilə istər-istəməz rastlanırdım. Burada rastlandığım türkmən gəncləri ağlımda bir çox sorular oluşdurdular. İranda 1-2 milyon arasında türkmən olduğunu söylədim. Onlar da fars dilində oxumuşlar. Ancaq mənim türkmən əsgər

[20] Karl Jaspers “Felsefə nədir?”, çeviren Zeki Eyüboğlu, SAY yayınevi, İstanbul-2007, s. 390.

arxadaşlarım ailələrinə türkməncə məktub yazır və onlara ailələrindən gələn məktub türkməncə olurdu. Bir tək səfəvizədə türk ailəsinə türkcə məktub yazmaz, ailələrindən gələn məktub da türkçə olmazdı. İranda şiələşən türk, yalnızca tarixi hafizəsini itirərək Fars tarixi hafizəsinə sahiblənməmişdir. Öz dilində yazma imkanları Səfəvilərdən bəri tamamən yox edilmişdir. Dil düzyazıya (nəsrə) keçmədikcə öz imkanları haqda bilgi birikdirə bilməz. Şeirdəki cümlə quruluşu ilə düzyazıdakı cümlə quruluşu başqadır. Bizim dilimizdə, özəlliklə əruz vəznində yazılan şeirlər Fars dilinin cümlə quruluşuna və tarixi təcrübəsinə təslim edilmişdir. Bunun özü də dili daha da axsaq duruma soxmaq üçün bir basqı aracıdır. “Bir ölkədə nə qədər şair çoxsa, o ölkə düşüncə baxımından bir o qədər geridədir. İnsanlar və millətlər yaşlandıqca şeirin yerinə nəsr keçər.”[21]

Bu kitab dolayısıyla, böyük bir iddiada bulunmuşluğum söz qonusu deyil. Yalnızca Səfəvi tarixinə başqa bir açıdan baxmağı denəməyə çalışmışam. Bu yöndən də baxaraq bilgilənmənin yararı olacağına inanıram. “Bilmə və təcrübə heç bir şəkildə doğrulama və kontrol altına alma demək deyildir.”[22] Tək amacım Səfəviyət zindanında həbs edilmiş türklərin ağlına azadlıq qazandırmaq olmuşdur.

Millətlərin tarixi, şəxsiyətlərin həyatına sığmasa da, istər-istəməz tarixi araşdırmalarda

[21] Cemil Meriç “Sosyoloji notlar” İletişim yayınları , 5-ci baskı, s. 26-27.

[22] Hans-Georg Gadamer “Hakikat və Yöntəm” 1-ci cild Paradigma yayınları- İstanbul, s. XXI.

ilk olaraq şəxsiyətlərin düşüncə, inanc və davranışları incələnir. Çünkü iqtidar bir şəxsiyətin çevrəsi ilə qurduğu ilişkilər yumağından ibarətdir. Hansı güc millətlərin hərəkət və əməllərinə hakimdir? Şəxsiyətin kütlə tərəfindən qəbul edilməsinin qoşulları nədir? Tarixi araşdırmalardan amac azadlıq düşüncəsinin tanımlanması olmalıdır. Çünkü "Tarixin məzmunu azadlıqdır."[23] Insanın bütün çabaları maddi və mənəvi olaraq azadlığını artırmaq üçündür. Tarixi veriləri ağlın imkanları ilə araşdırmaq zorundayıq. Ancaq onun günümüzdəki təsiri qonusunda vicdanın da verilərindən yararlanmaq məcburiyətində qalırıq. Çünkü indiki zamanda yaşayan insan öz azadlıq imkanlarını genişlətmək istər. "Tarix, azadlığı ağlın qanunları ilə tanımlayır. Bu üzdən də azadlığın bu qanunlarla tanımlandığı yerə qədər tarix elm sayıla bilər."[24] "Tarixi olayların səbəbini və hərəkətin qanunlarını anlamaq tarix elminin amacını təşkil etməkdədir."[25] "Tarix elmi öz dönüşüm (transformasion) sürəcində sürəkli kiçik birimləri incələməyə çalışaraq doğrulara yaxınlaşmağa çalışmaqdadır."[26]

Bu kitabın təpkilərlə qarşılanacağının bilincindəyəm. Mən bir türk olaraq sorularıma cavab bulmaq amacı bu kitabı yazmaq zərurəti hiss etdim. 15 ildən artıq oxumalarım və

---

[23] Lev Tolstoy "Savaş və barış" tarix fəlsəfəsi bölümü, farscaya çevirən Soruş Həbibi, "Nilufər" nəşriyatı, Tehran- 1377 (h.ş), s. 1453-1454.
[24] Eyni qaynaq, s. 1454.
[25] Eyni qaynaq, s. 1005.
[26] Eyni qaynaq, s. 1006.

ağlımda dolaşan sorular bir yandan, İran mühitində çoxluq oluşduran, ancaq heç bir tarixi düşünsəl qaynağı olmayan türklərin içlər acısı durumu digər yandan bu kitabı yazmama səbəb oldu. Səfəvilərdən sonra sanki yer dəlinmiş və Səfəvi nəfəsi toxunan yerlərdə türklərin dilini, tarixi xatirələrini udub yox etmiş. Nələr olmuşdur əcəba? Təbrizdə heç bir əqrəbası, tarixi xatirələri olmadığındanmı qızılbaşlar bu qədər insanı qətl edib, başda Təbriz olmaqla bütün Azərbaycan şəhərlərini türk kimliyindən bomboş buraxmışlar? Tarixdə hansı, hökmdar Şah İsmayıl kimi öz millətini bu qədər asanlıqla və “haq məzhəbi!” adına qətl etmişdir? Bayındırlı oğulları arasındakı iqtidar savaşı üzündən Təbriz və digər Azərbaycan şəhərləri güvənlik yarada biləcək dövlət arzulamaqdaydılar. Ticarət güvənlik icab edər. Ticarət mərkəzi olan Təbriz sırf bu üzdən ölkəyə güvənlik gətirər deyə Şah İsmayıla dirənmədən təslim oldu. Ancaq tarixdə heç bir fateh könüllü olaraq təslim olan əhaliyə toxunmamışdır. İsmayıl isə, Təbriz əhalisini sırf sünni olduqlarından dolayı qətl etdi. Yüzillər boyunca Təbrizdə və digər şəhərlərdə ortaya çıxmış memari abidələri kafirliyin görünütüləridir deyə tarixdən sildi. Venizli tacirlər Şah İsmayılın davranışını Neronla müqayisə etmişlər. Şah İsmayılı bu işə zorlayan pərdə arxasında əllərmi varmış? Bunlar kitabın axışı sırasında sorular və açıqlamalar şəklində bəyan edilmişdir.

Ədəbiyata çox həvəsli olduğumdan dolayı gəncliyimin ilk başlarından Şah İsmayılın şeirlərini oxudum, onlarcasını əzbər olaraq

anılarımda daşıdım. İran-İraq savaşında Şah İsmayıl xürafələrindən yararlanaraq minlərcə türk gəncini anlamsız savaşda İsmayılın 20-ci əsr modeli olan Xomeyni ölümə göndərdi. Şah İsmayılın uyduruq haq məzhəbinin qorunması adına gənclərimiz dəstə-dəstə öldü, öldürüldü. Bu savaşda mən də yaralandım. Savaş sürəsincə Səfəviyətin əsasını qoyduğu “haq məzhəbinin!” mollaları Səfəvəiyə ədəbiyatından əsgərlərə bol-bol danışar, Məclisidən, Kərəkidən anlatılar anladardılar. Yaşım və bilgilərim artdıqca Səfəviyə tərəfindən köləliyə məhkum edilmişliyimizi kəşf etdim. Bu kəşfdə bulunduqdan sonra vicdanımın çağrılarına qulaq asmalı idim. Bu üzdən də bu kitab Səfəviyətə qarşı bir etiraz manifestidir. Düşüncənin sorqulamasıdır. Düşüncəni bizlərə yasaq etmiş Səfəviyətə qarşı düşüncənin və soru sormanın ürünü olaraq anlaşılmalıdır bu kitab. Azərbaycan türklüyü yabancı Səfəviyət xürafələrini ağlından silmədikcə düşünmək yerinə, hər gün daha sürüləşəcək, aydınlanmaq yerinə daha da qaranlıqlara gömüləcəkdir. Kimlərinsə bu kitabı oxuduqdan sonra saxta tarix bilgiləri üzərinə qurmuş olduğu dünyası dağıla bilər və dağılacağına əminəm. Çünkü bu kitabdakı sorulara hər bir oxucu cavab verməlidir. Türklüyün və İslamiyətin düşüncələrdən və inanclardan silinməsini tasarlayan Səfəviyət ağlın məhkəməsinə sunulmuşdur. Türklüyün və İslamiyyətin bağrına vurulmuş olan səfəviyət adlı qarayaranı onarmanın zamanı gəlmişdir.

## Giriş

Türklərin İslamiyətlə tanışlığını tarixçilər 751-ci il Talas savaşı zamanına bağlamaqdadırlar. Türklərdə müsəlmanlaşma bir sürəç olaraq davam etmişdir. İslamın doğuşu zamanı türklərin İslamiyətlə tanışlıqları söz qonusu olmadığından Əməvilərin, daha sonra da Abbasilərin saldırıları sırasında İslamiyəti qəbul etmək heç də qolay olmamışdır. Ərəb orduları əllərində kitab deyil, qılıcla gəlmişdi. O zaman nə kitab var idi, nə də Ərəblərin yazıb oxuması. İslamiyətin doğuşu ilə Ərəblərdə tarix səhnəsinə bir millət olaraq girmə iradəsi meydana çıxmışdı. Daha öncələr dövlətsiz olan, qəbilələr şəklində sürəkli bir-birlərini parçalayan Ərəblər İslamiyətin tövhid çatısı altında tarixə yeni bir millət olaraq girdilər. İmperatorluğa yüksəldilər. Ərəb dili istila edilən torpaqlarda hakim dilə dönüşdü. İslamiyətin sonrakı illərində Ərəb milliyətçiliyinin də önə çıxması kəndiliyindən Ərəb müsəlmanlara qarşı dirəniş düşüncəsi oluşdurmaqda idi. Yalnız İslamiyətin ədalət çağrılarının duyulmasından da vaz keçilməməkdə idi. Ərəblərin Ərəb olmayan müsəlmanları məvali adlandırmalarına qarşın İslamiyətə qarşı içdən-içə bəyəni mövcud idi. Orta Doğuda İslamiyət bir devrim gerçəkləşdirmişdi. İslamiyətdən öncə böyləsinə bir möhtəşəm tarixə Orta Doğu tanıq olmamışdı. İslamiyət dönəmin modernitəsi şəklində meydana çıxmışdı. Türk tarixinə baxıldığında İslamiyəti yayqın biçimdə qəbul etmək türklərin dövlətsiz və güçsüz dönəmlərinə dəng

gəlməməkdədir. Türklərin dövlətli və güclü çağlarında İslamiyət daha yayqın biçimdə qəbul ediləcəkdi. 932-ci ildə Qaraxanlı dövlətinin sultanı Satuq Buğra İslamiyətin ən özgürlükçü məzhəbi olan Hənəfiliyi qəbul etdi. Dövlətin qəbulu ilə İslami dəyərlər türk ulusunun dərin qatlarına qədər yol açmağa başlar. Öylə ki, yüzillər boyunca türklər İslamiyətin bayraqdarlığını yapacaqdılar. Qaraxanlıların arxasınca İslamiyətlə tanışmış və İslami yaşam biçimini kəndi kültür və gələnəkləri ilə özdəşləşdirən türk ulusu şəriət dövləti qurmasa da, İslami əxlaq anlayışından və dünyagörüşündən vaz keçməmişdir. Böyük Səlcuqlu İmperatorluğu Bağdad xilafətini dini işlərlə uğraşmaqla sınırladı. Xilafət siyasi qurumuna qarşı sultanlıq qurumunu gəlişdirdi. Bu, dönəmin qoşullarına görə dini siyasətdən ayırd etmək anlamında idi. Türklərin iqtidarları dönəmində dinin özgürcə təfsirinə olanaqlar sağlanmışdı. Səlcuq oğullarının yüksəlişi ilə Azərbaycanda, Anadoluda və Xorasanda yerləşən yeni türk axınları türkçənin bu geniş bölgədə ortaqilətişim dili oluşuna imkan sağlamışdı. Şübhəsiz ki, geniş Asiya torpaqlarında yaşanan türklərdə İslamiyəti qəbul tək yönlü olmamışdır. Türklük bütünüylə Hənəfi məzhəbi mərkəzli İslam alqılayışı içinə girməmişdi. Dəyişik yaşam qoşulları kəndiliyindən fərqli alqılamalar da doğurmuşdu. Bu alqılamalar günümüzə qədər davam etmişdir. Səfəvi dövlətinin qurulduğu ana qədər Mərkəzi Asiya, Xorasan, Azərbaycan və Anadolu arasında türklüyün ilətişim sorunu olmamışdır.

Səfəvi dövlətinin qurulması ilə ortaya məzhəbi bir sınır qoyulmuş və Anadolu-Mərkəzi Asiya arasındakı gəl-getlər durdurulmuşdur. Bu üzdən də Səvəfi dövlətinin quruluşuna gətirib çıxaran olayları incələmək önəmli qonudur. Səfəvi dövlətinin quruluşuna gətirib çıxaran gəlişmələr nələr olmuşdur?

Səfəvilərin ilk əlli ilində bir neçə kitab dönəmin tarixi üzərinə təlif edilmişdir. Bu kitablar tərəfsiz yazılmamış və sürəkli olaraq səfəviləri övdüyündən doğru qaynaqlar sayıla bilməzlər. Ancaq bu kitabların sətirlər arasılığından bəzi gerçəkləri kəşf etmək mümkündür. Bu kitabın hazırlanmasında o qaynaqlardan yararlanılmışdır. Bu qaynaqların ən önəmlilərindən biri olan İskəndər bəy Türkmənin “Tarixe-aləm arayi abbasi” əsəri Bakıda türk dilinə tərcümə edilmişdir. Bunlardan əlavə Səfəvilərin daha sonrakı dönəmlərində bu dövlətin necə qurulması və ortaya çıxması ilə bağlı bir neçə tarix kitabları yazılmışdır. Ayrıca, qızılbaşların yağmaladıqları qənimətləri almaq üçün o zaman Səfəvi dövləti ilə ticarət əlaqələri quran avropalı tacirlərin də xatirləri vardır. Bunlar “səfərnamələr” olaraq mövcuddur, bunların əldə olan böyük qismi Fars dilinə tərcümə edilmişdir. Səfəvilik ideologiyasının oluşumunda bəzi ədəbi qaynaqlardan da yararlanılmışdır.

Səfəvi dövlətinin quruluşuna səbəb olan “pirpərəstlik” təriqəti olmuşdur. Burada “pir” sözü anlamının Səfəvi öncəsi və Səfəvi sonrasında sonrası üzərində durmaq gərəkir. ”Pir” irfanda sözlük anlamının ötəsində bir

anlam ifadə etməkdədir. “Pir” sözlük anlamında, yaşlı, qoca, təcrübəli deməkdir. Ancaq irfanda “pir” ruhən gənc və zamanların keçişinə aldırış etməyən mənəviyatı dərin olan insandır. İrfandaki “pir” qavramını Mövlana Cəlaləddin Rumi “Məsnəvi”sində bu şəkildə açıqlar: “Bəxti gənc, adı pir olan bir tür kişilik. Onun pirliyi Tanrı tərəfindəndir, zamanların keçməsi və yaşlanması ilə deyildir.”[27] Anlaşıldığı kimi “pirlik” Tanrı vergisi kimi bir qonumdur. Çox gənckən də kişi əxlaqi özəlliklərinə, karakterindəki cazibəsinə görə pir ola bilər. İrfanda pirliyin kiminə görə üç, kiminə görə dörd və kiminə görə isə beş özəlliyi var. Az danışmaq, az yemək, az yatmaq, toplumla çox qaynayıb qarışaraq şöhrət peşində qoşmamaq və sürəkli olaraq Tanrını zikr eyləmək. Bu beş ünsürün kimisi ilk üçünü, kimisi dördünü və kimisi də beşini qəbul edər.[28] “Pir” olmaq üçün illa da imamlar soyundan olmaq gərəkməz. Pirliyi imamlar soyuna bağlamaq səfəvilərdən sonra başladı və ölkəmiz saxta və saxtakar imamzadalarla dolduruldu. Pirlik kişinin öz nəfsi üzərinə hakimliyi nəticəsində Tanrının ona bağışladığı əxlaqi və ruhi üstünlüklə sağlanır. Örnəyin Mövlananın “mənim pirim” adlandırdığı Şəmsi-Təbriz imam soyundan deyil, Mövləvilərin pirinə dönüşən Mövlana özü də imam soyundan deyildi. Səfəvilərdən sonra bütün irfan qavramlarının içi boşaldılıb yeri

---

[27] Mövlana, Məsnəvi,
Kərdeəm bəxte cəvan ra nâm pîr
Kəz xoda pîr əst nə əz əyyam pîr.

[28] Semt o cu´ o səhər o ozlət o zekri be dəvam
Natəmamane cəhan ra konəd in pənc təmam.

yalan və iftira ilə doldurulduğundan por sözü də təhrif edilmişdir.
Mövlanaya görə seçkinlər (pirlər) üçün hidayət edici və doğru yönləndirici olan eşqdir. Onları sürəkli canlı, həyəcanlı tutan və sanki yel kimi sürəkli səfərdə olmalarını sağlayan, yalnız və yalnız eşqdir. Mövlana "Məsnəvi"sində düşüncəsini bu biçim açıqlar: "Eşq seçkinlər üçün fırtınalı dənizdə qurtarıcı kəmi kimidir. Eşqin bəlası az, yararı çoxdur."[29]

Əski türk gələnəyində mövcud olan pirpərəstlik 13-cü əsr Səlcuqlar zamanından etibarən yayqınlaşmağa başlamışdı. İslamda pirpərəstlik şirk sayılsa da, bu gələnək bəzi İslami özəllikləri və qavramları da öz varlığına yükləyərək yeni şəkli ilə davam etmişdi. 13-cü əsrdə, özəlliklə moğolların yüksəlişi ilə Mərkəzi Asiyadan Azərbaycana və Anadoluya təriqət axınları başlamışdı. Xorasan ərənləri olaraq nitələnən anlayış da ümumən bu dönəmə rastlanır. Əski çağlarda Xorasan, Mərkəzi Asiyanı təmsil edən coğrafi məkan idi. İndiki Xorasan qismən İranda, qismən Əfqanistanda və qismən də Türkmənistanda yerləşməkdədir. Məzarların üzərini qaldırıb onu ziyarətgah durumuna gətirmək də Xorasanda gerçəkləşmiş olan bir olaydır. İslamiyətdə belə bir istək müsəlmanlardan istənilmədiyi halda məzarların ziyarətgaha dönüşməsi Qəznəvi və Səlcuqlar dönəminə rast gəlməkdədir. Böyük olasılıqla bu, ölülərə olan sayqının göstərgəsi kimi İslam

[29] Mövlana, Məsnəvi,
Eşq çon keşti bovəd bəhre xəvas
Kəm bovəd afət, bovəd əğləb xelas

sonrası dönəmə daşınmışdır. Məzar ziyarətinin kültür halına gəlməsi də Xorasanda gerçəkləşmişdir. Əbulfəzl Beyhəqi bu olaylarla ilgili bilgi verməkdədir. Xorasanda şiələrin 8-ci imamı sayılan Rzanın məzarının üstünə Məsud Qəznəvinin elbayı (valisi) olan Əbulfəzl Suri günbəd yapdırar. Əbulfəzl Suri əhalidən aldığı vergilərdən şiələrin 8-ci imamı Rzanın məzarının üstünə günbəd yapdırmışdı.[30] Pirpərəstlik və məzarların üstündə günbəd düzəldərək onu ziyarətgah durumuna gətirmək İslam ölçülərinə görə şirk sayılsa da, bu şəkildə bir kültür oluşub günümüzə qədər davam etmişdir. Gələnəklərdə yayqın olan bu növ pirpərəstliyi bəzi başarılı insanlar dəyişik dönəmlərdə öz siyasi amacları yolunda qullanmışlar. Onlar özlərini qeyb işlərindən xəbər verənlər kimi tanıdaraq pirpərəst kütlənin yanında böyük sayqınlıq qazana bilmişlər. Sağalmaz xəstəlikləri sağaldacaq iddialarda bulunub toplumun diqqətini özlərinə çəkə bilmiş, daha sonra bu pirlərdən bəziləri arxalarına aldıqları kütlənin hesabına siyasi macəralar xəyalına qapılmışlar. Onların duaları ilə bütün istəklər Tanrı qatından cavablanacaqmış kimi bir inanc şəkillənməyə başlamış. Bu pirlərin çoxu avam xalqın yanında peyqəmbər qədər sayqı qazanmışlar. Bunlar İslamda şirk sayılsa da, coğrafi sərtliklər, quraqlıqlar üzündən avam xalq kütləsi pirlərdən yardım diləməkdən başqa çarə düşünə bilməmiş. Böyləsinə iqtisadi və sosial ortamda zaman keçdikcə pirlər özəl sosial statusa sahib

[30] Əbulfəzl Beyhəqi, “Beyhəqi tarixi”, (Zəryab yayın evi, Tehran) S. 638-648.

olmuşlar. Hətta istədiklərində ailə işlərinə bilə, müdaxilə etmişlər. Moğolların yüksəlişi ilə ortaya çıxan savaşlar, qıtlıq və iqtisadi böhranlar pirpərəstlik inancını daha da bərkişdirər. 13-cü əsrdən başlayaraq xanigahlar artmağa başlar. Xanigah Farsca söz birləşməsidir. "Xan", yəni süfrə, "gah" da zaman deməkdir.

Xanigahların sosial həyatda, özəlliklə 13-cü əsrdə çox böyük etkisi olmuşdur. Azərbaycanda və Anadoluda iqtisadi və sosial həyatda etkili olan əxilik də bu zaviyələrin ürünü olmuşdur. Bu zaviyələrdə din, əxlaq, dilçilik, fən bilimləri, musiqi, gözəl yazı yazma, ədəbiyat, teoloji dərsləri verilirdi.[31] Xanigahlarda aclara süfrə açıldığından bu ad ortaya çıxmış ola bilər. Bu aclar istənildiyində xanigahın amacları yolunda qullanılırdılar. Acların olması xanigah sahiblərinə yaramaqda idi. Bu xanigahların şeyxləri zamanla "vəliullah" ləqəbi alırdılar, yəni Allahın tam ixtiyarlı vəkili. Pirpərəst kütlə bu şeyxlərin ölməzliyini qəbul edir və Allahla bir şəkildə sirli ilişkidə olduqlarına inanırdı. Bu səbəbdən də verilən nəzirlər və "dini" vergilər hesabına xanigahlar böyük zənginliyə sahib olurdu. Zamanla bu xanigahlarla dövlət qurumları da hesablaşır və dövlətə əsgərvermə qarşılığında onlara geniş tarlalar bağışlanırdı. Xanigah şeyxləri bir tür quldarlıq düzəni yaradır və xanigah qurallarına görə yaşayanlar onların əmrlərinə mütləq anlamda tabe olan kölələr idilər. Böyləcə xanigah şeyxləri feodal bir yapı

[31] Ayşe İrmiş "Bir örgüt kültürü örnəyi olaraq Türk milli kültüründə ahilik" Türk Yurdu dergisi, Şubat 1998 sayı 126.

içində böyük iqtidara sahib olurdular. Kütlənin maddi və mənəvi iqtidarı onların əlində bulunurdu.

## İslamda məzhəblərin doğuşu

Hz. Məhəmməd dönəmində hər kəs peyqəmbərin buyuruqlarına qarşı çıxmadan dini fərizələri yaşamaqda idi. İslamşünaslığın mərkəzində ilk öncə Hz. Məhəmmədin kişiliyi durmuşdur. Çünkü Quran bir gündə oluşmamışdır. Ayrıca, insanların yazıb-oxumaları da yox idi. Bu üzdən də soruları olduğunda Qurana müraciət etmək yerinə Hz. Məhəmmədə müraciət edirdilər. Çünkü Quran bugünkü şəkli ilə mövcud olmamış və özəlliklə Hz. Məhəmməd kimi cazib şəxsiyəti olan bir insanla dialoqun zövqü də olmuşdur. Bu nədənlə də İslamın mərkəzində 23 il Hz. Məhəmmədin kişiliyi durmuşdur. Hz. Məhəmmədin vəfatından sonra Quran İslamın mərkəzində yer almışdır. Peyqəmbərin vəfatının həmən ardından xilafət siyasi bir teori olaraq ortaya çıxdı.

Quranda Allaha təslim olmaq vurqulanmış, müsəlmanlara tapşırılmış ki, peyqəmbərə və onu təqib edən xəlifələrə itaət etsinlər. Onların digər insanlar üzərində vilayətləri vardır. Bunun adı vilayəti-ammədir. Yəni seçilmiş olanın xalq üzərinə hakimiyəti. Vilayəti-ammə haqqın iradəsi ilə xalqın iradəsinin birləşməsidir. Onun üçün də xalq tərəfindən seçilməlidir. Bütün millət kəndiliyindən vilayəti-amməni ifadə edər. Burdan da xilafət müqaviləsi fikri doğmuşdur.[32] Ömərin önərisi və öncəliyi ilə Əbubəkir ilk xəlifə olaraq seçildi. Hz. Məhəmməd xəstə halında ikən Əbubəkiri pişnamaz kimi müsəlmanların önündə namaz qılmaq üçün camiyə

[32] Hilmi Ziya Ülken "İslam Düşüncesi" Ülken Yayınları İstanbul- 1995, s. 77.

göndərmişdi. İlk dəfə idi peyqəmbər həyatda ikən Əbubəkir Onun namazdakı imamlıq görəvini gerçəkləşdirirdi. Peyqəmbər həyatda olduğu zaman Əbubəkirə bu qədər dəyər verməsi o dönəm müsəlmanları tərəfindən görülmüşdü. Bu nədənlə Əbubəkirin xəlifəliyinə etiraz olmamışdı. Daha sonra Ömər xəlifə oldu. Ömərin xəlifə olmasında Əbubəkirin böyük rolu olmuşdu. Ömərin xilafəti zamanı İslam geniş coğrafiyaya yayıldı. Ömərin orduları Sasaniləri devirib və Misiri fəth etdi. Ömər ölmədən öncə altı kişilik bir şura təyin edər və bu altı kişinin içindən birinin xəlifə seçilməsini istər. Ömərin vəfatından sonra Osman xəlifə seçilər. Osmanın zamanından başlayaraq xilafətin qutsallıq rəngi dəyişməyə başlar. İlk dəfə olaraq Osman zamanında xəlifəyə qarşı açıqca etiraz etməyə başlarlar. Bəzi müsəlmanlar artıq hökumətin rəisi olan xəlifəni peyqəmbərin mənəvi varisi kimi görməzlər. Bu etirazlar şiddətlənər və Osmanın öldürülməsinə gətirib çıxarar. Osmandan sonra Əlinin xilafəti başlar. Daha sonrakı yüzillərdə Əbutaliboğlu Əlini imam olaraq nitələsələr də, ancaq Əli özünü bu adla tanımlamamışdı. Əlinin savaşı da imamət üçün deyil, xilafət üçün olmuşdu. Əlinin zamanında da etirazlar bitmək bilməz və qanlı savaşlarla nəticələnər. Özəlliklə Müaviyə və Hz. Ayişə ilə olan savaşlar çox qanlı olmuşdu. Hz. Ayişə peyqəmbərin eşi idi. Bəzi savaşlarda peyqəmbərin yanında bulunmuşdu. İlk dəfə olaraq İslam tarixində siyasətə qatılaraq böyük ordu düzənləyən çox istedadlı xanım olmuşdur. Daha sonrakı yüzillərdə şiə əhli Hz. Ayişəni

siyasətə qatıldığından dolayı sevməz olacaqdı. Ancaq VII əsrdə bir qadının siyasətə qatılma bilgisi, cəsarəti və intelekti üzərinə düşünülməyəcəkdi. İslam tarixində Hz. Ayişənin çox böyük rolu olmuşdur. Özəlliklə Quranın tərtibində etkili olduğu söylənməkdədir. Quranı başdan sona qədər əzbər bilirmiş. Kurt Frişler ”Peyqəmbərdən sonra Ayişə” adlı əsərində Hz. Ayişənin həyatı haqda ayrıntılı bilgi verməkdədir.

Dinin kainat görüşü , insanı mütləq qarşısında tam bir itaət və təslimiyətə çağırmaqdadır. Münaqişəsiz və qəti itaət, yəni səfərbər haldakı bir dövlətin bəklədiyi ordu itaəti idi. Orduda fikir azadlığından bəhs etməyə imkan yoxdur.[33] Bu tutumla birləşən Əməvilərin və daha sonrakıların cəbriyə (determinist) görüşləri hər türlü düşüncə hərəkətini boğacaqdı. Əməvi dövləti (661-751) qurulduqdan sonra İslam toplumunda hökumətin şəkli peyqəmbər dönəminkindən çox fərqli duruma gələr. Hökumət Hz. Məhəmməd və xəlifələr dönəmindəki məşruluq və məqbulluqdan bərxurdar olmaz. Əməviləri qəsbkar sayan şiənin dışında sünnət əhli də artıq hökumətin məşruluğunu sorqulamağa başlar. İslami hökumət siyasi və iqtisadi iqtidarı əlində bulundursa da, dini və şəri´ rəhbərlik baxımından ilham qaynağı olma durumunu itərər. Müaviyənin iş başına gəldiyi gündən etibarən İslam toplumunda din və hökümət arasında bəlli bir sınır oluşmağa başlar. Ancaq

[33] Hilmi Ziya Ülken “Uyanış devirlerinde tercümenin rolü” Ülken yayınlar 1997-İstanbul, s. 89.

hökümətin dini rənginin azalması ilə dini işlərdən hansı qurum sorumlu olmalı idi? Bu soruya böylə bir cavab ortaya çıxdı: Din işlərdən üləma (din alimləri) və fəqihlər sorumlu olmalıdır. Yəni İslam toplumunda yeni sosial bir zümrəyə ehtiyac hiss olunmaqda idi. Bunlar üləma və fəqihlər olaraq İslam tarixində ortaya çıxacaqdılar.

Başqa bir sorun da bu idi ki, bu zümrə hansı qaynaqlara dayanaraq sorumluluq üstlənib toplumu hidayət edəcəklər? Ən önəmli və ilk qaynağın Quran olacağı bəlli idi. Ancaq Quranda nasix (batil edən) və mənsux (batil edilən) ayətlər var. Möhkəm və mütəşabihat (bənzər) ayətlər var. Bir ayətdən dəyişik alqılamalar ola bilərdi. Ayrıca, Quranın bir çox ayətlərinin əxlaqi və irşadi yönləri olduğundan gerçək və güncəl sorunların çözümü doğrultusunda bu ayətlərdə açıq bilgi söz qonusu deyildi. Bunlar, yalnız açıqlama və təfsirlə anlaşıla bilər. Bu da din üzərinə araşdırmacı və alim gərəkdirirdi. İkinci bir qaynaq kimi Hz. Məhəmmədin yöntəmini içərən ”sünnət” idi. Sünnət üç hissədən ibarət olmuşdur: 1- Qəvl sünnəti, yəni peyqəmbərdən eşidilən rəvayətlər. 2- Fel sünnəti, yəni peyqəmbərin davranışları. 3- İqrar sünnəti. İqrar müsəlmanların davranışları olaraq bilinər. Müsəlmanların bu davranışını peyqəmbər rədd etməmiş, qəbul etmişdir.[34]

[34] Həna Əlfaxuri- Xəlil Əlcər, “İslam dünyasında fəlsəfə tarixi”, ərəbcədən farscaya çevirən Abdulhəmid Ayəti 3-cü yayım “İslami inqilab yayınları” 1367 (hicri-şəmsi), s. 106.

Bu üzdən də xəlifələr dönəmindən uzaqlaşdıqca hədislərin etibarı artmağa başlamışdır. Bu da doğaldır. Çünkü xüləfayi raşidin iqtidarlarının dini məşruiyəti var idi. Onlar həm siyasi, həm də əxlaqi liderlər idilər. Əməvilərin tətbiqatı hədisə ehtiyac doğurmuşdu. O zaman hədisləri necə toplamaq mümkün idi? Hədislərə yalan qarışmasın deyə, şübhəsiz ki, ən mötəbər qaynaqlar səhabilər (peyqəmbərlə həmsöhbət olanlar) idi. Yəni bisətdən (peyqəmbərliyə yüksəlişdən) rehlətə (vəfata) qədər Hz. Məhəmmədlə bərabər olan kişilər. Peyqəmbərin söylədikləri öz zamanında toplanmadığı üçün tək qaynaq səhabilərin hafizəsi idi. Bu üzdən də ”hədisşünaslıq” elmi doğdu. Hədislər sözəl (şifahi) olaraq söylənildiyindən hər hədis üçün söyləyicilər silsiləsi gərəkirdi. Örnəyin A deyirdi ki, eşitmişəm B-dən, B deyirdi ki, eşitmişəm C-dən və C deyirdi ki, eşitmişəm peyqəmbərdən. Hədis iki bölümdən ibarət idi. Mətn və bəlgə. Mətn hədisin özü idi. Bəlgə isə, hədisin necə əldə edildiyini bəlgələyirdi. Hədisin eşidilmə silsiləsini bəlli edirdi.[35] Ancaq bunların şəxsiyətinə və hafizələrinə necə güvənmək olardı? İlk sorun bu söyləyicilərin şəxsiyətlərini bəlli etmək idi. Bunlar kim olmuşlar? Bunlara həyat tərzlərinə görə nə qədər güvənmək olar? Bu düzənək (mekanizma) ”rical elmi”nin, yəni şəxsiyətşünaslıq elminin doğuşuna səbəb oldu.

[35] Həna Əlfaxuri- Xəlil Əlcər, “İslam dünyasında fəlsəfə tarixi”, ərəbcədən farscaya çevirən Abdulhəmid Ayəti 3-cü yayım “İslami inqilab yayınları” 1367 (hicri-şəmsi), 106.

Hədisləri düzənləmək istəyən ilk önəmli şəxsiyət 9-cu əsrdə Buxari olmuşdur. O, öncə 600,000 hədist topladı. Sonra söyləyicilərin şəxsiyətini göz önündə bulunduraraq hər bir hədisi incələməyə başladı. Bu incələmə ”Tarixi-kəbir” (Böyük tarix) adında bir kitabda bəlgələndi. Bu qədər hədisin içindən təkrar hədislərin dışında 3.000-dən az olan hədisləri mötəbər olaraq qəbul etdi. Hədisi qaynaq olaraq göstərmənin sorunu, yalnızca hədislərin saxta olub olmaması, ya da hədis söyləyicilərinin etibarlı olub olmamaları deyildi. Ortaya çıxan yeni gerçəklərin doğası peyqəmbər dönəmindəki gerçəklərlə uyqun gəlməməkdə idi. Bu uyqunsuzluq ortada isə, o zaman doğası gərəyi fərqli olan başqa sosial gerçəklərə bir hədisi necə tətbiq etmək ola bilərdi?

İslam toplumu hızla gəlişməkdə və genişləməkdə idi. Bu genişləmə sürəcində ərəb yarımadası ilə tamamən fərqli sosial toxuya sahib olan gerçəklər ortaya çıxırdı. Ərəb olmayanların da İslamı qəbul etməsi üzündən mövcud bilgilər və yasalar yetərli olmurdu.[36] Bu üzdən də müsələmanlar hədis və sünnətin dışında yeni gerçəklərlə rastlandıqlarında bir də öz fikir və istidlal (mühakimə) güclərindən yararlanmaq zorunda qaldılar. Bu da **qiyas** metodunu doğurdu. Yəni yeni gerçəklərlə qarşılaşan müsəlmanlar durumu peyqəmbərin dönəmindəki gerçəklərlə qiyaslamaq zorunda

[36] Həna Əlfaxuri- Xəlil Əlcər, “İslam dünyasında fəlsəfə tarixi”, ərəbcədən farscaya çevirən Abdulhəmid Ayəti 3-cü yayım “İslami inqilab yayınları” 1367 (hicri-şəmsi), s. 107.

qalırdılar. Bu qiyas sonucunda aradakı fərqi və bənzərliyi kəşf etməyə çalışırdılar. Bənzər bölümünə peyqəmbərin sünnətini tətbiq edirdilər. Bənzər olmayan bölümündə öz ağıllarından yardım alırdılar. Başqa bir metod da **istihsan** idi. İstihsan, yəni ən yaxşı. Bu, o demək idi ki, ortada olan bir neçə seçənək qarşısında İslam toplumuna və İslam qurallarına ən yararlı olanı seçilməli idi. Bu araşdırmalar sonunda "fiqh elmi"ni doğurdu. Quranda fiqh sözü keçər. Fiqh, bir şeyi açıqca anlamaq, alqılamaq və aydınlığa qovuşdurmaq anlamındadır.[37] Fiqh kəlməsinin əsl mənası bilgi və elm deməkdir.[38] Dini qavram olaraq dəlillərlə gizlin anlamları açıqlığa qovuşdurmaq deməkdir. Bu üzdən Tanrı fəqih deyildir, çünkü hər şey Tanrı üçün bilinəndir. Fəqih insana xas bir durumdur.[39] Əsil fiqh, mütləq fəlsəfəsinə və metafiziyə dayanır. Müqavilə nəzəriyəsini də doğrudan doğruya metafizikdən çıxarar. Çünkü əsil fiqhdə insanın Allahın qarşısındakı vəziyəti bizzât külli ağıl olan Allahın onun bir parçası, yəni cüzi ağılla münasibətə girişməsiylə mümkündür. Bu münasibət, cüz´ün küllə vəzifə ilə diqqət etməsini və küllün cüzə haqlar bağışlamasını icab etdirər. Fiqh sistemi Roma hüququ və Kantdan eyni dərəcədə ayrılar. Roma

---

[37] Dehxuda sözlüyü.

[38] Hilmi Ziya Ülkən, "İslam Düşüncəsi" Ülken yayınları 1995-İstanbul, s. 62.

[39] Həna Əlfaxuri- Xəlil Əlcər, "İslam dünyasında fəlsəfə tarixi", ərəbcədən farscaya çevirən Abdulhəmid Ayəti 3-cü yayım "İslami inqilab yayınları" 1367 (hicri-şəmsi), s. 107.

hüquq sistemi nəsnəl (obyektiv) xarici haqlar qəbul edər və hərəkət nöqtəsi haq məfhumudur. Kant isə, yalnız qaynağı mütləq olan bir vəzifə prinsipini qəbul edər. Kantın hüquq nəzəriyəsi onun əxlaq anlayışının bir fəslidir. Fiqh sistemi qarşılıqlı vəzifələr və haqlar sistemidir. Hər haq bir vəzifəni hər vəzifə bir haqqı icab etdirər. Bugünkü dilə çevirəcək olsaq, fərdlə cəmiyət arasındakı bir qarşılıqlığı qəbul etmək deməkdir.[40]

İlk vaxtlarda fiqhin əsas qullanımı hüquq sahəsində idi. Bu üzdən də fəqihlər genəldə yarqıçlar olurdu. Bu qaynaqlara dayanaraq və qiyasla istihsan yöntəmindən yararlanaraq daha əskidən bənzəri olmayan bir olay üzərinə mühakimələr edib nəticələr çıxara bilirdilər. Bu nəticə **rəy** adlanırdı. Qaynaq və metod arasında ilişki qurub və rəy çıxaran **ağıl** etkəni idi. Ağıl ortaya girdiyindən istər-istəməz bir fəqihin çıxardığı rəy başqa fəqihin rəyi ilə fərqli ola bilərdi. Bu üzdən başqa bir ünsür də fiqh elminə girdi. O da “**icma´**” idi. İcma´nın ən sadə tanımı budur: Ən az ixtilafla çoğunluğun ortaq görüşü. Böyləcə fiqhin əsası dörd ana ünsür üzərində quruldu: 1- Quran. 2- Sünnət və hədis. 3- Ağıl. 4- İcma´.

Ağıl ünsürü bir çox hallarda bir fəqihin rəyinin başqa fəqihin rəyi ilə fərqli olmasına səbəb olurdu. Əsas sorun da bu idi ki, görüş bildirmək və rəyin hüdudu haraya qədərdir? Bir çox fəqihlər hər qonuda görüş bildirib rəy çıxarmaqdan saqınırdılar. Çünkü bir fəqihin

[40] Hilmi Ziya Ülken “İslam Düşüncesi” Ülken Yayınları İstanbul- 1995, s. 72.

görüşləri şəri´ qaynaqlardan çıxarılsa da, ancaq yenə də onun şəxsi görüşü və rəyi idi. Bəzən bu rəyin bənzərinə nə Quranda, nə də sünnətdə raslanırdı. Bu üzdən fəqihlər öz rəylərini qullanmaqda çox ehtiyatlı davranırdılar. Günümüz anlayışı ilə söylərsək, çox mühafizəkar davranırdılar. Bu qrup İslam tarixində ”**əshabi-hədis**” olaraq tanındılar. Çünkü bu qrup öz rəylərindən daha çox peyqəmbərin hədislərinə dayanmaqdadılar. ”Əshabi-hədis”in qarşsında ”**əshabi-rəy**” durmaqda idi. Əshabi-rəy şəxsi görüşlərə önəm verir və yeni gerçəklərlə rastlanıldığında ağıl imkanlarından yararlanmağı məsləhət bilirdilər. **Əshabi-hədis** və **əshabi-rəy** qütbləri arasında dörd məzhəb məktəbi ortaya çıxdı. Hənəfi, Maliki, Şafei, Hənbəli məktəbləri arasındakı kiçik fərqləri göz önündə bulundurmazsaq, demək olar ki, aralarındakı fərq qiyas və istinbat (ağıl yürütmə) qullanımının miqdarında idi. Hənəfi məzhəbində qiyas, rəy və istinbat (ağıl yoluyla nəticə çıxarma) daha öndə idi. Ancaq Hənbəli məzhəbində əsas vurqu sünnət və hədislər üzərinə idi, qiyas və rəy çox da önəmsənmirdi. Hənəfi məzhəbindən Hənbəli məzhəbinə doğru getdikçə ağıl ünsürünün etkisi azalmaqdadır. Diqqətə alınması gərəkən qonu da budur. Elmin susduğu, susdurulduğu dönəmlərdə hənəfiçilikdən hənbəliçiliyə doğru əyilimlənmişlik (təmayül) ortaya çıxmışdır. Bu dörd məktəb 8-ci əsrin ilk yarısından ortaya çıxar və 9-cu əsrin ilk yarısına, yəni imam Hənbəlinin vəfatına (856) qədər davam edər. Bu yüz il içində İslamın dörd əsas məktəbi və

məzhəbi ortaya çıxar. Fiqhin doğuşuna iki etkən səbəb olmuşdur: 1- Hökümətin dini və əxlaqi yönünün azalması. 2- Sosial gerçəkləri Ərəbistanla qiyasda tamamən fərqli olan yeni toplumlarla müsəlmanların qarşılaşmaları. Siyasi açıdan bu dörd məzhəbi dəyərləndirəcək olursaq, Əbuhənifənin (ölüm-767) ortaya çıxışı Əməvilərə qarşı etirazların yüksək həddə çatdığı dönəmə rast gəlməkdədir. Bu siyasi narazılıq üzündən Əməvilərin məşruiyətinin ən düşük düzeydə olması doğaldır. Bu nədənlə müsəlmanlar öz şəri´ və əxlaqi sorunlarını çözmək üçün hökümətə bağlı olmayan mənbələr aramaqdaydılar. Bu üzdən də imperatorluğun mərkəzinə uzaq yerlərdə İraq məktəbi hənəfilik adı ilə ortaya çıxdı. Çünkü Əbuhənifənin doğum yeri və hənəfiliyin yayqınlaşdığı yer imperatorluğun doğusu və quzeyi olan İraq idi. İraq o zaman kültür və mədəniyət baxımından Ərəbistandan daha öndə idi. Mesopotamiya hər zaman mədəni baxımdan öndə olmuşdur. Bu bölgənin mədəni baxımdan öndə olması dolayısıyla ilk liberal məktəb və əshabi-rəy də burada doğdu. Hz. Məhəmmədin peyqəmbərliyi əsasən Məkkə və Mədinədə keçdiyindən Əbuhənifəyə də ilk etiraz əshabi-hədis tərəfindən bu bölgədən yüksəldi. Malik ibni Üns (ölüm-796) Mədinədə Əbuhənifəyə etiraz zəminində öz məktəbini oluşdurmağa başladı. Əbuhənifənin iraq məkətəbinin mənsubu olduğu kimi Malik ibni Üns də Mədinə məktəbi ilə ünləndi.

Əhli-sünnət fiqhində başlıca iki böyük məktəb var: 1- Əbuhənifənin cərəyanı olaraq

bilinən İraq məktəbi. 2- Malik və Hənbəlin cərəyanları olaraq bilinən Şam məktəbi. Şafei bunları təlif etmişdir. İki cərəyan arasındakı zidd görüşlər Malikidə ortaqlaşmış, barışıq duruma gətirilmişdir.[41] Bütün fərqliliklərinə rəğmən, hər dörd məktəb rəydən daha çox sünnət və hədisə önəm vermişlərdi. Bu nədənlə də dörd məktəb arasında icma´ ortaya çıxdı. Dörd məktəb arasındakı icma´ da böylə tanımlandı: imkan olduqca sünnət və hədisə güvənmək, rəy və ictihaddan az istifadə etmək gərəkir.

Bu anlaşma ilə sünnət əhlinin üləma və fəqihləri 9-cu əsrdə ictihad qapısının qapandığını duyurdular. İctihad qapısının qapanmasının səbəbi nə olursa olsun, bu durum uzun sürə durğunluğa səbəb oldu. Yeni araşdırmaların və açıqlamaların önü kəsilmiş oldu. Sünnətə təqlid, əskilərin təkrarı dini mərkəzlərin eyitim qonusu oldu. Mötəzilənin devrilişindən sonra ortaya çıxan durqunluq bu üzdən olsa gərək.

Bu oluşumlar sünni axış içində idi. Bir də Şiə olayı ortaya çıxmışdı. Şiə və şiənin içində xəvaric və mürciə kimi axımlar meydana çıxmışdı. Bütün bu məktəblər siyasi səbəb üzündən ortaya çıxmamışdı. Örnəyin Quranın "məxluq" və ya "qədim" olması kimi dartışmaların siyasi səbəbi yox idi. Ancaq iki müxalif qrup qarşı-qarşıya gəldiklərində istər-istəməz dartışmaları dinin təməli üzərinə də yönəlirdi. Örnəyin bir tərəf "cəbr"dən yana olur və "cəbriyə" (fatalist) adlanırdı və digər tərəf "ixtiyar"dan yana olub və "qədriyə" adlanırdı.

[41] Hilmi Ziya Ülken "İslam Düşüncesi" Ülken Yayınları İstanbul- 1995, s. 79.

Bir tərəf düşünürdü ki, böyük günah işləmiş olan müsəlman artıq dindən çıxmışdır və müsəlman sayılmaz. Digər tərəf düşünürdü ki, İslamın təməli şəhadət kəlməsini demək isə, günahkar müsəlman dindən çıxmış sayılmaz. O, hələ də müsəlmandır, ancaq günahkar müsəlmandır, yəni fasiqdir. Şiədən sonra hökümətin davranışına ilk dərin etiraz edən xəvaric idi.
Xəvaric öncə Əlinin ordusu içində idi. Ancaq Siffeyn savaşından sonra 659-cu ildə hekəmiyət olayı gerçəkləşmişdi. Bu olay üzündən xəvaric İslam tarixində ilk siyasi və dini firqə olaraq ortaya çıxdı.[42] Bu olayda Əmroas Əlinin vəkili olan Əbumusa Əşə´rini aldadıb Əlini xilafətdən və iqtidardan uzaqlaşdırmışdı. Hekəmiyət olayında Müaviyənin vəkili olan Əmroas Əlinin vəkili olan Əbumusa Əşə´riyə təklif edir ki, içsavaşı və İslam dünyasındakı parçalanmanı durdurmaq üçün həm Əlini, həm də Müaviyəni xilafətdən uzaqlaşdırıb və xəlifə seçimini müsəlmanların şurasına buraxalım. Əbumusa Əşə´ri bunu qəbul edər və minbərə çıxıb “ey əhali, mən Əli və Müaviyəni xilafətdən aldım, artıq onların heç biri xəlifə deyildir” söylər. Daha sonra Əmroas minbərə çıxar və “Ey əhali, mən də Əlinin xilafətdən düşürülməsindən yanayam, ancaq Müaviyəni xəlifə olaraq duyururam” deyər. Bunun üzərinə ilk böyük yarılma İslam dünyasında ortaya çıxar və Əməvilər fırıldaqla iş başında qaldıqlarından bir çox müsəlmanlar

[42] Həna Əlfaxuri- Xəlil Əlcər, “İslam dünyasında fəlsəfə tarixi”, ərəbcədən farscaya çevirən Abdulhəmid Ayəti 3-cü yayım “İslami inqilab yayınları” 1367 (hicri-şəmsi), s. 111.

tərəfindən məşruluqlarını və halallıqlarını itirmiş olurlar. Bu olaydan sonra Əlinin ordusunda parçalanmalar ortaya çıxar. Xəvaric ilk öncə sırf siyasi bir olay üzündən ortaya çıxsa da, daha sonra fikri bir axıma dönüşər. O zaman hökümətin Qureyş xanidanına məxsus olduğu düşüncəsi hakim idi. Xəvaric bu durumu qəbul etmirdi. Bu durum xəvaricə görə bir tür rasizm və irqçilik olaraq görünürdü. Xəvaricin tənqid etdiyi irqçilik Əməvi və Abbasi dönəmlərində sürüb gedəcək, hətta daha sonra bu irqçi tutum "məvali" adında bir qavram gəlişdirəcəkdi. Ərəb və Qureyş olmayana xitab edilən bu aşağılayıcı qavram ərəb olmayanı ikinci dərəcəli insan olaraq görəcəkdi. Anlaşılan budur ki, xəvaricin o zaman ortaya qoyduğu antiirqçilik görüşünə daha sonrakı çağlarda insanlıq ehtiyac duyacaqmış. Xəvaricə görə qaradərili bir həbəşinin də xəlifə olma haqqı olmalıdır. Bunu müəyyən edən də qəbilə kimliyi deyil, əxlaqi və dini özəllik olmalıdır. Xəvaricin bu görüşü ərəb olmayan müsəlmanlar arasında çoxlu yandaş bulmasına səbəb olmuşdu. Ayrıca, "xəlifələrdən, yalnız Əbubəkir və Öməri qəbul edirdilər."[43] Xəvaric digər İslam firqələrindən və məzhəblərindən fərqli olaraq qadınların siyasətə qatılmalarının tərəfdarı idi və əxlaqi, siyasi, dini özəlliklərə sahib olan bir qadının da xəlifə ola biləcəyini savunurdular. Bu etiqad doğrultusunda bəzi qadınlar da xəvaricin imamı (öndəri) olmuşdu.[44] Onlar Osman, Ayişə, Təlhə,

[43] Şəhristani, Əlmiləl vəl nəhl, 1-ci cild, s. 147.

[44] Əbdülqahir Bəğdadi, Əlfərq beyn-əl fərəq (firqələr arasında fərq), s. 41.

Zübeyr və Əlini kafir hesab edirdilər.[45] Qurandakı “Yusif” surəsini qəbul etməz və sonradan Qurana daxil edildiyini iddia edirdilər. Çünkü bu surədə aşiqanə və cinsəl səhnələr vardır.[46] Xəvaric çox ifrat bir cərəyan idi və gerçəkləri anlama kimi pozisionda deyildilər. Ayrıca, xəvaric açıqca “təqiyə”yə qarşıydı. Xəvaric düşünürdü ki, gerçək bir müsəlman hər durumda öz əxlaqını və inancını açıqca savunmalıdır. Aşırıcı Xəvaricin tam qarşısında başqa bir məktəb də ortaya çıxmışdı. O da **mürciə** idi. Xəvaric Əməvilərlə savaşmağı cihad sayırdı, ancaq mürciə böylə düşünmürdü. Mürciəyə görə müsəlmanların Əməvilərlə savaş adında bir yükümlülükləri söz qonusu deyildi. Əməvi-şiə- xəvaric savaşında mürciə tərəfsizlik sərgiləyirdi. Mürciə hesab edirdi ki, bu qarşıdurmalar İslamiyəti parçalayıb zəiflədir. Xəvaric və mürciəni iki zidd siyasi və etiqadi qütb olaraq düşünürsək, bunların ortasında ortaya çıxan məktəbin adını mötəzilə olaraq tanımlaya bilərik.

Mötəziləyə görə siyasi sorunu çözəcək olan, yalnız ağıldır. Əqli bir həyat qarşılıqlı zərərlərdən qorunmağı, müqavilələri düzənə qoyan və ixtilafları həll edən bir rəisə itaəti gərəkdirər. Əgər bir rəis olmasaydı heç bir risalə yapılmaz və insanlar hərc-ü mərc içində qalardı.[47] Mötəzilə fəlsəfi açıdan ussalcı (rasionalist), siyasi açıdan mərkəzci və ılımlı,

---

[45] Şəhristani, Əlmiləl vəl nəhl, 1-ci cild, s. 153.
[46] Eyni qaynaq, s. 164.
[47] Hilmi Ziya Ülken “İslam Düşüncesi” Ülken Yayınları İstanbul- 1995, s. 77.

sosial açıdan humanist idi. O zaman müsəlmanlar arasında yayqın olan “cəbr” və “ixtiyar” dartışmalarında mötəzilə məzhəbi insanın azadlığından yana tutum sərgiləməkdə idi. Mötəzilə hesab edirdi ki, insan yapdığı əməllərində azad və ixtiyar sahibi olmalıdır. İnsan suç işlərkən Tanrı onu sırf bu suçundan dolayı cəzalandırarsa, bu, Tanrının ədalət ilkəsi ilə bağlaşmaz. Çünkü Tanrı insanı yaratdığında ona suç işləmə olanağı da tanımışdır. Bu üzdən bəlli ölçüdə insana azadlıq və seçim haqqı tanınmalıdır. Yalnız bu durumda insanın yapdıqlarını onun özəl iradəsinin ürünü olaraq görə bilərik. İnsana azad iradə tanınmazsa, o zaman onun yapdıqlarından kəndisi sorumlu olamaz. Ancaq bu durumda insan “yaxşı” və “pisi” sezə bilər. İnsanın yaxşı və pisi sezə bilməsi üçün öz ağlını qullanması gərəkir. Bu üzdən də “ağıl” mötəzilə məzhəbində yüksək mərtəbədə idi.[48] Ancaq Əməvilər Siffeyn olayında gerçəkləşənləri Tanrı iradəsinin nəticəsi kimi göstərmək üçün “cəbriyə” görüşündən yanaydılar. İqtidarın Əlidən alınıb Müaviyəyə verilməsini bu şəkildə ilahi iradənin, ilahi təqdirin gerçəkləşməsi kimi dəyərləndirirdilər. Əməvilərin “cəbriyə” görüşünə görə iqtidarın Müaviyəyə keçişində bəşəri hiyləgərlik olmamış, sadəcə Tanrısal istənc (iradə) gerçəkləşmişdir. Buna qarşılıq mötəzilə nə Əlidən yanaydı, nə Müaviyədən.[49]

48 Mütəhhəri, İslami elmlərlə tanışlıq, s. 157-159.

49 Həna Əlfaxuri- Xəlil Əlcər, “İslam dünyasında fəlsəfə tarixi”, ərəbcədən farscaya çevirən Abdulhəmid Ayəti 3-cü yayım “İslami inqilab

Mötəzilə ağıla o qədər önəm verirdi ki, bir çox məzhəblərin və fəqihlərin tərsinə olaraq ağıl-hədis qarşıdurmasında onlar ağılı tərcih edirdilər.[50] Mötəziləyə görə insanlar kəndi fellərini kəndiləri yaradarlar. Yəni insanlar tam iradə azadlığına sahibdirlər. Əgər insanların fellərini Allah yaratsaydı, hərəkət hürriyəti olmayan insanların fellərindən dolayı cəzalandırılmaları ədalətə ayqırı (zid) olardı. Gerçəkdə isə, Allah adildir. Kötülük yapanın cəzasını və yaxşılıq yapanın da ödülünü verər. Mötəzilə əməli, imanın əsaslarından biri sayar. İman, ancaq iqrar, bilgi və əməllə tamamlanır. Bu o deməkdir ki, mötəzilə təqlidlə əldə edilən imanı qəbul etmir. İmanı tam olan əqli yolla İslama ərmiş olar. Hətta bəzi mötəzilə firqələr günah işləmənin axirətdə cəza görməyəcəyinin əqlən bilinməsi gərəkdiyi tezini savunmuşlar. Vasil ibni Əta Mötəzilə məzhəbini Bəsrədə qurmuşdu.[51] Kəlam elminin doğuşunda mötəzilənin böyük rolu olmuşdur. Mötəzilənin önəmli ilkələrindən biri “və´d və vəi´d”dir, yəni yaxşı işlərin savablanması və kötü işlərin cəzalanması. Bir başqa ilkəsi “əlmənzil beyn-əl mənaziləteyn”dir. Yəni iki mənzil arasında orta bir mənzil. Bu prinsip böylə izah edilmişdir: Böyük günah işləyən kimsə nə mömindir, nə kafir. Böylə bir kimsə fasiqdir. Mötəziləyə görə

---

yayınları” 1367 (hicri-şəmsi), s. 125.

[50] Eyni qaynaq, s. 163.

[51] Həna Əlfaxuri- Xəlil Əlcər, “İslam dünyasında fəlsəfə tarixi”, ərəbcədən farscaya çevirən Abdulhəmid Ayəti 3-cü yayım “İslami inqilab yayınları” 1367 (hicri-şəmsi), s. 115.

fasiq olan kimsə tövbə etmədən ölürsə, cəhənnəmə gedər. Ancaq fasiq kimsənin cəhənnəmdəki yeri kafərin yerindən daha az əzablı yerdir. Demək ki, böyük günah işləyən kimsə axirətdə möminlə kafir arasında bir məqama sahib olacaqdır.[52] Mötəzilə hilul nəzəriyəsəindən yana olan təsəvvüf cərəyanına da münasibət bildirir və deyirdi ki, Tanrı heç bir şeyə hilul etməz.[53]

Mötəzilə Allahın axirətdə də görünməyəcəyini savunar. Mötəziləyə görə məhdud bir şey gözlə görünə bilər. Ancaq Allah məhdud deyildir. Əhli-sünnət isə, axirətdə Allahın görülə biləcəyinə inanır. Hədisdə Allahın axirətdə görünəcəyi bildirilmişdir. Mötəzilə isə, bu dəlillərin hamısına təvil yolunu tutaraq etiraz edər. Xristianlar Hz. İsanı qədim sayarlar. Yəhudilər Tövratı məxluq (yaradılmış) sayarlar. Əşəri məzhəbi Quranı qədim və mötəzilə isə, məxluq sayar. Yəhudilərin Tövratı məxluq saymaları üzündən Quranı məxluq olaraq görməyi bir çox müsəlman alimlər yəhudi düşüncəsinin təsiri olaraq dəyərləndirərlər.[54] Cəfəri şiəsi "Quran məxluqdur" deməkdən çəkinər və "Quran hadisdir", yəni əzəli deyildir

---

[52] Həna Əlfaxuri- Xəlil Əlcər, "İslam dünyasında fəlsəfə tarixi", ərəbcədən farscaya çevirən Abdulhəmid Ayəti 3-cü yayım "İslami inqilab yayınları" 1367 (hicri-şəmsi), s. 114-115.

[53] Eyni qaynaq, s. 116.

[54] Həna Əlfaxuri- Xəlil Əlcər, "İslam dünyasında fəlsəfə tarixi", ərəbcədən farscaya çevirən Abdulhəmid Ayəti 3-cü yayım "İslami inqilab yayınları" 1367 (hicri-şəmsi), s. 116.

söylərlər.[55] Mötəziləyə görə Allahın zâtı ilə qaim olan tək sifət, Allahın qədim olmasıdır. Allahın zâtı yanında qədim sifətlər qəbul edilərsə, qədimlər çoxalmış olar. Bu da Allahın vəhdətinə ayqırıdır. Mötəziləyə görə kəlam səs və hərfdən meydana gələr. Böylə bir şey isə, ya cismdir, ya da ərəz. Cism və ərəz isə, qədim ola bilməz. O halda Quran da qədim deyildir, yaradılmışdır. Allah dilədiyi zaman zâtının xaricində olan biryerdə yaratdığı kəlamdır. Ayrıca, mötəzilə Quranda nasix və mənsux ayətlərinin bulunduğunu xatırladar. Allahın kəlamı qədim olsaydı mənsux edilməzdi iddiasında bulunar. Mötəzilənin digər məntiqi dəlili budur: Allahın kəlamı qədim olsaydı, insanlar və məxluqlar yox ikən Allah əmir verici və nəhy edici (saqındırıcı) olardı. Böylə bir durum Allahın şəninə yaraşmaz. Buna görə də Quranın qədimliyini qəbul etmək ağıla və məntiqə uyqun deyildir.

Mötəzilə deyirdi ki, İnsan ağıl yoluyla Allahı dərk edə biləcəyindən dolayı, Allah ona ağıl vermişdir.[56] Ağıl elm qazanmaq, insanın kəndisini əşyadan və əşyaları da bir-birindən ayırma mələkəsidir. Ağıl elmi arayan və şübhənin dağılmasını sağlayan düşüncədir. Mötəziləyə görə ağlın nəzəri və əməli yanları vardır. Ağıl elm qazanma mələkəsi olduğuna görə nəzəri tərəfi vardır. Digər yandan ağıl

---

[55] İsmail Mutlu "Tarihte ve Günümüzde Caferilik", s. 152.

[56] Həna Əlfaxuri- Xəlil Əlcər, "İslam dünyasında fəlsəfə tarixi", ərəbcədən farscaya çevirən Abdulhəmid Ayəti 3-cü yayım "İslami inqilab yayınları" 1367 (hicri-şəmsi) s, 117.

insanı dəlidən və içgüdü ilə hərəkət edən heyvandan ayıran başlıca mələkə olduğundan əməli və əxlaqi tərəfi də vardır. Allahı tanımaq Ağıl ilə əldə edilər və şəriətlə vacib sayılar. Əşya zâtı etibarı ilə yaxşı və pis deyildir. Ağıl və hədis qarşı-qarşıya gələrsə, ağıl tərcih edilməlidir.[57] Mötəzilə məzhəbi peyqəmbərin arxadaşları olan səhabiləri də qutsamaz, onları önəmsəməz. Mötəziləyə görə peyqəmbərlə həmsöhbət olmanın heç bir önəmi yoxdur və bu, bir üstünlük sayılmaz. Onlar səhabilərə mütləq itaəti qəbul etmir və onların davranışlarına tənqidi yanaşmaqdan yanaydılar. Ancaq mötəzilənin ən əsas və qarmaşıq qonusu Quranın "məxluq" və ya "qədim" olması haqqında idi. Bir çox üləma düşünürdü ki, Quran peyqəmbərin zamanında yaradılmamış, Quranın zâtı əzəlidir. Onlara görə Quran Tanrı kəlamı olaraq bəlli bir zamanda ortaya çıxmamışdır. Quran Tanrının elmi kimi əzəldən mövcud imiş.[58] Ancaq tövhid qonusuna çox vurqu yapan mötəzilə Quranı Tanrı zâtının bir parçası saymağı şirk olaraq görür və tövhidə ayqırı sayırdı. Quran yaradılmış bir əsər olduğundan bu şəkildə deyil, başqa şəkildə də yaratıla bilərdi. Quran məxluq olduğundan müsəlmanlar onu təfsir edə bilərlər. Müsəlmanlar arasında elmi, əqli və nəzəri dartışmaları başladan hər kəsdən daha çox mötəzilə olmuşdur. Mötəzilə ağıl və vəhyi bir araya gətirib barışdırmaq

[57] Prof. Dr. İbrahim Agah Çubukçu, Türk-İslam Düşüncesi Hakkında Araştırmalar.
[58] Eyni qaynaq, s. 167.

istəmişdi.[59] Mötəzilə görüşü o qədər yayqınlaşdı ki, yarqıda çalışanlar Quranın məxluq olduğunu qəbul etmək zorunda buraxılmışdılar. Məmun (813-823) mötəzilə məzhəbini dövlətin rəsmi ideolojisi olaraq duyurmuşdu. Bu üzdən mötəzilə görüşlərini qəbul etməyən bir çox üləma da iş yerlərini itirməsinlər də deyə, zahirdə də olsa mötəzilə məzhəbinin görüşlərini qəbul etmək zorunda qalmışdılar. Ancaq Əhməd ibni Hənbəl dövlətin qarşısında durdu və mötəzilə məzhəbinə qarşı çıxdığından zindana atılıb işkəncələrə məruz qaldı. Mötəzilə yüzillik iqtidar dönəmində siyasətlə özdəşləşdiyi üçün özgürlükçü düşüncələrə sahib olmalarına baxmayaraq təftiş birimləri oluşdurmuşdu. Bu məzhəbi qəbul etməyənlər təqib edilirdi. Önəmli bir sual ortaya çıxır. Hökümət nədən mötəziləni dəstəklər olmuşdu? Hökümət şiə, xəvaric, ismailiyə, mani, məcusi kimi etiqadlarla fikir savaşına çıxa bilməsi üçün mötəzilə məzhəbini daha uyqun görmüşdür. Mötəzilə dövlətin də təşviqi ilə Yunan və Hind fəlsəfəsini ərəb dilinə tərcümə etməyə başladı. Sırf bu dönəmdə müsəlmanlar sıfır və ondalıq rəqəmləri hindlilərdən aldılar.[60] Mötəziləyə görə insan kəndi felinin yaradıcısıdır. Dünyəvi və uxrəvi cəzaya çarpıla bilmək üçün yaxşılıqla kötülük arasında seçim yapa bilməlidir. Bunun üçün azad olmalıdır. Yoxsa cəzanın anlamı olmaz. Mötəzilə kəndi fikirlərini savunmaq üçün dialektik qullanırdı. Ancaq tərcümə işinin

---

[59] İnayət, Müasir İslamda siyasi düşüncə, s. 26.

[60] Will Durant, Mədəniyyət tarixi (farsca tərcümə) , 1-ci cild “Mədəniyyət beşiyi olaraq Doğu”, s. 599.

inkişafı, Yunan filosoflarının tanınması Mötəzilənin gözlərini açdı. Orada kəndilərini savunacaq fikirlər buldular. Özəlliklə Sokratdan öncəki Yunan filosoflarına dayandılar. Bir tərəfdən də fikirləri ilə ziddiyəy təşkil edən Yunan filosoflarına hücüm etdilər, rəddiyələr yazdılar. İlk dəfə olaraq İslam dialketiyi ilə Yunan fəlsəfəsi arasında mücadiləyə qapı açdılar. Bu hərəkətlər bir tərəfdən kəlamın (teolojinin) fəlsəfiləşməsinə, digər cəhətdən də fəlsəfənin din və iman məsələsi ilə məşğul olmasına səbəb oldu. Görünür ki, 9-cu əsrin sonlarına doğru Yunan və Hind təsirlərini gətirən tərcümə fəaliyəti İslam dialektiyinin şiddətli təpkisinə səbəb olmuşdur.[61] Yunan fəlsəfəsi ilə tanışılıq kəndiliyindən din və politika arasında us (ağıl) əksənli ilişki qurmağı arxasınca gətirəcəkdi. Mötəzilə görüşü tarixdən silinsə də onun yöntəmi daha sonra müsəlman filosoflar tərəfindən qullanılacaqdı. İştə bu yöntəmdən yola çıxan Farabiyə görə dinin özü (cövhəri) "etik-politika"dır.[62]

Mötəzilənin təlimləri beş ilkə ilə özətlənmişdir: 1- Tövhid. 2- Ədalət. 3- Və´d və və´id. 4- Mənzillər arası mənzil. 5- Yaxşılıqlara çağrı və kötülüklərdən saqındırma (əmr bilməruf və nəhy inəl müknir). Tövhid Tanrının biriliyinə olan inancdır və İslamın təməl ilkəsidir. Bu ilkəni bütün İslam məzhəbləri və firqələri qəbul edər. Ədalət mütləq anlamı ilə Allahın sifətlərindəndir.

---

[61] Hilmi Ziya Ülken "Uyanış devirlerinde tercümenin rolü" Ülken yayınlar 1997-İstanbul, s. 90-91.

[62] Farabi "İdeal devlet" Çeviren Prof. Dr. Ahmet Arslan, Vadi yayınları İstanbul-2004, s. 12.

“və´d və vəi´d”, yəni yaxşı işlərin savablanması və kötü işlərin cəzalanması. Bu, Tanrının ədalətindən asılı olan bir evrədir. Bağımsız bir ilkə deyildir. “Əlmənzil beyn-əl mənaziləteyn”. Bu, daha öncə izah edildi. Yəni iki mənzil arasında orta bir məqam. Bu prinsip böylə izah edilmişdir: Böyük günah işləyən kimsə nə mömindir, nə kafir. Böylə bir kimsə fasiqdir. Yaxşı işlərə çağrı və kötü işlərdən saqındırma ilə ilgili Quranda bir neçə ayət mövcuddur.[63] Mötəzilə Yunan fəlsəfəsini tərcümə edirdi, tam olaraq qəbul etmirdi. İslamla bağlaşanları qəbul edir, bağlaşmayanları sadəcə oxuyurdular. Bu üzdən də mötəzilə “İslamın özgürlükçüləri” olaraq tanınmışdır.[64] Əlmütəvəkkil iqtidara gəldikdən sonra mötəzilə ilə savaşa başladı. Əlmütəvəkkil Quranı məxluq sayan hər kəsin öldürülməsinə əmr verdi. Sorqu-sual etmədən hər kəsin əhli-hədisə təqlid etməsini istədi. Fəlsəfəni yasaqladı. Kitab satıcıları fəlsəfə kitabları satacaqları təqdirdə öldürülücəkdilər. Bu üzdən Bağda kitabxanaları dövlət qarşısında öhdəlik imzaladılar. Mötəzilənin əsərlərini yaxmağa başladılar.[65] Əlmütəvəkkil mötəziləni

---

[63] Həna Əlfaxuri- Xəlil Əlcər, “İslam dünyasında fəlsəfə tarixi”, ərəbcədən farscaya çevirən Abdulhəmid Ayəti 3-cü yayım “İslami inqilab yayınları” 1367 (hicri-şəmsi), s. 118, 121, 123.

[64] Həna Əlfaxuri- Xəlil Əlcər, “İslam dünyasında fəlsəfə tarixi”, ərəbcədən farscaya çevirən Abdulhəmid Ayəti 3-cü yayım “İslami inqilab yayınları” 1367 (hicri-şəmsi), s. 117.

[65] Hüseyn Sultanzadə, İran mədrəsələrinin tarixi (Əski çağdan Dar-ul fünunun təsisinə qədər), Peqah yayınları, Tehran-1364, s. 71.

ortadan qaldırıb yerinə əşə´ri məzhəbini oturtdu.

Çağımızda İslam dünyasında modern mötəziləçilər ortaya çıxmışdır. Bunlar mötəzilə məzhəbinin tarixdən silinməsini İslam dünyasının və azadlıq istəyən hər kəsin faciəsi kimi nitələrlər. Mötəzilə azadlıq yolunda mücadilə etmək istəmişdi və düşüncələrində də azadlıq var idi. Ancaq onlar özləri haqda da cinayət etdilər. Xəlifə Məmun onları dəstəklədikdən sonra kəndi etiqadlarını vacibatdan saydılar. Onlara qarşı çıxanları cəzalandırırdılar. Böyləcə İslam aləmi qanlı bir bəlaya yaxalandı və İslam dünyası iki dəstəyə ayrıldı: 1- Ağıla inanıb və dini, əqli verilərə tabe tutanlar. 2- Qurana sıxca bağlanan qrup. Bu qrup hər tür yeniliyi bidət sayaraq ortadan qaldırılmasını istəyirdi. Bu savaşın İslama və İslamın ruhuna zərər verəcəyindən qorxulurdu. Sonunda mötəzilə düşməni olan mütəvəkkil iqtidara gəldi və ussal bir məzhəbin kökünü qazdı. Mötəzilə hədis əhli ilə savaşsa da məğlub oldu. Hədis əhli qazandı.[66]

Bu olaylar sünni cəbhədə ortaya çıxmışdı. Şiə tərəfində də fərqli olaylar oluşmuşdu. Şiə ilk xəlifənin seçiminə hiylə qatıldığına inanar. Qədiri-xum da peyqəmbərin Əlini varis olaraq bəlirtdiyini iddia edərlər. Ancaq Qədiri-xumla peyqəmbərin vəfatı arasında sadəcə üç ay zaman var. Peyqəmbərin bu son həcc

[66] Həna Əlfaxuri- Xəlil Əlcər, "İslam dünyasında fəlsəfə tarixi", ərəbcədən farscaya çevirən Abdulhəmid Ayəti 3-cü yayım "İslami inqilab yayınları" 1367 (hicri-şəmsi), s. 136.

ziyarətində 70-120 min arasında müsəlman iştirak etmişdi. Sanki bu üç ay içində hər kəs öz hafizəsini itirmiş və kimsə, hətta Əli və çevrəsi də əsla Qədiri-xum olayına işarə etməmişlər. Yüzillərdən sonra Qədiri-xum olayı ortaya atıldı. Peyqəmbər son həcc ziyarətindən döndüyündə Qədiri-xum adlı bir dərədə Hz. Əli haqqında gözəl sözlər söyləmiş. Buna bənzər gözəl sözlər başqa səhabilər haqqında da söyləmişdir. Bu nədənlə şiə ilk gündən ədalətsizliyin olduğuna inanmaqdadır. İlk xəlifə seçimində Hz. Əlinin haqqının gözardı edildiyini savunar. İlginç olan budur ki, “Nəhc-ül bəlağə”nin Hz. Əliyə aid olduğunu qəbul edərsək, burada da Əli əsla imamlıq haqqında bir tək söz bilə söyləməmiş və Muaviyəyə yazdığı məktubunda xalqın daha öncəki xəlifələrlə biət etdiyi kimi onunla da biət etdiyini yazar. Yəni Hz. Əlinin savaşı da imamət yolunda deyil, xilafət üçün olmuşdur. Nəhc-ül bəlağənin Hz. Əliyə aid olub-olmadığı bəlli deyil. Aid olsa bilə, çox cüzi qismi Hz. Əliyə aiddir. Çünkü orada Hz. Əliyə yaraşmayacaq sözlər yerləşdirilmiş. Örnəyin Hz. Əli daha öncəki xəlifələri qəsbkar adlandırmış. Qəsbkarlıq İslamda çox ağır suç sayılmaqdadır. Qəsbkarmışlarsa, qəsbkara qarşı cihad etməyi İslam vacib bilmişdir, nədən Əli qəsbkarlarla savaşmamışdır? Özəlliklə Əliyə aid edilən bu kitabda qadınlar haqqında çox aşağılayıcı sözlər söylənmişdir. Buna bu şəkildə bəraət qazandırırlar ki, Ayişə ilə savaşdan döndüyü üçün bu sözləri söyləmiş ola bilər! Ən önəmlisi isə, bu kitabın necə hazırlandığı bəlli deyil. Seyid Rəzi bir ön söz yazmış və ən uyqun olan sözləri

burada yerləşdirdiyini qeyd etmiş. Hz. Əlinin vəfatından təqribən 400 il sonra bu həcmdə kitab necə qala bilmişdir? Peyqəmbərin hədislərinin necə hazırlandığını anlatdıq. Ancaq Nəhc-ül bəlağəni tərtib edən Seyid Rəzi bu sözləri kimlərdən duyduğunu yazmamış. Bir kitab çıxarmış Hz. Əliyə aid olduğunu bildirmiş. İlginç olan budur ki, şiənin imamlıq və İslam iqtidarı imamlara məxsusdur kimi iddialarına rəğmən Hz. Əli yaralandığı zaman oğlu Həsəni öz yerinə varis olaraq təyin etməmiş və xəlifə seçimini Hz. Ömər kimi ümmət iradəsinə buraxmışdır. Hz. Həsən də bu işi mən başarmaram deyə xilafəti Müaviyəyə devr edərək ona biət etmişdir. Həm Həsən, həm də Hüseyn Muaviyəyə biət etmişlər. Nəhc-ül bəlağənin "Şəqşəqiyyə" xütbəsində Hz. Əli deyir: "Mirasımın qarət və qəsb edildiyini görürdüm. O birinci (yəni Hz. Əbubəkir) o dünyaya köçdükdən sonra xilafət məsnədini başqasına buraxdı." Çox ilginç! Hansı mirasdan söhbət gedir? Peyqəmbərin mirasımı olur? Peyqəmbər şahmı idi ki, mirası da olsun? Bəllidir ki, bu iftiralar Hz. Əliyə aid deyil və onun adına yazmışlar. Çünkü Hz. Əli özündən öncəkilərə nədən biət etmiş o zaman? Fəridəddin Əttar Nişaburi "Məntiq-üt təyr" (quşların məntiqi) adlı kitabında bu məsləyə bu şəkildə toxunmuşdur: "Xilafətə Əbubəkir və Ömər çox da istəkli deyildilər. Çox istəkli olsaydılar, onlar kəndi evladlarını öz yerlərinə xəlifə təyin edərdilər."[67]

---

[67] Fəridəddin Əttar nişaburi, "Məntiq-üt təyr":
Dər xelafət nist meyl ey bixəbər,
Meyl key ayəd ze Bubəkr o Omər?

Nəhc-ül bəlağənin “Şəqşəqiyyə” xütbəsini doğru olaraq qəbul etsək, o zaman Hz. Əlinin şəxsiyəti sorqulana bilər. Belə ki, nədən Hz. Əli özündən öncəkilərə biət etmiş, onlar öldükdən sonra onları qəsbkar adlandırmış? Osmanın savunması üçün Hz. Əli öz oğulları Hz. Həsən və Hz. Hüseyni göndərməmişmi idi? Yəni özündən öncəki İslam böyüklərinə zamanında bu qədər sayqı ilə yanaşan Hz. Əli nədən və nədən onların ölümündən sonra arxalarınca böylə sözlər söyləməli idi? Bütün bu verilər göstərir ki, Nəhc-ül bəlağədə yerləşdirilən təhqir dolu sözlərin heç birisi Hz. Əliyə aid deyildir.

Qədiri-xum olayına bir az daha deyinmək istərdim. Qədiri-xumda Hz. Peyqəmbər Hz. Əlinin əlini qaldıraraq “Mən kuntu mövlahu, fəhiza Əliyun mövla” demişdir. Yəni mən kimin mövlası isəm, Əli də onun mövlasıdır. Bu ifadə kəsinliklə peyqəmbərin kəndisinə varis təyin etdiyi anlamına gəlməməlidir. Çünkü Qurani-Kərimin Nisa (4) surəsinin 59-cu ayəti ilə uyqun gəlməməkdədir. Bu ayətdə deyilir ki, “Ey iman edənlər, Allaha və Rəsuluna və sizdən olan əmr vermə yetkisinin sahiblərinə itaət edin.” Hz. Məhəmmədin vəhyinə iman gətirən bütün və özəlliklə Əbubəkir, Ömər kimi seçkin səhabilər müsəlmanlardan ibarət olduqlarından onlara uymaq Quranın hökmü sayılmaqdadır. Qurani-Kərim siyasi vilayəti soya bağlı olaraq önərməmiş, müsəlmanların ortaq ağlına buraxmışdır. Bu ortaq ağıl Hz. Əlini də, Əbubəkiri, Ömər və ya başqasını da seçə

---

Meyl əgər budi dər an do moqtəda,
Hər do kərdəndi pesər ra pişva.

bilərdi. Öylə də olmuşdur və Hz. Peyqəmbərin vəfatından sonra seçimə hiylə qatılması yalan və iftiradan başqa bir şey deyildir. Necə ola bilər ki, o günə qədər İslam yolunda hər tür fədakarlıq edib canlarını təhlükəyə atanlar birdən birə hamısı dönüb yalançı və hiyləçi olsunlar? Hz. Məhəmmədin Hz. Əlini mövla olaraq sunması onu varis olaraq seçdiyi anlamına gəlməmişdir.

Sünnət əhli, yalnız peyqəmbərin söylədiklərini hədis olaraq qəbul edər. Şiə əhli isə, imamların da söylədiklərini hədis kimi qəbul edər. Siffeyn savaşından sonra Hz. Əli tərəfdarlarının izlənməsi durumu daha da kötüləşdirmişdi. Bu təqiblər üzündən istər-istəməz fikri örgütlənmə daha da güclənməyə başlamışdı. Xəvaric eyni cümə günündə Əlini, Müaviyəni və Əmroası öldürməyi qərarlaşdırmışdılar. Əmroas o cümə namaza getmir və öz yerinə pişnamaz olmaq üçün şəhərin polis rəisini göndərir. Bu saldırıda şəhərin polis rəisi öldürülər. Müaviyə yaralanar və Əli də yaralandıqdan üç gün sonra vəfat edər. Əlioğlu Həsən bu zaman 37 yaşında olmuşdur. Müaviyə və Həsən arasında barış andlaşması imzalanır. Bu andlaşmaya görə Müaviyənin ölümündən sonra xilafətin Həsənə keçməsi gərəkirdi. Hüseynin bu andlaşmaya qarşı çıxdığını yazarlar. Həsən və Hüseyn Müaviyədən hədiyələr alırdı.[68] Ancaq Müaviyənin

[68] Peyğəmbərin vəfatından 40 il sonra Müaviyə öz siyasi rəqibi Əbutaliboğlu Hüseynin könlünü ələ almaq üçün ona o zaman cariyə adlanan bir neçə kəniz göndərdi. Havva adında bir cariyənin həyatı islam tarixində

planı üzərinə Həsənin qadınlarından biri onu zəhərləyib öldürər. “Həsən ibni Əli çox evlilik yapmışdı. Yetmiş kənizlə evlənmişdi.”[69] Əməvilər dönəmində camilərdə cümə namazından sonra toplu şəkildə Əli və oğullarına lənət göndərərdilər. Zamanla bu alışqanlıq halına gəlmişdi. İndiki şiənin “aşura ziyarəti”

---

köləliyin necə çirkin bir vəziyyətdə davam etməsini ifşa etməkdədir. Çünkü Havvanın Quranla dərin tanışlığı olmasına baxmayaraq, müsəlman olmaq istəməməsi diqqəti cəlb edir. Ən diksindirici hadisə odur ki, Havva Quranı əzbər bilsə də, ancaq müsəlman olmaq istəmir. Nədən? Çünkü müsəlmanların davranışlarından, iyrənc, qeyri-əxlaqi və alçaq davranışlarından qorxmuşdu. “Bir nəfər Müaviyəyə gözəl bir kəniz gətirdi. Müaviyə kənizin qiymətini sorduğunda adam “min dirhəm” dedi. Müaviyə bu məbləği ödəyib, digər əşyalarla bir yerdə kənizi Əlioğlu Hüseynə hədiyə göndərdi.”[28] Hüseyn, dinin qaydaları əsasında yaşayan müsəlman idi. Bu qadından bir neçə soru sorduqdan sonra dərhal onun azad insan olmasına qərar verdi. Tarixi sənədlərdə Hüseynin bu qadının gözəlliyinə heyran olduğu söylənir. Onların arasında keçən söhbət bu şəkildə olmuşdur:

Hüseyn: Sizin adınız nədir?

Kölə qadın: Havva.

Hüseyn: Bu ad sizə çox uyğundur. Nə iş görərsiniz?

Havva: Quran və şeir oxumağı bacarıram.

Hüseyn: Qurandan bəzi parçalar mənə oxuya bilərsinizmi?

Havva: “və qeyb xəzinələrinin açarları onun yanındadır. Bunu onun özündən başqa kimsə bilməz. Torpaqda və dənizdə nə varsa, hamısından o xəbərdardır.”[29]

Hüseyn: İndi bir şeir də söyləyə bilərsinizmi?

Havva: Özgürcə danışa bilərəmmi? Sən mənim özgürlüyümü təmin edirsənmi?

Hüseyn: Bəli, edirəm.

Havva:

namazında Əbubəkirin, Ömərin, Osmanın lənətləndiyi kimi. Əməvi Ömər ibni Əbdüləziz (679-720) iki illik iqtidarı dönəmində Əli və oğullarına lənət göndərməyi yasaqlayır. Abbasi Əlmütəvəkkil iqtidara gəldikdən sonra Əlioğlu Hüseynin məzarını söküb yerinə su bağladı. Əlmütəvəkkil öldükdən sonra oğlu Hüseynin məzarını qismən onardı və ziyarətini əngəlləmədi. Daha sonra Büveyh oğulları tərəfindən onarıldı. Səfəvilər, Nadir Şah və Qacar dönəmində indiki duruma gətirildi.[70] Qədiri-xum olayını da Büveyhlilər rəsmi gün və bayram olaraq tarixə soxmuşlar.[71]

Şiə axımının oluşumunda üç etkili etkən olmuşdur: 1- Peyqəmbərin vəfatından sonra Əbubəkirin xəlifə olaraq seçilməsi. Tarixi verilərə görə Əli peyqəmbərin dəfn mərasimi ilə məşğul ikən Əbubəkiri xəlifə seçmişlər. Şiə bunu Əliyə qarşı yapılmış haqsızlıq olaraq dəyərləndirər. 2- Siffeyn savaşından sonra 661-ci ildə xilafətin Müaviyəyə devr edilməsi. 3-

---

Səninlə daima bir yerdə olmaq,
Mutluluq və sevgi qaynağıdır, bax.
Ancaq nə etməli? Fanidir həyat,
Mutlu birlikdəlik mümkünmü? Heyhaat...![*]

Tarixi qaynaqlardan alındığına görə, Əlioğlu Hüseyn bu zaman ağlamağa başlamış və demiş: “Artıq sən özgür bir qadınsan və Müaviyənin mənə göndərdiyi bütün hədiyələr də sənin olsun.” Daha sonra Hüseyn qalxıb namaz qılmışdı. (Fatimə Mernisi “Pərdələr arxasında gizlədilən tarix”, Qanun nəşriyatı Bakı-2008, s. 243-244)

[69] Dr. Taha Hüseyn, Əli və oğulları, s. 219.

[70] Həsən İmadzadə, Ondörd məsum, s. 801.

[71] Baqir-ul İslam univeristeti, “İslam tarixi” dərgisi, Sasan Təhmasibi “Ali-Buveyh”, s. 107.

Əlioğlu Hüseynin 680-ci ildə Müaviyəoğlu Yəzid tərəfindən öldürülməsi.

Əlinin Osmanın qətlində əli olmamışdır. Ancaq Müaviyə deyirdi ki, qətli Əli planlamış. Hz. Ayişə, Təlhə və Zübeyr qatilləri yaxalamadığı üçün Əlini tənqid edirdilər. Onlara görə Əli qatilləri cəzalandırmaq yerinə dövlət vəzifəsində çalışmaqdadır. Bu üzdən də Əli və Hz. Ayişə arasında savaş olmuşdur. Cəməl savaşında Hz. Ayişə yenilib yaxalanar. Hz. Əli deyər ki, Ona sayqı göstərmək bizim görəvimiz, günahı varsa, Allaha həvalə edirik. Hz. Əli xəlifə olduqdan sonra müxalifləri üç dəstədən ibarət idi: 1- Nakəsin. Öncə Əli ilə biət edib sonra biətlərindən vaz keçənlər. Təlhə və Zübeyr kimi. 2- Qasitin. İlk başdan Əlinin xilafətini qəbul etmirdilər. Müaviyə və yandaşları kimi. 3- Mariqin. Siffeyn savaşından sonra Hz. Əlidən ayrıldılar və "xəvaric" adlandılar. Bunlar Hz. Əli üçün Müaviyədən də təhlükəli düşmənlər oldular və sonunda da xəvaricdən biri olan İbni-Mülcəm Hz. Əlini öldürdü.

Əli zamanında şiə siyasi və etiqadi bir anlam daşımazdı. Tərəfdar anlamında idi. Ərəb dilində də şiə tərəfdar deməkdir. Əli şiəsi və Müaviyə şiəsi var idi. 28-ci surənin 15-ci ayətində və 37-ci surənin də 83-cü ayətində "İbrahim şiəsi" ifadəsi keçər. "Şiə" qavramının tərəfdar anlamının dışında siyasi və etiqadı anlam daşıması sonrakı tarixi olayların ürünü olacaqdı.

Həsən ibni Əli də öldürüldükdən sonra qardaşı Hüseyn də Müaviyəyə qarşı etirazda bulunmadı. Müaviyə həyatda ikən oğlu Yəzidi

varis duyurdu. Bu, İslam gələnəyini pozmaq idi. Çünkü Əbubəkir və Ömər öz oğullarını varis olaraq duyurmamışdılar. Müaviyə Hüseyndən oğlu üçün biət almaq istəmədi. Bunu zamanın axışına buraxmışdı. O, həm də güclü siyasətçi və düşmənşünas idi. Oğlu Yəzidə tapşırmışdı ki, Hüseyn ibni Əli və Ubeydullah ibni Zubeyrə diqqət etsin. Böyləcə Müaviyə öldü və Yəzid atasının yerinə keçdi. Yəzid Mədinənin elbayına (valisinə) bir məktub yazaraq Hüseyndən biət almasını istədi. Hüseyn silahlı adamlarını götürüb valinin yanına getdi və dedi ki, əgər görüşmə çox uzun sürsə içəri girərsiniz. Vali biət təklif etdi və Hüseyn qəbul etmədi. Bir gecə düşünmək üçün vaxt istədi. Evinə döndüyündə bilirdi ki, yarın biət etməyə getməsə öldürüləcək. Bu üzdən ailəsi ilə bir yerdə o gecə gizlincə Mədinədən Məkkəyə yola düşdü. Hüseynin ağlından keçənlər bilinmir. Yəzidə qarşı savaş açma ehtimalı olmamışdı. Ancaq Yəzidi qəbul etmədiyi bəllidir. Məkkədə də Yəzid adamlarının onu və ailəsini öldürəcəyindən çəkinirdi. Hüseynə xəbər verdilər ki, paltarlarının altında silah gizlətmiş olan adamlar həcc törəni etməkdədirlər. Bunlar kəsinliklə səni və ailəni öldürmək üçün göndərilmişlər. Keçici də olsa, Hüseyn özünün və ailəsinin güvənliyini təmin etmək fikrində idi. Bu zaman Kufə ağsaqqallarının Hüseyni dəvət etmə məktubları gəldi. Kufə Hz. Əlinin də başkəndi olduğu üçün Əli soyuna sayqı var idi. Bu ana qədər Hüseynin söhbətlərində qiyam, inqilab kimi sözlər keçməməkdədir. Bunlar 20-ci əsrdə ürətilmiş və Hüseynə ətf edilmiş anlamlardır. O, sadəcə

ailəsinin güvənliyini sağlamaq üçün düşünmüşdü. İmam əmisi oğlu Müslim ibni Əqili Kufənin durumunu yoxlamaq üçün oraya göndərir. Müslümü yaxşı qarşılayırlar. Müslüm də İmama yazır ki, Kufəyə gəlsin. Bir ay sonra Kərbəla hadisəsi gerçəkləşəcəkdi. Yəzid, İbniziyadı olayı yatışdırmaq üçün Kufəyə göndərir. Hüseyn də bu arada Məkkədən kufəyə doğru yola çıxmışdı. İbniziyad təhdidlə Kufə əhlini imam yandaşlığı yapmaqdan alıqoyar və Müslim ibni Əqili də yaxalayıb öldürərlər. İbniziyad kufəliləri həm də Hüseynə qarşı silahlandırar. Hüseyni Kufəyə dəvət edənlər bu dəfə silahlanıb O´nunla savaşmaq üçün bəklərlər. Kufəyə yola düşmüş olan Hüseyn Müslümün ölüm xəbərini duyduğundan Kufəyə getmək istəməz. Ancaq Hüseyn öylə bir məkana çatmışdı ki, orada Onu və ailəsini səssizcə quşatıb öldürmək mümkün idi və Əməvilər bu fürsəti qaçırmaq istəmədilər. Əməvi ordusunun başında duran Hürr Hüseynin ailəsini mühasirə edər və Yəzidə biət etməsini istər. Hüseyn deyər ki, buraxın məni gedim başqa ölkəyə. Ancaq Hürr izn verməz və deyər ki, biət etməlisiniz, mənə böylə əmr verilmiş. Hüseyn bu səhrada tuzağa düşdüyünü hiss edər. Artıq çıxış yolu qalmamışdı. İmam Hüseynə dayatırdılar ki, ya Şama gedəlim Yəzidlə biət et, ya da Kufəyə gedəlim Yəzidin nümayəndəsi İbniziyadla biət et. Ya da burda biət et və xəbərini biz Yəzidə göndərəlim. İmam Hüseyn burada dirənmək qərarına gəlir. Kərbəla olayı bu şəkildə gerçəkləşər. Hüseyn ölmək üçün yola çıxmamışdı. Hətta Yəzidlə savaşmaq üçün də bu

yolçuluğa çıxmamışdı, çünkü savaşa çıxan ordu ilə çıxar, sadəcə yanındakı balaca yaşlı çocuqları və ailəsi ilə deyil. Ona görə də aşura günündən öncəki gün açıqca ətrafındakılara deyir ki, mən buraya savaşmağa gəlməmişdim. Ancaq durum öylə olmuş ki, geriyə dönüş yoxdur, Yəzidə də təslim olamam. Siz istərsəniz gedə bilərsiniz. Çünkü Yəzid mənim biətimi istəyir sizin deyil. Hüseynin yanındakılar Onu yalnız buraxmır və orada Hüseynlə qalıb savaşaraq ölməyi tərcih edirlər. Hz. Hüseyn yola çıxdığında o zaman hələ həyatda olan bəzi səhabilər İmama deyirlər ki, bu yol uğurlu yol deyil, vaz keç bu yoldan. Ancaq Hüseyn başqa hesablar yapmışdı. Onları da dinləməyərək yola çıxmışdı. İbniziyadın əlinə qaçırmaması gərəkən fürsət düşmüşdü. Hüseyn öz ayağı ilə öylə bir səhraya gəlmişdi ki, orada öldürülməsinin xəbərini də kimsə duymayacaqdı. Necə ki, çox sonralar Hüseynin və ətrafındakılarının şəhadət xəbəri yayılmağa başladı. Kimsə xəbər tutmadan Əməvi dövlətinə zidd olan Hüseyn amilini ortadan qaldırmaq üçün İbniziyad uyqun fürsəti əldə etmişdi. Fürsəti qaçırmadılar və susuz bir səhrada Hz. Hüseyni ətrafındakılarla bir yerdə şəhid etdilər.

Yəzidə qarşı qiyam edən bir başqası idi. Ubeydullah ibni Zübeyr idi. Müaviyə oğluna ona diqqət etməsini tapşırmışdı. Ubeydullah ibni Zubeyr Mədinədə açıqca Yəzidə qarşı savaş açdı. Yəzid Mədinəni bu savaşda viran edib çoxlarını öldürdü. Ubeydullah ibni Zubeyr Mədinədən Məkkəyə fərar etdi. Yəzid Məkkədə də onu izlədi. Məkkəni mühasirə etdi. Ancaq tam bu sırada Yəzid öldü və məkkəlilər qətl

edilməkdən qurtuldular. İmam Hüseynin metodu Ubeydullah ibni Zubeyrinkindən fərqli idi. Daha sonrakı dönəmlərdə şiə ədəbiyatında Hüseynin şəhadəti üzərinə çox bilgi ürətildi. Bəzən də gerçək olmayan xəyali şeylər bu olaya yüklədilər. Kərbəla olayının hər kiçik anısına şeirlər yazıldı, rəsm əsərləri çizildi. Ordakı fədakarlıqlar sənətlə estetizə edildi. Göz yaşlarına bürünərək insanların ruhlarına daşındı. Tarixi hadisə olmaqdan çıxıb bir sənət hadisəsinə dönüşdü. Yüzillər boyunca Kərbəla olayı üzərinə məzhəbi, etiqadi, estetik yöndən yatırıım yatırıldı. Bunun yanı sıra Kərbəla olayından siyasi amac üçün yararlanma olayı da olmuşdur.

Aşura günü sünnət əhli üçün də önəmli bir gündür. Bu gündə oruç tutarlar. Çünkü peyqəmbər ilk orucu bu ayda və bu gündə duyurmuş, ancaq daha sonra oruçluq ramazan ayına keçmişdir. Bu üzdən də Aşura günü orucunu yadigar olaraq hələ də unutmamışlar. Mərakeş kimi bəzi sünni ölkələrdə günün yarısını sevinər və yarısını kədərlənərlər. Günün birinci yarısı ilk oruc sevincidir və sonrakı yarısı Hz. Hüseynin kədəri. Bəzi sünnət əhli alimlər yəzidin bu işdə əlinin olduğunu şübhə ilə qarşılamışlar. Ona görə də Yəzidi lənətləmənin doğru olmadığını söylərlər. Onlara görə Yəzid xəta etmiş müsəlman ola bilər, ancaq bu, lənətlənməsi anlamına gəlməməlidir. Bu olay gerçəkləşdiyində nə sünnilik var idi, nə də şiəlik. Yəzid Əbusüfyanın nəvəsi idi. Peyqəmbərin qarşısındakı yenilgələrini unutmamışlar və intiqam peşində olmuşlar. Bunu Yəzid açıqca

söyləmişdir. Demişdir ki, Bənihaşim qəbiləsi vəhy adına iqtidarı ələ keçirmişdi. Nə vəhy var, nə pərdə arxasında bir şey var. Mən sevinirəm ki, öz borcumu yerinə yetirmişəm. Dədələrimin intiqamını peyqəmbərin nəvələrindən aldım. Kərbəla faciəsində İmam Hüseyn şəxsiyətinin höküməti təhdid etməsinin yanı sıra bir də olayın kökündə Əməvilərin əski intiqam duyqusu durmuşdur. Şiə düşüncə həyatını etkiləyən İmam Hüseynin həyatı bir istisna olmuşdur. Ancaq bu istisnanı sonrakı yüzilliklərdə qanuna uyqunluğa dönüşdürdülər. Sanki bütün imamlar Hüseyn kimi davranmışlar kimi bir tablov çizdilər. Ancaq imamların heç birisi qiyam etməmişdir. Əli Müaviyə ilə barışı qəbul etdi. Həsən də o şəkildə. Sonrakı imamların da hamısı zamanın iqtidarları ilə anlaşmışlar, xilafətə qarşı çıxmamışlar.[72] Kərbəla olayı şiənin etiqadı istiqamətə yönəlməsinə təkan verər.

Kərbəla olayından beş il sonra Muxtar Səqəfi Hüseynin intiqamını almaq üçün qiyam edər. Muxtar Səqəfinin qiyamı şiənin radikal bir ideoloji olması yolunda böyük təsir göstərər. Zeynəlabidin Yəzidə biət etdiyi üçün Muxtar onun imamlığını qəbul etməz. Əlinin Məhəmməd Hənifə adında bir oğlunu kəndisinə imam olaraq bəlirlər. O da siyasətdən və devrimdən uzaq bir həyatdan yana idi, böylə işlərə qatılmaq fikri yox idi. Muxtar Səqəfi Sasani ordularını yenən Sə´d ibni Vəqqası, Hüseynin qatilləri İbniziyad və Şimri işkəncə altında öldürdü. Muxtarın və Hənifənin qətli ilə bu hərəkət durduruldu.

---

[72] Dr. Əbdülkərim Soruş.

Şiə fiqhinin iki qolu var: 1- İxbari. 2- Üsuli. Sosial gəlişmələr baxımından önəmli sonuçları olan bu məktəblərdən, ixbarilər fiqh üçün əhli-beytdən gələn hədislərə ağırlıq verər. Üsulilər isə, ağlı önə çıxarmağa çalışaraq ictihadı savunarlar. Bunlara görə insanlar təqlid edən və təqlid edilənə bölünürlər. Ixbarilərə görə isə, bütün insanlar imamı təqlid etməlidirlər və müctəhid olmaları caiz deyildir. Dini də hər yönü ilə ancaq imam bilməkdədir. Bütün müctəhidlər uyulması gərəkən otoritələrdir. Ancaq birisi mərcəi-mütləqdir. Yəni digər müctəhidlər də ona uymalıdır.

Zeyn-əl Abidinin iki oğlu arasında imamət haqqında sorun olmuşdur. Zeyd və Baqir. Zeyn-əl Abidin öldükdən sonra bir qisim baqiri deyil, Zeydi imam olaraq qəbul etdi. Bu firqə zeydiyə olaraq tarixə keçdi. Zeyd və qardaşı Baqir arasında ixtilaf var idi. Zeyd qardaşını Əməvi zülmü qarşısında səssiz qalmaqda suçlayırdı. Zeyd imamətin şərtini qılıc və qiyam olaraq görürdü. Bir gün qardaşına demişdi: bizim atamız gerçək imam olmamış, çünkü heç bir zaman qiyam fikrində olmamışdır.[73] Zeyd özü Əməvi xəlifəsi Hişam ibni Əbdülməlikə qarşı qiyam edib şəhid oldu. Günümüzdə Yəmən əhalisi zeydi məzhəbindədir. Şiənin beşinci imamı Baqir də dönəmin iqtidarları ilə sorun yaşamamışdı. İmam Cəfər Sadiq elmlə daha çox uğraşırdı. Şiə məzhəbinin əsasında Cəfər Sadiqin təlimlərinin durduğunu yazarlar. Yalnız onun öyrənciləri şiəliyin deyil, sünni

[73] Şəhristani, Əlmiləl vəl nəhl, 1-ci cild, s. 251.

məzhəblərinin əsasını qoymuşlar. Ancaq Cəfər Sadiq heç bir yazılı qaynaq miras buraxmamışdır. Yalnız ondan nəql edilən rəvayətlər vardır. Bu nəqllər sonradan yetişən Şeyx Müfid, Şeyx Tusi, Şeyx Seyid Mürtəza kimi şiə fəqihlər tərəfindən qələmə alınmışdır. Şiənin dörd ana qaynağı bu kitablardır: 1- Məhəmməd Koleini "Üsuli-kafi." 2- Əbucəfər Babuyə Qumi "Mən la yəhzərət-ül fəqih."* 3- Şeyx Tusi "Təhzib vəl-ehkam". 4- Şeyx Tusi "Əl-istibsar."[74] Cəfər Sadiq ortaya öz məktəbini qoymuşdu. Bu məktəb sonrakı yüzillərdə "Cəfəri şiə" adlanacaqdı. Cəfər Sadiqdən yazılı mətn qalmadığı üçün bütün əldə olanlar rəvayətlərdir. Rəvayətlərin nə qədər güvənli olması bəlli deyil. Cəfər Sadiqə görə dünya bir gün də imamsız olmamışdır, olmayacaqdır. Cəfər Sadiq imamlığı ən yüksək mənəvi-ilahi məqam olaraq nitələsə də onlar üçün siyasət və hökümət haqqı tanımamışdı.

Cəfər Sadiqin vəfatından sonra ifrat bir şiə məzhəbi olan batiniyə ortaya çıxdı. Bunlar Cəfər Sadiqin böyük oğlu İsmayılı imam kimi tanıyırdılar. İsmayıl atası həyatda ikən ölmüşdü.[75] Cəfər Sadiqdən sonra iki şiə cərəyanı ortaya çıxar. Cəfər Sadiqin birinci oğlunu imam qəbul edən İsmailiyə və ikinci oğlu Musa kazimi qəbul edən imamiyə və ya isna-əşəri şiəsi.

Şiə, tarixi sürəc içində yüzə yaxın firqəyə parçalanmışdır. Onlardan ibrahimiyə, isna-əşəri,

---

* For him not in the Presence of a Jurisprudenceş

[74] Hilmi Ziya Ülken "İslam Düşüncesi" Ülken Yayınları İstanbul- 1995, s. 83.

[75] İsmail Mutlu "Tarihte ve Günümüzde Caferilik"

imamiyə, ismailiyə, zeydiyə, əhli-fətrət, əshabi-səhifə, səkkakiyə, fatimiyə, şeyxiyə, rafizi, hürufiyə, nöqtəviyə kimi firqələr daha məşhurdur.

Musa Kazimin oğlu və 8-ci imam Rza, Abbasi xilafətinin Xorasandakı vəliəhdidir. Həm imam Rza həm də oğlu 9-cu imam Cavad, Abbasi xəlifəsi Məmunun qızları ilə evlənmişlər. İmam Rza Ümmülhəbibə və oğlu Cavad isə, Ümmülfəzl ilə evlənmiş və toylarında xəlifə bol para xərcləmişdir. Riyan ibni Şeyb Məmunun vaqiənevisi olmuşdur. Şeyb 9-cu imam Cavadın Məmunun qızı ilə evlənməsi haqda bilgi vermişdir: "Saraydan yüksək sevinc və musiqi səsləri eşidilirdi. Saray sanki dənizdə bir gəmi kimi görünürdü. Xəlifənin kölələri başlarında altun qabları ortaya çıxdılar. Məmun kürəkəni imam Cavadın başına altun parçaları səpirdi. O gecə Məmunun bəyin və gəlinin başına səpdiyi altunlar hesabına çox adam yoxsul idisə, birdən-birə zənginləşdi."[76] Daha sonra onun oğlu Nağı onuncu imam olaraq bilinir.

11-ci imam Samirədə yaşayırdı. Samirə əsgəri və hərbi şəhər olduğundan ona Həsən Əsgəri deyirdilər. Həsən Əsgərinin üç qardaşı bir bacısı var idi. Səfəvilər dönəmində Ayişə adı yasaqlanıb lənətlənsə də Onun bacısının adı Ayişə idi. Qardaşının birinin adı Cəfər idi. Şiə əhli ona "Cəfər kəzzab" deyirdi. Çünkü 11-ci imamın varisinin bəlirlənməsi üçün düzənləndiyi kommissionda Cəfər Allaha and içdi ki, qardaşı Həsən Əsgərinin oğlu olmamışdır. "Mehdi"

[76] Şücaəddin Şəfa "1400 ildən sonra" s. 944.

adında dörd yaşında oğlunun olub qeybə çəkildiyinə inananlar ona “Cəfər kəzzab” dedilər, yəni yalancı Cəfər. Həsən Əsgərinin dəfn mərasimində Cəfər meyit namazı qılmaq istər. Təkbir etmək üzrə ikən kimsənin gözünə görünməyən buğdayı bir çocuq önə çıxıb Cəfər kəzzabı uzaqlaşdıraraq atasının meyit namazını özü qılmışdır. Cəfər çox az yaşasa da çoxlu evladları varmış.[77] Bu gözə görünməyən çocuq 12-ci imam “Mehdi”dir.

12-ci imam Mehdi atasının ölümündən dörd il öncə dünyaya gəlmiş və Samirədə bir quyuda qeybə çəkilmişdir. Yalnız “naib”lər və ya “bab”lar onunla irtibat qurmuş. Canını qorumaq üçün kimsəyə görünməmişdir. Osman ibni Səid adında birisi Mehdi ilə təmasda olduğunu iddia edib və şiə əhlindən para toplayırdı. Osman ibni Səid 45 il bu adla şiə əhlindən para topladı. Qeybə çəkilən Mehdi bu paraları harda xərcləyirmiş bəlli deyil. Sanki qeyblərdə də dükan bazar varmış, alış-veriş davam edirmiş! İmam Mehdi ilə irtibatda olan dörd kişidən biri də Məhəmməd Seyməri adında bir fars olmuşdur. Mehdinin qeybi iki mərhələdən ibarət olmuş. 1- Yetmiş il davam edən kiçik qeybət. 2- Böyük qeybət. Kiçik qeybət ərzində dörd kişi ilə ilişkidə olmuş: 1- Osman ibni Səid. 2- Məhəmməd ibni Osman. 3- Hüseyn ibni Ruh. 4-

[77] Dairət-ul maarifi- şiə 5-ci cild, Qamus-ul rical 2-ci cild, Əl-maarif vəl-maarif, 2-ci cild.

Əli ibni Məhəmməd Seyməri.[*] Böyük qeybət bu dörd kişinin ölümündən sonra başlamışdır.[**]

Seyməri öldüyündə bir məktub göstərdi və bu məktubu Mehdinin yazdığını iddia etdi. Bu məktub Şeyx Tusinin "Qeybət" adlı kitabında verilmişdir. Səfəvilər dönəminin şeyxlərindən

---

[*] Səfəvilər dönəmində yasaqlanıb lənətlənməsinə baxmayaraq Mehdinin naiblərinin də adları Osman olmuş!

[**] Səfəvi qaynaqlaqlarında Mehdinin zühuru ilə bağlı bilgilər:

Səfəvi qaynaqlarında "Mehdi"nin zühuru ilə bağlı bilgilər bu şəkildədir: Səfəvi dövləti Mehdinin zühuruna qədər davam edəcək. Mehdi zühur etdiyində bəvasir və cüzam xəstəliyi yayqınlaşacaq. Mehdi zühur etdiyində günəş Doğudan deyil, Batıdan doğacaq. Mehdidən öncə "Süfyani" zühur edəcək. Süfyani Əbusüfyanın soyundan və çox çirkin görünümlü olacaq. Süfyaninin zühurundan amac şiələri qətl etmək olacaq. Məclisi "Mehdiyi-moud" adlı kitabında israrla yazır ki, Mehdidən öncə Süfyani zühur edəcək. Şeyx Tusi "Qeybət" kitabında "Amer ibni Vasilə"dən bir rəvayət nəql edər. Vasilə rəvayət edər ki, Əbutaliboğlu Əli "zühur zamanı günəş Doğudan deyil, Batıdan doğacaq və günəş günortadan axşama qədər hərəkətsiz qalacaq" söyləmiş. Mehdi zühur etdikdən sonra Ayişəni, Əbubəkiri, Öməri, Osmanı dirildəcək. Əhli-beytə zülm etdiklərindən dolayı onları yarqılayıb yenidən atəşdə yaxacaq. Məkkədə İslam düşməni olan bütün sünniləri qətl edəcək və qan su yerinə axacaq. Mehdi 19 illik iqtidarı sürəsincə bütün sünniləri öldürüb dünyanı şiələşdirəcək. Daha sonra saqqallı bir qadın tərəfindən öldürüləcək. Mehdinin cəddi Əlioğlu Hüseyn diriləcək və Mehdini dəfn etdikdən sonra "Müntəsir" (zalimdən intiqam alan) imam kimi 309 il iqtidarda olacaq. Daha sonra Əbutaliboğlu Əli

biri olan Məclisi də bu məktubu “Mehdiyi-moud” kitabında vermişdir. Bu məktubda yazılmış:

Tanrının adı ilə

Ey Əli ibni Məhəmməd Seyməri! Sənin ölümündən sonra Tanrı qardaşlarına səbr versin. Çünkü altı gündən sonra öləcəksən. İşlərini yerbəyer eylə və kimsəni də canişin təyin etmə. Çünkü böyük qeybət başlamışdır. Mən bir də tanrının izni ilə ortaya çıxacağam. Bu da zamanlar keçdikdən və yer üzündə zülm aşıb-daşdıqdan sonra olacaq. Şiələr arasında kimsə məni görüdüyünü iddia edib ortaya çıxacaq. Bilmiş ol ki, süfyaninin ortaya çıxışından və göylərdən fəryad gəlmədən öncə kimsə məni gördüyünü iddia edərsə, yalan söyləmişdir, yalançının biridir. Gerçək güc və iqtidar Tanrıya məxsusdur.[78] Bu dörd kişi imamla irtibat adı altında cahil kütləni istimar edərək bolca sərvət toplamış, ömürlərinin sonlarında da “böyük qeybətin” başladığını söyləmişlər. Mehdi bu dörd kişi ilə irtibat yerinə özü açıqca gəlib bir nitq söyləyərək, əhalinin gözlərinin önündən qeybə çəkliməsi daha yaxşı və inanılır olmazmı idi? Bu iftiralara nə ehtiyac var ki? Nə Quranda, nə Buxarinin və nə də Müslimin hədis kitablarında “mehdi” məsələsi yoxdur. Bunlar İslamdan sonra iftiracıların uydurmalarından

gələcək və “Səffah” (natiq) imam kimi 44 min il iqtidarda olacaq. Sonra da Hz. Məhəmməd gələcək və 50 min il iqtidarda olacaq. Bu zaman bitdikdən sonra Mehdinin yenidən zühuru ilə bu proses sonsuzluğa qədər təkrarlanacaq. (Bax: Məclisi, “Bəhar-ul ənvar”, 13-cü cild, “Mehdiyi-moud”, tərcümə Əli Dəvani, s. 1223).

[78] Məclisi, Bəhar-ul ənvar, 51-ci cild, s. 361.

başqa bir şey deyildir. Ən böyük hadi və hidayət edən Qurani-Kərimdir. İslamda mehdiyə gərək yoxdur ki. Zatən Quran aramızdadır. Ayrıca, "mehdi" sözünü də anlambilim olaraq yanlış açıqlamışlar. "Mehdi" hidayət edən deyil, hidayətə ərmiş deməkdir. Hadi isə hidayət edən deməkdir. Mehdi sözünü də hadi yerinə yanlış olaraq qullanmışlar.

Qeybəti-kübradan (böyük yox oluşdan) sonra 945-ci ildə Əbuşüca´ Buveyh tərəfindən qurulan və imamiyə tərəfdarı olan Büveyhlilərin hakimiyəti ələ keçirməsi, imamiyə şiəsinin gəlişməsinə səbəb oldu. O tarixlərdə imamiyə şiəsi hədis, kəlam və fiqh sahəsində böyük irəliləmə qeyd etdilər. Şiənin ən mötəbər əsərləri bu dönəmdə yazıldı. Səlcuqlu hökmdarı Toğrul bəy 1055-ci ildə Bağdadı alaraq onların iqtidarına son verdi.[79] İslam tarixində heç bir hadisə "imamlıq" qədər haqsız qan tökməmişdir. İslamla heç bir bağlantısı olmayan iki anlayış da şiəyə məxsusdur. Onlardan biri "xums" və digəri "mütə"dir. Xums, yəni hər şiə var-dövlətinin beşdə birini beyt-ül mala,[80] yəni mollaya verməlidir. Mütə, yəni məta və şey. Yəni qadın bir əşyadır və keçici olaraq "siğə" adı ilə qullanıla bilər. Hər iki anlayış mollalıq və ayətullahlıq qurumunun maddi və seksual ehtiyacını gedərmək üçün gəlişdirilmişdir. İslamla ilgisi yoxdur. "Xums" sözü Quranın "İnfal" surəsinin 41-ci ayətində keçər. Ayətdə

[79] İsmail Mutlu "Tarihte ve Günümüzde Caferilik", s. 55.

[80] Ruhullah Xomeyni, İslami hökümət, İslami nehzət yayınları, 1971-ci il, s. 34.

deyilir: ”... Bilmiş olun ki, savaşda əldə edilən qəniymətin xumsu (yəni beşdə biri) Allaha, peyqəmbərə, öz əqrəbalarınıza, yetimlərə, yoxsullara və yolda qalmışlara aiddir. Allah hər şeyə qadirdi.” Şiə-Səfəvi mollası və seyidlər buradakı ”əqrəba” sözünü peyqəmbərin əqrəbası kimi təfsir etmişdir. Seyidlər də özlərini peyqəmbər soyundan hesab etdikləri üçün xalqın qazancının beşdə biri onlara aid olmalı imiş!!! Quranın bu ayəti seyidlərin anlatdığı kimi olsaydı, o zaman dörd xəlifə zamanında Hz.Əli və evladlarına xums ödənməli idi. Yəni yüzillər sonrakı seyid və molla İslamiyəti səhabilərdən daha doğrumu anlamışlar? Və Quranı heç oxumamış olan qızılbaşların seyid və mollanın saxta açıqlamaları əlində necə oyuncaq olduqlarını kitabın axışında görəcəyik.

Bu altyapı ön bilgilərdən sonra Səfəvi tarixinin incələnməsinə keçəlim. Ancaq bir sual soraraq mövzuya keçmək istəyirəm. Türk dövlət gələnəyində daha sonra qurulan dövlətlər öncəki dövlətin mədəniyyətini, kültürünü, inancını tarixdən silməmişdir. Örnəyin Səlcuqlunun içindən Osmanlı doğmuşdur. Əmir Teymur Osmanlını yendikdən sonra onun xalqını inancından dolayı qılıcdan keçirməmişdi. Bayındırlı dövləti Qaraqoyunluları yendikdən sonra onun xalqı və xalqının inancı ilə uğraşmamışdı. Bayındırlı dövləti kimsəni inancından dolayı öldürməmişdi. Yalnız Şah İsmayıl böylə hərəkətdə bulunmuş və Səfəvi dövlətini qurduqdan sonra Təbriz mərkəz olmaq üzərə Bayındırlı dövlətinin bütün mənəvi mirasını yox etmiş, kitablarını yaxmışdır. Sırf

sünni olmaları üzündən Təbrizdə soyqırım törətmişdir. Şah İsmayıl nədən böylə etmişdir? Bu sualın cavabı kitabın içində aranmışdır.

## Şeyx Səfyəddin Ərdəbilli

"Səfəvi" ləqəbi Səfyəddin adından alınmışdır. Səfyəddin 1252-ci ildə Ərdəbilin Kəlxoran kəndində dünyaya gəlmişdir.[81] Atasının Kəlxoranda əkin yerləri olmuşdur. Səfyəddinin adı bu soyda dini aristokrasinin olduğunu göstərməkdədir. Çünkü böylə təmtəraqlı adları, ancaq dini aristokrasidə bulunanlar çocuqlarına verə bilərdilər. Yoxsulların adları ümumən təmiz türkçə adlar olmuşdur.[*] Səfəvilərin soyu haqda

---

[81] Valter Hins "İranda Milli Dövlətin Təşkili" farscaya çevirən Keykavus Cahandari, 2-ci yayım 1361-ci il (hicri-şəmsi).

[*] Günümüzdə də İran mühitində bu şəkildədir. Bizim Limli kəndimizdə heç bir tarlası olmayanlar, onun-bunun qapısında çalışanların adı təmiz türkçə olardı. Ancaq imkanları olanların adı ərəbcə, farsca, dini ailələrin də adı ümumən təmtəraqlı ərəbcə adlar olardı. Örnəyin kəndimizdə kölə olaraq çalışan adamların adları bu şəkildə idi: Tanrıverdi, Dənizxan, Qotazxan, Özxan, Azay, Bayındır, Tovxan, Ayaz, Durna, Balabəyim, Usandıq, Alış, Alı, İmlər, Ataxan, və...

dəyişik görüşlər var. Valter Hins[82], Kəsrəvi[83], Faruq Sümər[84] Səfəvi soyuna türk olaraq görməz, kürd olaraq yazarlar. Zəki Vəlidi Toqan Səfəvi soyunu azəri farsçasında danışan fars olaraq görər.[85] Səfəvilər özlərini 7-ci imam Musa Kazim soyundan bildikləri üçün ərəb olmaları gərəkir. Şeyx Səfi 7-ci imam Musa Kazimin 18-ci soyu idi.[86] Səfəvilər haqqında ilk bilgini verən İbni-Bəzzazın yazdığı "Səfvət-üs səfa" kitabıdır. İbni-Bəzzaz Sədrəddinin müridi olmuşdur. Bu kitabda Səfəvilərin soyu haqqında geniş məlumat vardır. Səfvət-üs səfada Səfəvilərin soyunun kürd olduğu yazılmaqdadır. Səfəvilərin soy kökündə Əl-Kürdi-ul-Səncani adında bir ailə olmuşdur.[87] Tarixi verilərə görə ərəb orduları Azərbaycanda iki hərbi qərargah qurmuşlar. Biri Marağada və ikincisi də Ərdəbildə. O zaman minlərcə ərəb ailələri bu bölgələrdə yerləşdirilmişlər. Azərbaycanda yayqın olan "ərəbli" yer və "ərəbzadə" soy adları da bu ərəb yerləşmələrindən qalma miraslar olmalıdır. Şiələrin ikinci imamı Əlioğlu Həsənin qaynatası

---

[82] Valter Hinsin Səfəvilər haqqında yazdığı kitab İranda "İranda milli dövlətin təşkili" adı ilə fars dilinə tərcümə edilmişdir.

[83] Kəsrəvi, Şeyx Səfi və soyu.

[84] Faruq Sümər, Safevi Devletinin Kurulusu ve Gelismesinde Anadolu Türklerinin Rolü, Ankara 1992, s. 1.

[85] Zeki Velidi Togan, "Azerbaycan", A**,** C. II, İstanbul, 1970, s. 112.

[86] Şərəf Xan Bitlisi "Şərəfnamə" 2-ci cild, s. 132, Əsatir yayınları Tehran 1377 (h.ş).

[87] İbni-Bəzzaz Ərdəbili, Səfvət-üs səfa, Zəryab nəşriyatı, Tehran- 1376 (h. ş), s. 70.

olan Əşə´s İbni- Kendi üçüncü xəlifə Osmanın xilafətinin sonlarında və dördüncü xəlifə Əlinin zamanında Azərbaycanın valisi idi. İbni-Kendi özüylə bir çox ərəb ailələrini Azərbaycana gətirmişdi. Azərbaycanda bu gün özünü "sadat", yəni seyidlər adlandıranlar da bu törəmələrdən olmuşlar.[**] Bir digər anlayışa görə Hüseynin soyundan gələnlərə "seyid" və Həsənin soyundan gələnlərə "şərif" deyilməkdədir. Misirdə Abbasi xilafətindən bəri Həsən soyundan olan bəyaz və Hüseyn soyundan olan yaşıl sarıq taxmışlar. Əbumüslim Xorasaninin Əməviləri devirməsindən sonra Xorasanda və bir çox bölgələrdə ərəblərə qarşı saldırlar başlamış, bir çox bölgələr ərəblərdən təmizlənmişdi. Ancaq Azərbaycanda ərəblərə qarşı bənzər saldırılar olmamışdı. Abbasi xilafətinə qarşı olan ərəblərin Babək ordusunda xilafətə qarşı savaşdıqları da tarix bilgiləri arasındadır. Azərbaycanda yerləşmiş olan ərəblər daha sonrakı dönəmlərdə, özəlliklə də Mərkəzi Asiyadan türk axınlarının gəlməsi ilə türkləşərək dillərini unutmuşlar. Azərbaycan əhalisinin başat

[**] DNA üzərinə yapılan son araşdırma bu iddiaların yanlış və gerçəkdışıolduğunu isbatlamışdır. "Seyid" qonusu bioloji gerçəkliklə əsla aidiyəti yoxdur. Sadəcə kültürəl bir olqudur. Qaynaq üçün baxıla bilər: Bu biolojik araşdırma günümüzdə yayqın olan "seyid"lər anlayışını qəbul etməməkdədir. Artıq seyid deyə, özəlliklə Azəbrycan bölgəsində bir soy yoxdur. Böyük olasılıqla Səfəvilər də bu "seyid" kimliyindən siyasi amaclar üçün yararlanmışlar. Qaynaq:
http://www.bbc.co.uk/persian/science/2011/11/111113_l42_vid_ir_genetic.shtml

(dominant) məzhəbi sünniliyin Şafei məzhəbi olmuşdur. Səfyəddin Şafei sünni məzhəbini dədələrindən miras almışdı. Azərbaycanda isna-əşəri şiə olmamışdı. Ancaq bəzi zeydi şiəsinə mənsub olan topluluqlar olmuşdur. Səfyəddin çocuqluğunda Quran və sünnət öyrəniminə başlar. Şeyx Fərəc Ərdəbilidən dərs alıb onun müridi olur. Təsəvvüfdə "məqamlar" olaraq bilinən yolda irəliləyə bilməsi üçün bir sürəliyinə Savalan dağının ətəklərində etikafa çəkilər. O zaman Azərbaycanda yüksəlmə imkanı qısıtlı olduğundan Səfyəddin Azərbaycanı tərk edib Şiraza gedər. Şirazda Şeyx Abdulla Xəfifin müridi olar. Bu xanigahda Səfyəddin mürid yetişdirmə qurallarını öyrənər. Şirazda olqunlaşma sürəcini bitirdikdən sonra Ərdəbilə geri dönər. Ancaq Ərdəbildə daha təcrübəli şeyxlər olduğundan Səfyəddin özünə mürid cəlb edə bilməz. Bu üzdən də 1269-cu ildə Gîlâna gedər və burda çox ünlü Şeyx Zahid Gîlânidən dərs alar, onun xanigahının öyrəncisi olar.[88] Şeyx Zahid Gîlânini Qazan Xan moğol öz himayəsi altına almış, ona çox yardımlar edirdi. Buna qarşılıq olaraq Gîlâni xalqın moğollara uymalarını təbliğ edirdi. Xalqın üzərində böyük mənəvi etkisi olan xanigah şeyxlərinin bu istəkləri çox təsirli olurdu. Səfyəddin çox qısa bir zaman içində Şeyx Zahid Gîlâninin diqqətini özünə cəlb edərək onun birinci müridi məqamına yüksəldi. Şeyx Zahid Gîlâninin yardımçısı oldu. Şeyx Gîlâni qızını Səfyəddinlə

[88] Valter Hins "İranda Milli Dövlətin Təşkili" farscaya çevirən Keykavus Cahandari, 2-ci yayım 1361-ci il (hicri-şəmsi).

evləndirdi. Bu evlilikdən sonra da Gîlâni vəsiyyət edərək Səfyəddini öz varisi olaraq duyurdu. 1290-cı ildə Şeyx Gîlâni öldükdən sonra Səfyəddin onun bütün yetkilərinə sahib oldu. Böyləcə Səfyəddinin yüksəlişi üçün gərəkən imkan sağlanmış oldu. Gîlâninin müridlərini özünə mürid edərək Ərdəbilə geri dönüb öz xanigahını təsis etdi. Ərdəbildə və çevrəsində özünə tərəfdar toplamağa başladı. Şeyx xanigahda səmazənliklə də məşğul olur və bu yolla dindar olub, ancaq daha şad yaşamaq istəyən gənc adamları xanigaha cəzb edə bilirdi.[89] Səma´nın sözlük anlamı eşitməkdir. Ancaq təsəvvüfdə başqa anlam daşımışdır. Onu bir tür "şad yaşamaq" olaraq mənalandırmaq olar. Bu şad yaşama və qəmlərdən uzaqdurma, **rind**lərə xas idi. Rindlərdən təsəvvüfə keçmişdir.[***] Sufilərdən bir qismi böylə inanırdılar ki, Tanrını sürəkli zikr edərək insan ruhu O´na qovuşa bilər və O´na qovuşmaq da

---

[89] Şeyx Səfyəddinin həyatı haqqında ayrıntılı bilgi bu qaynaqlarda mövcuddur: 1- İbni-Bəzzaz Ərdəbili, "Səfvət-ül Səfa" Qulamrza Təbatəbainin redaktəsi. 2- Əhməd Kəsrəvi, "Şeyx Səfi və soyu" 3- Mənuçehr Parsadust "Birinci Şah İsmayıl", s 115-124. 4. Faruq Sümər, 5. Zəki Vəlidi Toqan.

[***] Özəlliklə ədəbiyatda çox yayqın olmuşdur rindlik. Füzulinin və digər irfan əhlinin şeirlərində rindliyə tanıq olmaq mümkündür. Mövlanada bu zirvəyə çatar. Mövlananın bütün əsərləri ritmikdir, musiqi ilə iç-içədir. Füzuli ünlü qəzəlində qəmlərdən uzaq durmağı və şadlıqlara meylli olmağı bu şəkildə anladar:

"Füzuli **rind**i-şeydadır, həmişə xəlqə rüsvadır
Sorun kim bu, nə sevdadır, bu sevdadan usanmazmı?"

şadlıq gətirər. Bu şadlıq ehtizaz, hərəkətlənmə oluşdurar və insan özündən asılı olmayaraq rəqs etməyə və sevinç çığlıqları atmağa başlar. Bu metodu icad edənlər daha öncə zahidliklə məşğul olan şeyxlər olmuşdular. Onlar gördülər ki, oruc tutmaq, gecələr ayaq qalmaq və əzab çəkmələrlə toplumu etkiləyə bilmirlər. Çəkilib bir yerdə yalnız başına yaşayırlar və xalq da onları unudur. Bu üzdən də toplumu və özəlliklə gəncləri özlərinə cəlb etmək üçün bu metodu gəlişdirdilər. Xanigahlar bir türlü həm də əyləncə məkanına dönüşdü. Bu üzdən şəri´ zahidlikdən vaz keçib “**rindlik**”ə üz tutdular. Rindlik əyləncədən yana olan dindar üçün cazibəli görünürdü. Təsəvvüfdə zaman-zaman rindlik istismar edilmişdir. Çünkü rindlər insana xidmət edərək, bəşərin səviyəsini yüksəltmək istəmişdilər. Ancaq bəzi sufilər insanların bu təmayülünü və rindlərin tarixi təcrübəsini öz siyasi amacları yolunda qullanmışlar. Xanigahlar zamanla dönəmin siyasi iqtidarları ilə anlaşaraq geniş maddi imkana sahib olmuşlar. Buna qarşılıq xanigahlar siyasi iqtidarlara əsgər vermiş və siyasi iqtidarın məşrulaşması yolunda çalışmışlar. Bu üzdən də hər dövlət başçısı və ya dövlət yetkilisi xanigah şeyxlərini yanına çağırmış, onun könlünü ələ almışdır. Çox kəz iqtidarların məşruiyətini bu xanigahlar sağlamışlar. Əski çağlarda siyasi örgütlənmə partilər şəklində olmadığı üçün, xanigahlar həm də günümüz partilərinin rolunu oynamışdır.

**Rind**lər fərdi mutluluğu toplumsal mutluluqda görürdülər. Xalqın mutlu olması yolunda çalışmaqla gerçək mutluluğun əldə

ediləcəyinə inanırdılar. Şad yaşamaq və bütün insanların şadlığı üçün əldən gələni etmək lazımdır. Bu fikir axımının örnəklərini “İxvan-üs Səfa” risalələrində, Füzulinin, Xəyyamın, Hafizin, Mövlananın qəzəllərində görmək mümkündür.* Şəhabəddin Söhrəvərdinin də dünyagörüşündə rindlik var idi. Rindlik əski Orta Doğu və Mesopotamiya kültürlərindən qaynaqlanan bir gəlişmədir. Mövlana, Təbrizli Şəmslə tanış olduqdan sonra tamamən rindlik yoluna girmiş, səmazənlik etmiş, musiqi və şeir söyləmişdi. Yəni sürəkli mutlu olma və mutlu yaşama

---

* Rindlik halını daha yaxşı anlaya bilməmiz üçün Füzulinin bu şeirinə baxlaım:

“Necə bir vəsvəseyi-əql ilə qəmnak olalım,
Gəlin alayişi-qəmdən çıxalım, pak olalım,
Nəş’eyi-mey bulalım, qabili-idrak olalım.
Məstü mədhuşü xərabatiyü bibak olalım.

**Rind**lər bəzminə sərməst səbu tək giribən,
Zövq bağinə girib, cam gülünü dəribən,
Meyə derlərsə bəha əql mətaın, veribən,
Məstü mədhuşü xərabatiyü bibak olalım.

Paybəsti-meyi-safi olalım dürd misal,
Verəlim saqiyə can, eyləyəlim kəsbi-həlal
Nəş’ədən bilməyəlim aləmi-keyfiyyəti-hal,
Məstü mədhuşü xərabatiyü bibak olalım.

Mey hübabı kimi meyxanədə bir ev tutuban,
Iqdi-əngur kimi bir araya baş çatuban,
Alsalar, din ilə dünyayi şərabə satuban,
Məstü mədhuşü xərabatiyü bibak olalım.

Badədən qeyr ki, qəm dəf’inə bir cam yetər,
Nəqdini nisyəyə hər kim verəcək olsa itər,
Ey Füzuli, rəvişi-əhli-riyadən nə bitər?
Məstü mədhuşü xərabatiyü bibak olalım.”

durumu. Ümidsizliyi yaxın buraxmamaq. Mövlana Məsnəvinin dördüncü cildində səmazənliyi, şeiri və musiqini içərən rindliyi bu şəkildə açıqlar:

“Söylər olmuşlar ərənlər ol nəfəs
Göylərin sonsuzluğundandır bu səs
Ol fələklər seyrinindir kim bu saz
Söylər olmuş böylə tənburla boğaz
Biz ki, həp adəm soyundan gəlmişiz
Ilk əzəldən varlığa sərpilmişiz.
Böylədir sazlardakı ol inləyiş,
Anladar bir çox anımla dinləyiş
Şiklə örtmüşsə bizi torpaq və su
Köksümüzdə var əzəllik duyqusu
Ol əzəl gündən olan səslər gəlir
Musiqi şəklində bizdə yüksəlir.”[**]

Mövlana bu misralarda anladır ki, musiqi və şeir insana təbiətdə olan böyük düzəni xatırladır. İnsanda əzəli həzz və zövq duyqusu oyadır. O həzz ki, yalnız uçmaqda (cənnətdə) Adəmə və Həvvayə verilmişdi. O həzzi bizim bilincaltımızda oyadan musiqi və şeirdir. Böylə bir həzzə varmış olan insan kəndisinə sığmaz olur və rəqs etməyə başlar. Bu rəqslə də bütün doğa ilə birləşmə duyqusu içinə girər, çünkü təbiətdə də hər şey rəqs etməkdədir.[***] Səma

---

[**] Tərcümə: Güntay. Başqurd Türkçəsində “**şik**” şübhə deməkdir.

[***] Bu düşüncəni Hüseyn Cavid də bu şəkildə açıqlamışdır:
“Hətta şu üfüqlərdə sönən qanlı günəş də
Həp rəqs edərək qeyb oluyor, seyr edin, iştə!..
Həp rəqs ediyor qanlı günəş,qanlı üfüqlər,
Həp rəqs ediyor halə qəmər, pənbə şəfəqlər.
Rəqs etmədə həp şerü dəha, hüsnü lətafət.

´nın nə zamandan irfana daxil olduğu bəlli deyil. Daha öncədən dağınıq və sistemsiz şəkildə mövcud olan səma´, Şəmsi-Təbriz tərəfindən sistematizə edilmişdir. “Eşq tsəvvüfü ümidsizliklərlə, qorxularla savaşmalıdır. Bu üzdən də kollektiv sevincə və şadlığa ehtiyacı var. Eşq təsəvvüfündə səma´ bir zərurətdir. Səma´ insanın həyəcanını söndürən hər tür uyuşdurucuya qarşıdır.”[90] Ancaq səma´nın dəyişik amaclar üçün qullanıldığı da olmuşdur. “Həllac”, “Bayəzid” irfanına yaxınlaşmaq üçün qullanılan səma´nın ruhani anlamı olmuşdur. Xanigaha imkanlar və iqtidar sağlamaq amacı ilə gəncləri cəlb etmək üçün də səma´ qullanılmışdır. Bu yolla gənc müridlərin sayı gün keçdikçə artırdı. Səma´ məclisi bəzən o qədər etkili olmuş ki, sadə insanları da özünə cəzb edib ağlını başından ala bilirmiş. Bunu Mövlana Məsnəvisində bir hekayə ilə böylə anladar: Bir müsafir eşşəyi ilə bir yerdə bir xanigaha gələr və eşşəyini aparıb axırda bağlayıb bəkçi adama tapşıraraq xanigaha girər. Bir azdan xanigaha toplaşan ac sufilər başlarlar çalıb oynamağa. Bu arada sufilərdən bir neçəsi gedib eşşəyi kəsib pişirib gətərib ətini yeyə-yeyə dəf çalıb, rəqs edib şeir oxuyub oynarlar. Sufilər görürlər ki, eşşək sahibi özü də həyəcanlanıb bunlara qatılıb

---

Rəqs etmədə yıldızlı fəza, ruhi-təbiət.
Hər fəlsəfə, hər dinü təriqət, bütün adət
Rəqs etmədə həp olsa xəyal, olsa həqiqət.
Həp rəqs ediyor hüznü sürur, eşqü fəlakət,
Həp rəqs ediyor xeyirlə şər, elmü cəhalət...
Rəqs etmədə, hətta, o görünməz ulu məbud,
Rəqs etmədə, hətta o vücudi-ədəmalud.”

[90] Nasirəddin Sahibəzzəmani “Üçüncü xətt”, s. 327.

oynamağa başladı. Toplu şəkildə dans edib oxuyurlar ki:
“Getdi eşşək, getdi eşşək getdi də
Getdi eşşək, getdi eşşək getdi də”*
Eşşək sahibi də bunlara qatılıb “getdi eşşək, getdi eşşək getdi də” söyləyib rəqs edir. Xanigahın törəni bitər və hər kəs çəkib gedər evinə. Müsafir də eşşəyini açıb minib getmək üçün tövləyə gedər. Eşşəyini bağladığı yerdə görməz. Tapşırdığı bəkçiyə söylər ki, mənim eşşəyim hanı?
Bəkçi deyir: “Eşşək getdi”
Adam deyir: Hara getdi eşşək, eşşəyim hardadır?
Bəkçi deyir: eşşəyi kəsib yeyib və dans etdiniz. Yediyiniz ət sənin eşşəyinin əti idi.
Müsafir öfkələnib bəkçiyə deyir: Mənə niyə xəbər vermədin?
Bəkçi deyir: Mən neçə dəfə gəldim sənə xəbər verməyə, ancaq sən öyləsinə ürəkdən “getdi eşşək, getdi eşşək getdi də” şərqisini söyləyib rəqs edirdin ki, mən sənin bildiyini sandım. Sən qoymadın ağzımı açıb “Eşşəyi kəsdilər” söyləyim. Ağzımı açmaq istərkən sən “getdi eşşək, getdi eşşək, getdi də” deyib dans etdin.
Sonra Mövlana kor təqlidin nə qədər zərərli olduğunu anladar. Adam onları təqlid edərək “getdi eşşək” söyləmiş. Gedən eşşəyin öz eşşəyi olduğunu bilməmiş.

---

* Xər berəfo xər berəft ağaz kərd
Zin hərarət comle ra ənbaz kərd.
خر برفت و خر برفت آغاز کرد
زین حرارت جمله را انباز کرد

Səfyəddin zamanı xanigahların yayqınlaşdığı dönəm olmuşdur. Moğolların da dəstəyini alan bir çox xanigah Orta Doğuda aktivləşmişdi. Moğolların müsəlmanlaşma sürəcində xanigahların rolu olduğundan moğol dövlətinin dəstəyini almış olurdular. Çingiz Xan dönəmindən başlayaraq moğollar fəth etdikləri hər yerdə din öndərlərinə, xanigah şeyxlərinə xoşgörü ilə yanaşırdılar. Orta Doğu, yalnız moğollar zamanında din və məzhəb azadlığına qovuşmuşdu. Moğolların bütün dinlərə eşit məsafədə durmaları dini özgürlük ortamı oluşdurmuşdu. Bu dini özgürlüyü özəlliklə Səfəvilər dönəmində insanlar çox arzu edəcəkdilər. Daha öncəki dönəmlərdə dünyagörüşü qəbul edilməyən xanigahların şeyxlərinin dərisini soyur, qətl edirdilər. Moğol mədəniyəti bölgəyə dünyəvi yasalar gətirmiş və bölgə xalqları azad nəfəs ala bilmişdi. Özəlliklə moğollar Bağdad xilafətini devirdikdən sonra yüzillər boyunca davam edən xilafət əsarətindən bölgə millətləri azad edilmişdi. Moğol dönəmində dəyişik xanigahların azad şəkildə fəaliyət göstərmələrinin səbəbi moğolların dünyəvi yasaları idi. Moğol yasaları kimin nəyə inandığı ilə ilgilənmirdi. Hətta xanigahların fəal olması moğol dövlətinin yararına idi. Çünkü xanigah şeyxlərini əldə edərək iqtidarlarını möhkəmləndirə bilirdilər. Bu dönəm xanigah şeyxləri ümumən “cəbriyyə” inancına görə davranırdılar. Cəbriyyə Əməvilər dönəmində ortaya çıxmış məzhəbi bir axım olmuşdu. Onlara görə gerçəkləşən hər əməl Tanrının iradəsi ilə olmaqdadır və insanın heç bir iradəsi yoxdur.

Kim yaxşı, ya da pis davranırsa, bunu özü etməməkdədir, bu, Tanrı iradəsinin təcəllisidir. İnsanın əməllərinin yaxşı, ya da pis olması haqda kimsənin qərar vermə haqqı yoxdur. Bu inanışa görə zalimləri zülmündən dolayı tənqid etmək də yanlış idi. Tanrı qulunun görəvi ortaya çıxan duruma təslim olmaqdır. Çünkü Tanrı istəməsəydi kötü şeylər də olmazdı. Tanrı istədiyi üçün olmuşdur. Xanigah şeyxlərinin yaydığı bu ideoloji moğol dövlətinin yararına idi. Çünkü bölgəyə gələn bir millət olaraq onların bütün yapdıqları xanigah şeyxləri tərəfindən Tanrı iradəsinin göstərgəsi kimi anladılırdı. Çingiz Xan da imperatorluğunu qurduğunda özünü Göy Tanrının yer üzündəki qılıcı kimi sanmışdı. Cəbriyyə bütün əzab və acıları Tanrı qatından gələn mərhəmətlər olaraq görür və bütün bunların hamısını Tanrının sınavları kimi anlayırdı. Baba Tahir Üryan bu inanışı bir şeirində bu şəkildə anlatmışdı:

“Biri dərdi, bir dərman sevər də
Biri vəsli, biri hicran sevər də
Mənim könlüm bu istəklər içində
Onu istər ki, həp canan sevər də”*

Yəni insan bu inanışa görə özü bir şey istəməməli, O´nun istəklərinə təslim olmalı və onun istəklərini sevməlidir. Onun istədikləri, başa gətirdikləri yaxşı da olsa, pis də olsa qəbul edilməli və dəyişdirilməsinə çalışılmamalıdır. Bu inancda bəzi şeyxlər o qədər irəli getmişdilər ki, deyirdilər: Bir gəmi dənizdə batır və içindəkilər boğulursa, onlara yardım etməmək gərəkir.

* Türkçəyə çevirəni: G.G

Çünkü bu, Tanrının iradəsidir. Tanrının iradəsinə qarışmaq küfrdür. Onlara görə şahlıq Tanrının kiməsə bağışladığı lütfdür və bir şah dinə qarşı çıxmadığı sürəcə ona təslim olmaq lazımdır, çünkü bu neməti ona Tanrı vermişdir. Ona itaət etmək, dolayısıyla Tanrıya itaət etməkdir. Xanigahlara hakim olan cəbriyyə görüşü mövcud moğol siyasətini tamamən qəbul edir və onlara təslim olurdu.[**] Bu inanc moğol iqtidarını məşrulaşdırdığı üçün istər-istəməz moğol dövlətinin də təqdirini və mali təşviqini görürdü. Bölgədə sadəcə əsgəri güc olaraq bulunan və sayıları da çox olmayan moğollar üçün bu görüş çox əlverişli idi. Bu üzdən moğol dövləti tanınmış xanigah şeyxlərini gərəkən düzeydə ödülləndirdi. Onlara geniş torpaq sahələri tarlalar bağışlayır, taladıqları zənginliklərdən xanigahlara da pay göndərirdilər. Bu da xanigah şeyxlərinin öz müridləri üzərinə iqtidarlarını möhkəmləndirirdi. Moğollar bölgəyə böyük mədəniyət və dialoq kültürü gətirmişdilər. Moğollara görə hiç bir din digərinə üstün deyldi. Bütün dinlər ya bir-biri ilə dialoqa girməli, ya da moğol qılıcı ilə cəzalanmalıydılar. Dinlər arası barış, anlaşma və dialoq ilk kəz olaraq moğol yasaları tərəfindən tarixdə uyqulandı. Moğolların insan ağlının ürünü olan yasalarla dövləti idarə etməsi daha sonralar Qərb mədəniyətinin cövhərini təşkil edəcəkdi. Dindən asılı olmayan yasalar tarixdə ilk dəfə olaraq moğol dövləti tərəfindən

[**] Mövlana Cəlaləddin Rumini moğollarla işbirliyi yapmaqla suçlayanlar bu dini görüşdən xəbərsiz olmalıdırlar.

uyqulanmışdı. Daha öncə bir-birinin salamını almayan şiə-sünni alimlər zorla bir yerdə çalışdırıldı. Aşırı ismaili şiəsi olan Nəsrəddin Tusi ilə sünni musiqi alimi olan Səfyəddin Urməvi Marağanın rəsədxanasında bir yerdə çalışırdı.

Bəzi araşdırmacı tarixçilər moğolların bölgəyə sadəcə savaş bəlaları gətirmədiklərini savunarlar. Onlara görə bölgə mədəniyətinin yüksəlişində moğolların böyük rolu olmuşdur. Bu mədəni yüksəlişi bu şəkildə özətləmək olar:

- Bir yönətim çatısı altında bütün mədəniyətləri birləşdirdilər. Çin, Hind, Ağdəniz, Xristian, şamançılıq, buddizm, İslam mədəniyətlərini bir-birinə qarışdırdılar. Bütün mədəniyətləri moğol yasalarının çatısı altında bir yerdə barış içində yaşamağa məhkum etdilər.
- Moğollardan öncə ticarət yollarında güvənlik yox idi. Tacirlər özlərini güvəndə hiss etməzdilər. O üzdən də ipək yolunun ticarət imkanları azalmışdı. Moğollar kürəsəlləşmənin əsası olan ticarətin güvənliyini geniş imperatorluq ərazilərində sağlayan ilk cahanşümul dövlət olmuşdur. Moğol imperatorluğu dönəmində ticarət kəsin güvənlik imkanlarından bərxurdar olduğundan tacirlər moğol dövlətini dəstəklər olmuşdular.
- Asiya və Avropa arasında güvənli siyasi ilişkilər bərqərar olmuşdu. Səfirliklərin güvənli fəaliyəti siyasi ilişkiləri dərinləşdirmişdi.
- Çin, müsəlman, xristian, hind və digər inancların və millətlərin bilim adamları

moğolların elmi mərkəzlərində bir yerdə çalışmağı təcrübə etdilər. Başqa inanclara mənsub alimlər də bu elmi mərkəzlərdə çalışırdılar. Bunun hesabına Uzaq Doğudan Uyqur minyatür sənəti Orta Doğuya axışdı.[91]

Ərdəbildəki Səfyəddin xanigahı bu dönəmdə ən çox gəliri olan xanigah idi. "Came-ut təvarix" kitabının yazarı Rəşidəddin Fəzlullah Həmədani bu zaman yeni müsəlman olmuş Qazan Xan Moğolun başbaxanıdır. Həm Rəşidəddin, həm də Qazan Xan özü Səfyəddin xanigahına iltifatlarda bulunurdular. Rəşidəddin Fəzlullah moğol sarayına gəlmədən öncə Həmədanda təbiblik etməkdə idi. Təbabətin dışında dini bilimlərlə də uğraşmaqda idi. Əski bir yəhudi olduğundan tövratın tərcüməsini də etmişdi. Daha sonra yəhudi qalmaqla suçlanaraq öldürüləcəkdi.[92] Qazan Xanın özəl həkimi olaraq çalışdı daha sonra da güclü moğol xanının başbaxanı oldu. Qazan Xanın dönəmində dövlətin ikinci şəxsi olan Rəşidəddin Qazan Xanın ölümündən sonra onun tutruğu (vəsiyəti) üzərinə iqtidara gələn qardaşı Ulcayto dönəmində də öz görəvini sürdürmüşdü. Dövlətdəki görəvi icabı islamiyəti qəbul edən əski yəhudi inanclı Rəşidəddinin dörd oğlu var idi. Hər dörd oğlunu dövlətin önəmli məqamlarına yerləşdirmişdi. Başbaxan ölkəni yaxşı idarə edə bilməsi üçün xanigah şeyxlərinə bol hədiyələr göndərirdi. Ölkədə sabitlik

[91] Nasirəddin Sahibəzzəmani "Üçüncü xətt", s. 327.
[92] Petruşevski "İranda İslam" farscaya çevirən Kərim Kəşavərz, s. 98.

bərqərar etdikçə Xanlarının güvənini qazanmış olurdu. Başbaxan İslamı qəbul etdikdən sonra bir çox müsəlman ünlü adamları yanına çəkmək istədi. Şeyx Səfyəddinə yaxınlaşdı. Dini günlərdə şeyxin xanigahını ziyarətə uğrayır və bolca hədiyələr aparırdı. “Mükatibati-Rəşidi”də mövcud olan bir bəlgəyə görə başbaxan ramazan bayramında Şeyx Səfyəddini ziyarətə uğrarkən bu malları “böyük şeyx”ə sunmuşdu:
Buğda—15000kg, düyü— 30, 000kg, kərə yağ—1600kg, bal—3200kg, pendir—800kg, doşab—400kg, qoyun—130 baş, qaz—190 ədəd, ördək—600 ədəd, gülab—30 qab, para— 10 min dinar (təxminən 75kg altun dəyəri).[93]

Şeyx Səfi moğol dövlətinin bu şəkildə diqqəti sayəsində 35 il Ərdəbil dərgahına şeyxlik etdi. Əmrinə tabe olacaq minlərcə müridi var idi. Müridləri ilə bir yerdə moğol dövlətinə dualar edirdilər. Moğol xanlarına uymağı təbliğ edirdilər.

1325-ci ildə Səfyəddin öldü. Səfyəddinin tutruğu (vəsiyyəti)* üzərinə oğlu Sədrəddin Ərdəbil xanigahının başına keçdi. Şeyx Sədrəddinin böyük xəyalları var idi. Ərdəbil xanigahını Orta Doğunun ən böyük xanigahına dönüşdürmək üçün atasının məzarı üzərinə böyük bir günbəd yapdırdı. Bu günbədin

---

[93] Petruşevski “İranda İslam” farscaya çevirən Kərim Kəşavərz, s. 385, Rəşidəddin Fəzlullah Həmədani, Mükatibati-Rəşidi, redaktə Məhəmməd Şəfii, Lahur yayını, 1364-hicri-qəməri. رشیدالدین فضل الله همدانی، مکاتبات رشیدی، تصحیح محمد شفیع، چاپ لاهور 1364 هجری قمری

* Kaşqarlıda “tutruq” vəsiyyət anlamındadır.

yapılması illərcə sürdü. O zaman böylə bir görüş var idi ki, şeyxin günbədi nə qədər möhtəşəm olursa, ona diqqət edənlərin sayı da bir o qədər çoxalar və nəzrlərin, gəlirlərin də həcmi artar. Bu, Səlcuq dönəmində yayqın olan bir kültür olmuşdu. Bu üzdən də günümüzə qədər Səlcuqlardan bir çox məzar günbədləri miras qalmışdır. Məzarların üstünü siramik sənətlə bəzəyirmişlər. Ərdəbil xanigahı Elxanlılar dönəmindən başlayaraq şahların, xanların diqqətini cəlb etmişdi. Sədrəddinin ölümündən sonra oğlu Şeyx Əli dərgahın şeyxliyinə yüksəldi. Şeyx Əli, Əmir Teymurun iqtidarı üçün dualar edir, ödüllər alırdı. 1402-ci ildə Əmir Teymur Osmanlı sultanını yenib aldığı əsirlərlə geri dönərkən Ərdəbilə uğradı. Walter Hinsin verdiyi qaynağa görə Əmir Teymur 30 min Osmanlı əsirini Şeyx Əliyə bağışlamış. Səfəviliyin siyasətə meyllənməsi üçün bu 30 min əsir yeni imkanlar oluşduracaqdı. Bunlar həm də Osmanlıda əsgəri eyitim almış əsirlər idi. 1428-ci ildə Əli öldü və oğlu İbrahim onun yerinə keçdi. Bu zaman Azərbaycan Qaraqoyunluların kontrolundadır. Qaraqoyunlu dövlətinin başçısı Qara İskəndər də Ərdəbil xanigahına yardımlar edirdi. 1448-ci ildə İbrahim öldü. Ərdəbil xanigahının şeyxliyi uğrunda varislər arasında ixtilaf başladı. Bir tərəfdən İbrahimin qardaşı Cəfər varislik iddiasında idi, digər tərəfdən İbrahimin oğlu Cüneyd özünü atasının varisi sayırdı. Əmi və qardaşoğlu arasındakı savaş xanigahın gəlirini paylaşmaq üçün idi. Bu zaman başkəndi Təbriz olan Cahan Şah Azərbaycanın padşahıdır. “Şeyx İbrahimdən sonra

Qaraqoyunlu Cahan Şahın dəstəyi ilə Şeyx Cəfər, Cüneydi Ərdəbildən uzaqlaşmağa zorladı. Azərbaycanda fəaliyyətləri üçün imkan olmadığından və Qaraqoyunlu dövləti tərəfindən sıxışdırıldığından onu dəstəkləyən bir qrup müridləri ilə bir yerdə Anadoluya qaçdılar.”[94] Cüneydin Anadoluya getməsi Səfəviyə təriqətində böyük dəyişikliyə yol açacaqdı. Bu səfər sonucunda qızılbaşlıq təşkilatının təməl daşları qoyulacaqdı.

## Anadoluda durum

Cüneyd Anadoluya vardığında orada türkmən təriqətin yanlıları (tərəfdarları) ilə

[94] Ankara Hüseyin Gazi Derneği, İsmail Kaygusuz “Aleviliğin kızılbaş siyasi hareketi ve Şah İsmail”, YOL dergisi, sayı 19 Ankara.

qarşılaşdı. Pirpərəst bu təriqət şiə məzhəbinə yaxın idi. Cüneyd qısa bir zamanda bu təriqət tərəfdarlarının çox imkanlarının olduğuna tanıq oldu. Özəlliklə bu təriqət şeyxlərinin həm maddi imkanları var idi, həm xalq üzərində mənəvi və əxlaqi otoritələri mövcud idi. Anadolu bozqırlarında türkmənlərin bu tür inanışları Cüneydin siyasi amacları üçün uyqun imkanlar ortaya çıxarırdı. Bu nədənlə Cüneyd babalarının məzhəbinin tərsinə olaraq yanında bulundurduğu müridləri ilə Anadoludakı türkmənlərin şiə əyilimli təriqətlərinə uyqun bir firqə təşkil etmək qərarına gəldi. Cüneydin məzhəb dəyişdirməsi Anadolu bozqırları türkmənlərinin diqqətini cəlb etdi və qısa bir zamanda Cüneydin ünü Anadolu türkmənləri arasında yayqınlaşmağa başladı.

Qərbi Anadolu 11-ci əsrə qədər Bizans dövlətinin kontrolunda xristian torpaqları olmuşdu. Alparslan 1071-ci ildə Malazgird savaşında Bizansı yenimiş və Bizans imperatoru Romen Dyojen´i də əsir almışdı. Ancaq bəlli şərtlər altında Bizans imperatorunu sərbəst buraxmışdı. Bu dönəmdə Anadolunun böyük bir bölümü o cümlədən Konya Səlcuqluların idarəsinə keçmişdi. Anadolunun Səlcuqlar tərəfindən fəthindən sonra Oğuz-Türk axınları davam etməyə başlamışdı. Türklərin nüfusu artdıqca Anadoluda irəliləmələrinə davam edirdilər. Türk nüfus artışı və genişləyən ərazilər üzündən Konya mərkəzli “Anadolu Səlcuqluları” dövləti təsis edildi.

1241-ci ildə Moğolların Anadoluya saldırısı Anadolu Səlcuqlu dövlətinin düzənini dağıtdı.

Səlcuqlu dövlətinin yerini dolduracaq bir dövlət də qurulamaz oldu. Anadoluda kiçik bəyliklərin qurulması bu dönəmə rastlanar. Qaraman oğullarının bu dönəmdə ortaya çıxdıqlarına tanıq olmaqdayıq. Qaraman oğulları sırf türk kimliyi və mədəniyəti üzərinə qurulmuş bəylikdir. Qaraman oğulları bölgənin adını da Qaraman olaraq bəlirlədilər. Konyanı başkənd seçdiklərindən özlərini həm də Səlcuqlu varisi olaraq görürdülər. Türk nüfusunun artışı ilə bir yerdə Anadoluda təsəvvüf cərəyanları da artmağa başlamışdı. Tam bu sırada Məhəmməd Qaraman dərgahların və xanigahların dilinin türkçə olması ilə bağlı qərar çıxarmışdı. Anadoluda çox tanınmış olan təriqət pirlərindən biri Hacı Bəktaş Vəli idi. Hacı Bəktaş köçəri türk tayfaları yanında böyük sayqı qazanmışdı. Hacı Bəktaş təriqətində pirin əmrlərinə mütləq şəkildə uymaq ilkələrdən biri idi. Bəktaşa inananlar ona olağanüstü özəlliklər taxmışdılar. Onun xəstələri sağlatma kimi metafizik imkanlarına və peyqəmbərlərlə ilişkiyə girdiyinə inanılırdı. Tanrı qatından ona bəzi kəramətlər verildiyinə inanmışdılar. Hacı Bəktaşın silahlı dəstələri yeri gəldiyində xristian kəndlərinə saldırıb “cihad” adı altında onların mallarını yağmalayırdılar. Çünkü ələvi pirlər türklərin Mərkəzi Asiyadan sırf bu amac üçün kafirlər diyarına gəldiklərini bilirdilər. Bu saldırılar xristianların bölgəni boşaltmalarına səbəb olduğundan geniş torpaqlar yeni gələn sakinlərə buraxılırdı. Yağma və cihad qonularını bu baxımdan Hacı Bəktaş yaxşı birləşdirə bilmiş və türk axınları üçün yeni iqtisadi üfüqlər

müjdələyirdi. Bu üzdən də Bəktaşilik Anadoluda ən güclü təriqət halına gəlmişdi. Hacı Bəktaşın müridləri Anadlunun dəyişik yerlərinə yerləşərək bu təriqətin yayqınlaşması yolunda çalışırdılar. Faruq Sümər "Oğuzlar" kitabında 13-cü əsrdə Anadolu oğuzlarının türklüyü təmsil etdiyini yazar: "Oğuzlar moğol istilasından sonra qövmi varlığını, tarixi xatirələrini və mədəniyətini qorumaq surətiylə türk Dünyasını təmsil edən tək qövm olaraq mövcud olmuşdur. Uyqur, Qıpçaq Moğol istilasına uğrayaraq varlıqlarını davam etdirə bilməmişlər. Moğollarla qaynayıb qarışan yeni qövmlər meydana gətirmişlər. Bu yeni qövmlərin dili türk dili olsa da, tarixi xatirələri, əsgəri təşkilat və ənənələri moğol özəlliyi daşıyırdı... Osmanlı xanidanı Mərkəzi Asiyadan moğolların istilasından qaçaraq Anadoluya sığınanlar olmuşlar."[95] Osmanlı dövlətinin quruluşu da bu ortamda ortaya çıxmışdı. Ərtoğrul oğlu Ataman (Osman) bəy 1299-cu ildə Anadolu Səlcuqlu Dövlətinin ucbəyi olmaqdan çıxıb bağımsızlığını duyurmuşdu. Moğol istilasından qaçan türkmənlərin, bəyliyinə sığınması ilə siyasi və əsgəri gücü artmışdı.[96] Osman Bəyin oğlu Orxan bəy Bursanı 1326-cı ildə ələ keçirərək Osmanlının genişləmə sürəci başlar. Anadoluda dağınıq şəkildə yaşayan türklər Orxan bəyin təşkilatçılığı ilə bir çatı altında birləşərək Balkanlara doğru yayılmağa başlarlar. Qısa sürə sonra Ankara və Kütahiyə

---

[95] Faruq Sümər, "Oğuzlar" Yazıçı nəşriyatı Bakı-1992.

[96] Hamer Purgstall "Osmanlı imperatorluğunun tarixi" birinci cild, farscaya çevirən Miza Zəki Əliabadi.

Osmanlı torpaqlarına qatılar. Anadolu bəylikləri də Osmanlı dövlətinə tabe olmaq zorunda buraxılar. Osmanlıların fəthləri bu şəkildə davam edərkən Əmir Teymurun Anadoluya saldırısı ilə bu fəthlər duraxsar.

Böyük imperatorluq qurmuş olan Əmir Teymur Şərqi Anadolunu Ağqoyunlulara verib, geri qalan Anadolu torpaqlarını Osmanlıya buraxıb Türküstana geri dönmüşdü.[97] Ağqoyunlular oğuzların Bayındır soyundan idi. Bundan dolayı Bayındır Xan oğulları və ya Bayındıriyyə olaraq da anılmışlar, ayrıca onlara Tur Əlilər də deyilmişdir.[98] Bayındırın, daima nemətlə dolu olan yer anlamına gəldiyi də yazılmışdır.[99] Əmir Teymurun Ildırım Bayəzidi yenib əsir yaxalaması ilə Anadoludakı türk siyasi birliyi pozulmuş və bəyliklər dönəmi yenidən baş qaldırmışdı. Ancaq Məhəmməd Çələbi yenidən Osmanlı dövlətinin birliyini sağlaya bilmişdi. Bəktaşi şeyxləri bu arada müridləri ilə bir yerdə Osmanlının cihadçı ordusuna qatqıda bulunurdular. Hər şeyx öz müridlərindən oluşan ordunun başında durmaqda idi. Əldə edilən yeni torpaqlarda yağmalardan şeyxlər də öz paylarını alırdı. Bu uzun sürən savaşların sonucu olaraq Anadolu yerli əhalidən boşalaraq türk ölkəsinə dönüşürdü. Ələ keçirilmiş torpaqlarda xristian

---

[97] "Mənəm Teymuri-cahangüşa" farscaya tərcümə edən Zəbiullah Mənsuri.

[98] Ebu Bekr-i Tihranî, Kitâb-ı Diyârbekriyye, sayfa 14–15.

[99] Salim Cöhçe, *Otlukbeli Savaşına Kadar Akkoyunlular*, Anadolu Birliğinin Sağlanmasında Otlukbeli.

çocuqları ailələrindən alıb devşirərək müsəlmanlaşdırırdılar. Bu devşirmə çocuqlardan yeniçəri adlanan bir ordu yaradılmışdı.

Musa Çələbi Ədirnədə səltənətə gəldiyində Bədrəddin adında bəktaşi bir şeyx onun ordusunda qazi əsgər idi. Bədrəddinin atasının atası Osmanlının fətih savaşlarında ölmüşdü. Bədrəddin indi Yunanistan torpaqlarında bulunan Simavna qəsəbəsində dünyaya gəlmişdi. Kəsin doğum tarixi bilinməməkdədir. Bəzi qaynaqlarda 1358, 1359 və ya 1365 olaraq verilər. Simavna yarqıcı olar. Anası Rum kökənli bir xristian olmuş. Ədirnənin Osmanlılar tərəfindən alınmasından sonra ailəsi ilə buraya yerləşər. Bədrəddin eyitiminə Ədirnədə babasının yanında başlar. Öyrətməni Molla Yusifdən fiqh dərsi alar. Öyrətməni ölüncə Bursaya gedər, astronomi və riyaziyat elmlərində irəlilər. Bursa yarqıcı Şeyx Mahmuddan dərs alar. Daha sonra dönəmin İslam Dünyasının bilim mərkəzi olan Qahirəyə gedər. Burada Məmluk sultanı Bərququn dostu və danışmanı olan dönəmin ünlü alimlərindən Əkmələddin əl-Bayburtinin öyrəncisi olar. Sultan Bərquq Bədrəddini oğlu Fərəcin özəl öyrətməni olaraq təyin edər. Sultan Bərququn sarayında keçirdiyi üç illik zaman içində Hüseyn Ahlati ilə tanış olar, onun düşüncələrindən etkilənər. Bərquq, Bədrəddin və Ahlatiyə birər Həbəş kənizi verər. Bədrəddinlə evlənən kənizin adı Cazibə. Digər kəniz Mariya da Ahlatinin öyrətisini özümsər. Bədrəddin, Mariya ilə yapdığı qonuşmalardan çox etkilənmişdi. Ahlati Bədrəddinin təsəvvüf yolunda yol göstəricisi

olar. Hüseyn Ahlati bir sürə sonra Bədrəddini Təbrizə yollar. Burada Anadolu səfərindən dönən Əmir Teymurla qarşılaşan Bədrəddin, elmi ilə Əmir Teymuru etkilər. Teymur özüylə bərabər Bədrəddini başkəndinə aparmaq istər. Bədrəddin bunu qəbul etməyərək Qahirəyə dönər. Ahlati ölmədən öncə Bədrddini öz xəlifəsi olaraq duyurar. Ancaq müridlərdən bəziləri buna təpki göstərər. Bədrəddin altı ay sonra Misiri tərk edər. Şeyx Bədrəddin öncə Hələbə sonra Qaraman və Germiyan Bəyliklərinin torpaqlarına gedər. Getdiyi yerlərdə tanınmaqdadır. Bursaya yolçuluğu sırasında Sürmə köyündə digər önəmli müridi Torlaq Kamal ilə tanış olar. Qahirədən Ədirnə'yə qədər getdiyi hər yerdə müridlər toplar. Yeddi il Ədirnədə qalar. Şeyx Bədrəddin, Musa Çələbinin qazi əsgərlik təklifini qəbul edər. İki il Ədirnədə qazi əsgərlik edər və geniş çevrə qurar. Ortaya çıxan bir olay üzündən ailəsi ilə bir yerdə İznikə sürgün edilər. Sürgün olduğu sırada əski müridləri Börklücə Mustafa və Torlaq Kamal ayrı-ayrı yerlərdə (Aydın və Manisa) Məhəmməd Çələbiyə qarşı qiyam edərlər. Şeyx Bədrddin üç ayrı yerdə müridləri ilə birlikdə qiyam etmişdir. Börklücə Mustafa Qaraburunda Bayəzid Paşayla savaşarkən öldürülər və üsyan basdırılar. Torlaq Kamal da Manisa'da yaxalanar və asılaraq edam edilər. Üsyanların başındakı adam olaraq görülən Şeyx Bədrəddin ələ keçirilərək 1420-ci ildə edam edilər.[100] Bədrəddin Ayrıca, İskəndərunda aşırı şiə qüllatı olan “əhli-həq” içindədə yaşamış, onlardan etkilənmişdi. Əhli-

[100] Michel Baliyev “Şeyh Bedreddin Tasavvuf ve İsyanı” Tarih Vakfı Yayınları, 2000.

həq Əbutalib oğlu Əlinin ölməz ruh olduğuna inanırdı. Bədrəddinin Təbrizə səfərindən amacı Təbriz və özəlliklə Qəzvin xanigahlarından mürid yetişdirmə sirlərini öyrənmək olmuşdu.[101] Bədrəddin Bəktaşi inancına yeniliklər əkləmişdi. "Varidat"[102] adlı əsərində fikirlərini açıqlayan Bədrəddin İbni-Ərəbinin "vəhdəti-vücud", xristianların "İsapərəstlik", əhli-həqqin "Əliseverlik" və türkmənlərin "pirpərəstlik" görüşlərini bütünləşdirmişdi. Bədrəddinin Hurufilərdən də etkiləndiyi olmuşdur. Kabala* yöntəmi ilə Quranı hərflər və rəqəmlərə dayanaraq açıqlayan Fəzlullah Nəiminin öyrətiləri bəktaşilər içində yayqınlaşmışdı. Hürufilər kainatın üç mərhələsi olduğunu qəbul edirdilər: 1- Peyəqmbərlik dönəmi. 2- İmamlıq dönəmi. 3- Allahlıq dönəmi.[103] Adəm ilə başlayıb İslam peyqəmbəri Hz. Məhəmmədlə sona ərən dönəm peyqəmbərlik dönəmi olmuşdur. 2- Əbutalib oğlu Əli ilə başlayıb 11-ci imam Həsən Əsgəri ilə sona ərən dönəm imamlıq dönəmi olmuşdur. Bütün peyqəmbərlər Fəzlullah Nəiminin gələcəyini öncədən xəbər verdikləri üçün Fəzl ilə başlayan dönəm Allahlıq dönəmi olmuşdur. İmadəddin Nəsimi bu düşüncəni rübailərində böylə açıqlar:

---

[101] İsmayıl Haqqıuzun, "Osmanlı tarixi" çevirən İrəc Nobəxt, birinci cild, s. 407-408.
[102] Varidat kitabını buradan oxuya bilərsiniz: http://ismailhakkialtuntas.files.wordpress.com/2011/05/varidat.pdf
* Yəhudi təsəvvüfü.
[103] İrine Melikoff "Uyur idik uyardılar" Alevilik-Bektaşilik Araştırmaları Cem evi yayınları- İstanbul Türkçeye çeviren Turan Alptekin s. 188.

“Nagəhan bir şaha düşdü könlümüz
Üzü bədrü mahə düşdü könlümüz
Ta ki, Fəzlullaha düşdü könlümüz
Bigüman Allaha düşdü könlümüz.

Fəzli-həqdən mən hidayət bulmuşam
Surətin nəqşini ayət bulmuşam
Mərtəbə aləmdə qayət bulmuşam
Ol səbəbdən mən vilayət bulmuşam.”[104]

Fəzllullah İbni-Ərəbidən, özəlliklə onun “Hərflərin elmi” əsərindən çox etkilənmişdi.[105] Fəzlullah, İbni-Ərəbidən və İsmaililikdən etkilənmişdi. Hürufilikdəki Fars milliyətçiliyi amili də İsmaillikdən qaynaqlanmalıdır. Çünkü Hürufilər dəstəmaz aldıqlarında fars əlifbasını əzbərdən oxurdular.[106] Fəzlin yeni bir Quran sayılan “Cavidannamə” əsəri fars dilinin Gürgan dialektində yazılmışdır. Farscanın ərəbcədən daha üstün olması önə sürülməkdə idi.[107] Hürufilərə görə varlıq səslə oluşar. Səs əsil yaradıcı aləmdən, maddə aləminə gələn və maddə biçiminə bürünən hər şeydə var. Cansızlardakı səs bir-birinə vurulduğunda açığa çıxar. Canlılarda zâtən vardır. İnsanda isə, tam

[104] İmadəddin Nəsimi “Mən bu cahana sığmazam”, Bakı Gənclik nəşriyatı- 1991 hazırlayan Əlyar Səfərli, s. 375.
[105] İbni-Ərəbinin “Əl fütuhat-ul Məkkiyyə” kitabı “Hərflərin elmi” adı ilə Türkçəyə tərcümə edilmişdir. İbn-i Ərəbi “Harflerin ilmi” Türçeye çeviren Mahmut Kanık, ASA kitap evi-2000.
[106] İrine Melikoff “Uyur idik uyardılar” Alevilik-Bektaşilik Araştırmaları Cem evi yayınları- İstanbul Türkçeye çeviren Turan Alptekin s. 191.
[107] Eyni qaynaq.

olqunluğa ərişər. Söz səsin həm olqunlaşmış halı, həm də amacıdır. Söz isə hərflərdən meydana gəlir. Hürufilərə görə madam ki, Allah kəndini peyqəmbər vasitəsi ilə göstərir, hər peyqəmbərə gələn hərflər zamanla artar. Adəmə 9, İbrahimə 14, Musaya 22, İsaya 24, Məhəmmədə 28 və Fəzlullaha 32 hərf məlum olmuşdur.[108] Əli peyqəmbərdən də üstün sayılır və yalnız Allahdan istənməsi gərəkən "mədəd" Əlidən istənir. Nəsiminin bu şeirində olduğu kimi:

"Eşq əlindən yandı canım, ya Əli səndən mədəd
Mən qəribi-binəvayəm, ya Əli səndən mədəd
Sən mənə lütfü kərəmdən dərdimə bir çarə qıl
Şah sənsən mən gidayəm ya Əli səndən mədəd
Ey Nəsimiyi-şikəstə, haqdan istərsən nicat
Cürə´yi-tövhid meyindən, ya Əli səndən mədəd."

Hürufilər insan sifətində ərəb əlifbası ilə "əli" sözünün yazıldığına inanırdılar. Hürufiliyin Anadoluda yayqınlaşması bəktaşi və digər ələvi təriqətlərini etkiləmişdi. Öylə ki, Sultan Məhəmməd Fatehin hürufilik öyrətilərinə əyilimli olduğu yazılmaqdadır.

Rəşt əhli olan Mahmud Pəsixani Nəiminin öyrəncisi olmuşdu. Nəimidən ayrılaraq nöqtəvilik cərəyanını təşkil etdi. Səfəvilər öncəsi gizlin düşüncə həyatlarını sürdürməkdə idilər. Səfəvilərlə qısa sürəliyinə önləri açıldı. Nöqtəvilər Quranı özlərinəxas biçimdə açıqlayırdılar. O dünyaya, cənnət və cəhənnəmə inanmırdılar. Canlıların bir-birinə dönüşməsinə,

[108] Emre Kongar "Tarihimizle yüzleşmek" Remzi Kitabevi s. 57.

yəni tənasüxə inanırdılar.[109] Nöqtəvi hərəkəti qısa sürədə çox yayqınlaşdı. Kaşan, Şiraz, Qəzvin və İsfahanda çox tərəfdar tapdılar. Nöqtəviyan Səfəvi dövlətinin ilk illərində bir çox sənət adamlarını özlərinə cəlb etmişdilər. Şah Təhmasibin sarayında özlərinə yaxşı imkanlar da sağlamışdılar. Ancaq nöqtəvi dərvişlərin qiyamları onların qətlinə fətva verilməsinə səbəb oldu. Təhmasibin səltənətinin sonlarına doğru Xosrov Qəzvini adında bir dərviş Qəzvin nöqtəvilərinin rəhbəri idi. Dərviş Xosrov İkinci İsmayıl və Sultan Məhəmməd Xudabəndə zamanında da fəaliyyətlərini sürdürdü. Birinci Şah Abbas şəxsən bu dərvişlə tanış oldu. Nöqtəvilərin görüşləri ilə tanış olduqdan sonra Şah Abbas onların qətlinə fərman verdi. Seyyid Əhməd Kaşi, Mövlana Süleyman Savcı, Budaqbəy Dinoğlu, Dərviş Turab, Dərviş Kamal Oqlidi kimi firqənin tanınmış rəhbərləri öldürüldülər.[110] Səfəvilərin nöqtəviləri qətl etmələri üzərinə onlar Hindistanda moğol-türk padşahı Əkbər Şaha sığındılar. Əkbər Şah onların fəaliyyətlərini sərbəst buraxdı və nöqtəvilərin fikirləri ilə özü də maraqlandı.

Nöqtəvilərin fikirlərini bildirən bəzi farsca şeirlər qalmışdır. Hürüfilərdən ayrılan nöqtəvilərə görə varlıq hərflərdən deyil, nöqtədən başlar. Bütün sirlər nöqtədədir. Nöqtə öz içində sonsuzluğu daşımaqdadır. Nöqtənin açılıb yumulması zamanı meydana gətirər. An,

[109] Mirəhməd Məryəm, “Səfəvilər dönəmində din və məzhəb”, Tehran, Əmirkəbir nəşriyyatı, 1363.

[110] Nəsrullah Fəlsəfi “Şah Abbasın həyatı”, 2-ci cild, Tehran, 1352.

bir nöqtədir. Bu nöqtə uzadıldığında sonsuza uzanan bir xət meydana gəlir. Hərflər də bu xəttin üstündə yazılar. Nöqtəvilərə görə hürufilik nöqtənin sirlərini görə bilməmiş. Nöqtə hərfdən əvvəldir. Bu xətt üzərində bir nöqtə əsas alınır. O nöqtə mərkəz olmaq üzrə bir dairə cızacaq olsaq, bu dairənin diametrinə zaman adı verilir. An, 18 min aləmi özündə toplayan nöqtədir. Mütləq zaman anlayışı da nöqtədə birləşər. Həyat mütləq zaman içində sona çatdığı üçün nöqtənin içində var olub və nöqtənin içində ölürük. Allaha bağlanışımız da bir nöqtədir. Bu nöqtənin içi və dışı Tanrı ilə çevrələnmişdir.

Bədrəddin əsərlərində bu düşüncələr bütünləşirdi. Bədrəddin, şeyxi Tanrı ruhunun daşıyıcısı kimi tanımlayırdı. Ona görə şeyxə mütləq itaət etmək Tanrının əmrlərinə təslim olmaq anlamını daşıyır. Məsum və pak olan şeyxin əmrləri vacibdir. Bütün varlıq şeyxin qutsal iradəsinin doğrultusunda hərəkət edir. Bu üzdən də şeyx xalqa və varlığa “mütləq hakimlik” haqqına sahibdir. Bu təlimləri ilə Bədrəddin bəktaşi təriqətini yeni mərhələyə sövq etməkdə idi. İslami mətnləri batini yöntəmlə açıqlayaraq şeyxə təslim olmağı dinin mərkəzi nöqtəsi kimi izah edirdi. Batini açıqlama yöntəminə dayanaraq namaz, oruç, həcc kimi ibadətləri lazımsız hesab edirdi. Bədrəddinin bu şəkildə açıqlamasına səbəb olan bir də türklərin toplumsal toxuları olmuşdur. Köçəri həyat sürən Anadolu türkmənləri üçün dinin ibadət yönlərinin anlamı yox idi. Köçəri həyatda nə məscid olurdu, nə də namaz qılmağa ehtiyac var idi. Tək önəmli olan “Əli sevgisi”, “Şeyxin

əmrlərinə mütləq təslimlik" və "din yolunda cihad" idi. Bəktaşi-şiə üsyanı olan Bədrəddin hərəkətinə xristianlar da qatılmışdı. Xristianların amacı Bədrəddin vasitəsi ilə Osmanlını devirmək idi. Osmanlı xristian ailələrini dağıdıb çocuqlarını devşirirdi. Xristianlar da Osmanlının devrilməsi üçün Bədrəddin üsyanına ümid bağlamışdılar. Osmanlıların xristian yurdlarına saldırıb yağmalamaları xristian əhalini Bədrəddin üsyanlarına qatılmağa sövq edirdi. Bədrəddin üsyanı öyləsinə genişləmişdi ki, hətta keşişlər və yəhudi din adamları da bu üsyana qatılmışdılar.[111]

Bədrəddinin müridləri ona öyləsinə inanırdılar ki, onun ölmədiyini və yenidən dirilib yeni üsyana öndərlik edəcəyini düşünürdülər. Bədrəddinin müridləri təqiblərə məruz qalaraq öldürüldülər. Çoxları da köçəri xalq içinə çəkilərək öz təbliğatlarına davam edib və xalqı inandırmağa çalışırdılar ki, Şeyx Bədrəddin ölməmişdir və yenidən gəlib qiyam edəcək. Bu üsyanların basdırılması və müridlərin öldürülməsi sünni-ələvi arasında köklü düşmənlik duyqusu yaratdı. Bütün Osmanlı torpaqlarında Bədrəddin müridləri təqib altında olduqlarından inanclarını gizlin saxlayaraq "təqiyyə" edirdilər. Təqiyyənin (məzhəbi gizliliyin) ələvi-bəktaşı və şiə inancında Anadolu ortamında ortaya çıxışı böyləcə olmuşdur. Təqiyyə hər tür yalan danışmaq və fırıldaqlıq üçün bəraət qazandırma yöntəmidir. İkiüzlülük olaraq bunu kütlə dilində tanımlamaq

[111] İsmayıl Haqqıuzun, "Osmanlı tarixi" çevirən İrəc Nobəxt, birinci cild, s. 409-411.

mümkündür. Aqressiv və intiqam duyqularını içlərində daşıyan Anadolu bəktaşiləri səbirsizliklə Şeyx Bədrəddinin geri dönməsini bəkləyirdilər. Anadolu türkmənlərinin bu bəkləyişləri 27 il sürdü. 27 ildən sonra Şeyx Cüneyd Bədrəddinçi iddialarla ortaya çıxdı. Qurtarıcı bəkləyən türkmənlər müjdələnən qurtarıcının gəldiyini düşünərək Cüneydə üz tutdular.

## Şeyx Cüneyd Anadoluda

Cüneyd Ərdəbil xanigahında iqtidara gəlmə mücadiləsində yenildikdən sonra yanındakı böyük dəstə müridləri ilə Anadoluya getdi. Yanındakı müridlər Əmir Teymurun Şeyx Əliyə bağışladığı əsirlərdən oluşmaqda idi. Cüneyd Osmanlı sultanına bir məktub yazaraq ondan öz müridləri ilə yerləşmək üçün torpaq sahələri ricasında bulundu.[112] Şeyx Səfi xanigahının xəbərləri Osmanlı sarayında da dolaşmaqda idi.

[112] Ankara Hüseyin Gazi Derneği, İsmail Kaygusuz "Aleviliğin kızılbaş siyasi hareketi ve Şah İsmail", YOL dergisi, sayı 19 Ankara.

Bu üzdən Osmanlı Sultanı ona mərhəmətdə bulunaraq istəyinə olumlu cavab verdi. Cüneyd müridləri ilə bir yerdə bir sürə Sultanın bağışladığı tarlalarda yaşadı. Bu zaman Şeyx Bədrəddinin müridləri arasında Təbrizdən gəlmiş və müridləri türkmənlər olan bir şeyx haqda xəbərlər dolaşmağa başlamışdı. Azərbaycan və Təbriz sözünün Anadoluda mənəvi təsiri var idi. Təqribən 200 il öncə də Təbrizdən Şəmsi-Təbriz adında bir arif Anadoluya, Konyaya varmış və böyük mənəvi təsir göstərmişdi. Öylə ki, şəmsçilərin təsəvvüfi fəaliyətləri o zaman da Anadoluda sürməkdə idi. Şeyx Bədrəddinin varis xəlifələri Cüneydlə tanış olub düşüncələrini öyrənmək üçün ziyarətinə getdilər. Cüneyd bu görüşlərdə Şeyx Bədrəddin varislərinin imkanlarını denədi və Anadoluda böyük, ancaq lidersiz bir kütlənin var olduğunu sezdi. Cüneyd bu sezgisindən sonra bu kütləyə öndərlik etmək fikrinə düşdü və məzhəb dəyişməsi də bu üzdən gerçəkləşdi. Atalarının Şafei məzhəbli olmasına baxmayaraq, o, Anadoludakı sosial psikolojiyə uyum sağlayaraq onların inancının öndəri olmağı hədəflədi. Cüneydin sünni məzhəbindən şiə məzhəbinə keçişinin macərası bu şəkildə olmuşdur. Şeyx Bədrəddinin ölümündən 27 il keçirdi. Bu sürə içində bəktaşilərin üzərində anlaşa biləcəkləri etkili bir lider ortaya çıxmadığından örgütlənə bilməmişdilər. Anadolu türkmənlərincə Cüneyd Bədrəddinin yerini ala biləcək rəhbər durumunda görünürdü. Cüneyd Bədrəddinin müridlərinin imkanlarını bildikdən sonra xəyallarını gerçəkləşdirə biləcəyini düşündü. Bu üzdən onun üçün məzhəb

dəyişdirmək çətin olmadı. Zaman itirmədən Bədrəddinin müridlərini özünə cəlb etməyə başladı. Bədrəddinin də müridləri Cüneydin təbliğatını Anadoluda yaymağa başladılar. Şeyx Bədrəddinin müridləri Osmanlının təqibində olduqlarından Cüneyd Osmanlı ilə qarşı-qarşıya gəldi. Bu üzdən də Konyaya getmək qərarına gəlir. Konyada sünni fəqihlərin etirazı ilə qarşılaşdı. Oranı tərk edib Anadolunun güneyinə getdi. Orada Varsaq türkmənləri yaşamaqda idi.[113] Burada yerləşən Cüneydə bir çox Şeyx Bədrəddin müridləri qatıldı. Anadoluya yerləşmiş olan Cüneyd ondan olunan istiqbal üzərinə kəndi məqsədi üçün ümid etdiyindən daha çox əlverişli zəmin bulmuşdu.[114] Ancaq bəlli olmayan səbəblər üzündən buranı da tərk edib İskəndəruna yerləşir. İskəndərun və Antakiya əhli-həq (Əlinin Tanrı olduğuna inanan) şiəsinin yaşadığı bölgə idi. Xristianlıqdan İslama girən bu şəhərlərin əhalisi müsəlman olduqdan sonra İsanın yerinə Əlini qoymuşdular. İsa Allahın oğluydusa, Əli Allahın özü idi. Bu inancın əsasını ilk qoyan İbni-Səba olmuşdur. İbni- Səba Əbutaliboğlu Əli zamanında bir çox olaylara qarışmış. Əliyə aşırı dərəcədə özəlliklər tanımış. Əlinin Allah olduğunu ilk söyləyən İbni-Səbanın olduğunu yazırlar. “Əli insan deyil Allahdır” söyləmiş. Bunun üzərinə Əli onun bir çox yandaşlarını atəşdə yaxmış. Ancaq İbni-Səbanın

---

[113] Ankara Hüseyin Gazi Derneği, İsmail Kaygusuz “Aleviliğin kızılbaş siyasi hareketi ve Şah İsmail”, YOL dergisi, sayı 19 Ankara.

[114] Faruk Sümer “Safevi devletinin kuruluşu ve gelşmesinde Anadolu Türklerinin rolü”

ordunun içində yandaşları çox olduğundan Əli İbni-Səbanı yaxmaq yerinə Sasanilərin əski başkəndi Mədainə sürgün etmişdi.[115] Bu zaman İbni-Səba "Gördünüzmü Əli Allahdır, Allah da suçluların yaxılacağını söyləmiş. Allah olmasaydı Allah kimi cəza düşünməzdi" söyləmləri ilə Mədaində təbliğatına davam etmiş. Əliullahilik bu şəkildə ortaya çıxmışdır. Misirdə qurulub Mədaində gəlişən bu inanış şiəliyin altyapısını oluşdurar.[116] Daha sonra dəyişik firqələrə ayrılan bu inanışa görə "İmamlar məsum (xətasız) peyqəmbər xətasız deyildir."[117] 22 firqəyə ayrılan bu inanışın ən bilinən firqəsi İsmailiyə olmuşdur. Əsasən Həsən Səbbah adı ilə tarixə ün salmış İsmailiyəlik də öz fikri həyatını qismən Anadoluya daşımışdı. Hülaku Xanın Ələmut qalasını devirməsindən sonra İsmaililiyin təşkilat olaraq həyatı ortadan qaldırılmışdı. Fikri olaraq qismən Anadoluya daşınan İsmaililik bir də Gîlânın ormanlıqlarında etiqadi həyatını sürdürməkdə idi. İsmaililik İxvan-üs Səfa öyrətilərinin dərin təsiri altında idi. İxvan-üs Səfada fars milliyətçiliyi açıqca ortaya qoyulmuşdu. "Fars soylu" olmaq İxvan-üs Səfa öyrətilərinin ilkələrindən biri idi.[118] Ümumiyətlə türklər İslamı ərəblərdən daha çox farslardan öyrənmişdir. Bu üzdən də "namaz", "dəstəmaz",

[115] Mehmet Kırkıncı "Alevilik nedir" TÜRDAV YAYIM 1995, s. 31.
[116] Eyni qaynaq, s. 35.
[117] Eyni qaynaq, s. 35.
[118] Həna Əlfaxuri- Xəlil Əlcər, "İslam dünyasında fəlsəfə tarixi", ərəbcədən farscaya çevirən Abdulhəmid Ayəti 3-cü yayım "İslami inqilab yayınları" 1367 (hicri-şəmsi), s. 198.

“abdəst”, “oruç” kimi islami sözlər fars dilindən türk dilinə keçmişdir. İslamiyəti farslardan öyrənmənin etkisi bütün məzhəblərdə və təriqətlərdə az-çox olmuşdur. Bədrəddinin inanc sistemində bu tarixi gəlişmələr sistemləşib Cüneydə devr edilmişdi. Bu bilgilərlə və bu tarixi mirasla Cüneyd Anadoluda öz düşlərinin arxasınca qoşmaq istəmişdi. İskəndərunda bir xanigah düzəldib müridlərini artırmağa başladı. Müridlərini köçəri türkmənlərin arasına göndərib yandaş bulmağa çalışdı. Ayrıca, türkmənlərdən gələn nəzrlər xanigahın iqtisadı imkanlarını gücləndirirdi. Ancaq Şam şəriətçiləri ondan Hələb əmirinə şikayət etdilər. Bunun üzərinə və Hələb Əmirinin basqısını hiss etdiyindən İskəndərunu tərk etmək zorunda qaldı. Anadoluda yaşadığı səkkiz il müddətincə bəktaşiliyin onun üçün bir fürsət olduğunu anlamışdı. Əski sünni məzhəbini tam olaraq buraxmış və şiə ibadət tərzinə keçmişdi. O, bəktaşilərin bir tək öndərinə dönüşmüşdü. Özünə “sultan-ul məşayix”, yəni şeyxlərin sultanı ləqəbini taxdı. Bu, o demək idi ki, o, Anadolu türkmənlərinin dini-siyasi öndərliyini tam olaraq öz üzərinə almaq istəmişdir. Bədrəddinin bütün xəlifələri onu rəhbər kimi qəbul etmişdilər. Cüneyd kəndi soyunun yeddinci imama bağlı olduğunu israrla Anadolu bəktaşi türkmənlərinə söyləyirdi. Bu, onun tərəfdar toplamasına çox yardımcı olmaqda idi. İmam soyundan olduğu üçün ona özəl sayqı göstərilirdi.[119] Onun imam soyundan olması

[119] Ankara Hüseyin Gazi Derneği İsmail Kaygusuz “Aleviliğin kızılbaş siyasi hareketi ve Şah İsmail”,

hürufilikdə, Əliullahilikdə yayqın olan hilul inanışı ilə uyqun gəlirdi. Yəni qutsal ruhun bədəndən bədənə keçişi. Bu inanc türkmənlər arasında öyləsinə güclü olmuşdur ki, yaraşıqlı görkəmi və karziması ilə zühur iddiasında bulunan Şah İsmayıla bütün mallarını və canlarını fəda edəcəklərdi.

1453-cü ildə İstanbulu fəth edən Sultan Məhəmməd Fateh Doğu Avropada irəliləməkdə idi. Trabzonu Osmanlı ərazisinə qatmaq üçün savaş hazırlıqları gedirdi. Zəifləmiş durumda olan Trabzon dövlətinə Cüneyd də saldırılar düzənləyərək çevrə kənd və qəsəbələrini talayıb bolca qənimət əldə etdi. Bu zaman Osmanlı sultanı Uzun Həsənin aracılığı ilə Trabzon dövləti ilə barış yapdı. Cüneyd və müridləri də Canıqdan uzaqlaşdırıldı.[120] Cüneydin Trabzona saldırması Uzun Həsənin diqqətini çəkər.[121] Uzun Həsən, bayındırlı boyunun başçısı idi. Moğolların qalxınması ilə onlar Anadoluya gəlmişdilər. Əmir Teymur Anadoluya saldırdığında onunla işbirliyi etmişdilər. Bu üzdən də Teymur onları ödülləndirmiş və Şərqi Anadolunun bir bölümünü onlara vermişdi. Əmir Teymura tabe olan Diyarbəkir mərkəzli bir dövlət qurmuşdular.[122] Osmanlı tərəfindən təhdid

---

YOL dergisi, sayı 19 Ankara.

[120] Eyni qaynaq.

[121] Eyni qaynaq.

[122] Bayındırlılar üzərinə ayrıntılı bilgi üçün bu qaynaqlar oxuna bilər:
http://www.turkishstudies.net/sayilar/sayi10/toksoyahmet.pdf
http://www.turkishstudies.net/Makaleler/1175398130_toksoyahmet1300.pdf

edilən Trabzon padşahı Uzun Həsənlə ittifaqa girib Qızı Despninanı uzun Həsənə vermişdi. Bu ittifaq bir sürəliyinə Osmanlı qarşısında Trabzonun güvənliyini sağlaya bildi. Sultan Fateh Uzun Həsənin araya girməsi ilə barışı keçici olaraq qəbul edib Trabzonun fəthini ertələdi. Ancaq bu barış uzun sürmədi və 1461-ci ildə Sultan Məhəmməd Fateh Trabzonu fəth etdi.

Şeyx Cüneyd Canıqdan dışlandıqdan sonra müridləri ilə bir yerdə Diyarbəkirə yola düşdü. Çoxsaylı mürid tərəfdarlarından dolayı uzun Həsən Cüneydi önəmsəməyə başlamışdı. “1456-cı ildən 1459-cu ilədək Cüneyd, o vaxt hələ az tanınan Diyarbəkir hakimi Baayındırlı Uzun Həsənin yanında olmuşdu. Uzun Həsən öz düşməni Cahanşahla mübarizədə Səfəvi şeyxlərinin köməyini təmin etmək arzusu ilə öz bacısını Şeyx Cüneydlə evləndirdi.”[123] Cüneyd, Bayındırlı dövlətinin başçısı Uzun Həsənin bacısı Xədicə Bəyimlə 1458-ci ildə evləndikdən sonra daha da güclənmiş oldu.[124] Arxasında Bayındırlı dövlətinin dəstəyini də hiss edən Cüneyd müridlərini Anadolunun dəyişik yerlərinə göndərir və türkmən ellərini ona qatılmağa çağırırdı.[125] Uzun Həsən bu yolda Cüneydə mane olmur, hətta müridlər toplaması üçün yardım da

---

[123] Oqtay Əfəndiyev “Azərbaycan Səfəvi Dövləti”, Şərq-Qərb, Bakı -2007, s. 42.

[124] Şərəf Xan Bitlisi “Şərəfnamı” 2-ci cild s. 133. Əastir yayınları Tehran 1377 (h.ş).

[125] Valter Hins “İranda Milli Dövlətin Təşkili” farscaya çevirən Keykavus Cahandari, 2-ci yayım 1361-ci il (hicri-şəmsi).

edirdi. Çünkü Osmanlı və Qaraqoyunlu ilə savaşlarında Cüneydin topladığı müridləri əsgər kimi qullanacağını düşünürdü. Uzun Həsənin Osmanlıya qarşı olan nifrəti Cüneydin işinə yaramaqda idi. Cüneyd çərkəzlərlə savaşmaq və cihada getmək üçün Uzun Həsəndən izn istədi. Çərkəzlər Qaradənizin doğusunda Gürcülərlə qonuşu olan xristian xalq idi. Çərkəzlər yaraşıqlı, ağdərili olduqlarından çərkəz kölələrin dəyəri çox yüksək idi. Qızlarının müştəriləri çox idi. Bu üzdən də İslam tarixində çərkəz kölələr və kənizlər haqqında bol bilgi və ədəbiyat var. Müsəlmanlar çərkəz kölələr və kənizlər sataraq bol para qazanırdılar. Cüneyd Ərdəbildə dədələrinin məzarını ziyarət etmək bəhanəsi ilə müridləri ilə bir yerdə yola düşüb Azərbaycana və ordan da Şirvana girdi. Şirvandan Dağıstana keçib çərkəzlərə saldırmaq istəyirdi. Şirvan, Şirvanşahlar tərəfindən yönətilən kiçik bir ölkə idi. Şirvanşah bu dönəm Qaraqoyunlu Cahan Şahın müttəfiqidir. Cahan Şah və Uzun Həsən Ermənistana sahib olmaq üçün anlaşa bilmirdilər. Aralarında böyük küdurət var idi. Uzun Həsən, Cüneydi Qaraqoyuluya qarşı qullanmaq istəyirdi. Cüneyd Şirvana vardığında Şirvanşah, Cüneydi durdurmaq üçün Cahan Şahdan yardım istədi. Qaraqoyunlu ordusu Şirvanşahın yardımına getdi. 1460-cı ilin payızında Cüneyd Təbərsəranda Qaraqoyunlu və Şirvanşahın ortaq ordusu ilə savaşa girdi. Cüneyd bu savaşda öldü və müridləri fərari oldu.

## Şeyx Heydər dönəmi

Cüneydin Xədicə Bəyimdən olan iki yaşında Heydər adında bir oğlu var idi. Heydər anası ilə bir yerdə Uzun Həsənin sarayında yaşamaqda idi. Uzun Həsən Cüneydin müridlərini öz ətrafında saxlaya bilmək üçün Heydərin şeyx və varis kimi tanıdılmasını istəyir, müridləri Heydərə tapınmağa təşviq edirdi. İki yaşlı çocuğun müridlərin rəhbəri kimi tanınmasında şəri´ saqınca və əngəl də yox idi. Çünkü Quranda İsa və Yəhyanın doğduqları gündən peyqəmbər olduqları söylənilirdi.[126] İsna-Əşəri şiə inanışında da imam doğduğu gündən imamdır. 12-ci imam da tam çocuqluğunda 4 yaşında qeybə çəkilmişdi! Yəni Heydərin imam kimi qəbul edilməsində şiə şəriəti baxımından heç bir əngəl yox idi. 9-cu imam 7 və 10-cu imam 5 yaşında atalarının imamlıq varisliyinə ərmişdilər. Yetişkin bir təriqət piri ortada olmadığı üçün bu çocuq Uzun Həsənin siyasi amaclarına xidmət edəcəkdi. Özəlliklə onun Uzun Həsən soyundan olması geniş müridlər kütləsi arasında bayındırlı ailəsinə mənəvi üstünlük qazandırırdı. Uzun Həsən bu çocuğa qutsallıq yükləməklə Anadoludakı geniş Cüneyd müridləri kütləsindən hərbi, siyasi amacları

[126] Quran 19-cu surə 12-ci ayət.

yolunda istifadə edə bilərdi. Böylə də oldu. Uzun Həsən Cahan Şahla girdiyi savaşda Cenyd müridlərini qullandı. Bu savaşda Uzun Həsənə uğur qazandıran da Cüneyd və artıq Heydər müridlərinin inanclı savaşçıları oldu. 1467-ci ildə Uzun Həsən, Cahan Şahla savaşa girər. Bu savaşda Heydərin müridləri Uzun Həsənə hərbi dəstək verir və şeyxlərinin öcünü almaq üçün Qaraqoyunluya qarşı savaşarlar. Cahan Şah yenilib öldürülər. Onun ölümü ilə də Qaraqoyunlu dövləti tarix səhnəsindən silinər. Təbriz mərkəzli Qaraqoyunlu ölkəsi bayındırlı dövlətinin idarəsinə keçər. Bir il sonra Uzun Həsən başkəndini Diyarbəkirdən Təbrizə daşıyar. Bu zaman Xorasanda Teymur soyundan olan Əbusəidin dövləti hakimdir. Əbusəidin başkəndi Heratdır. Əbusəid Uzun Həsənə qarşı savaş başlatdı. Ancaq Muğan ovalığında yenilib öldürüldü. Əbusəidin ölümündən sonra Sultan Bayqara Xorasana ordu yürüdüb oranı ələ keçirdi və başkəndini Herata daşıdı. Bayqara Xorasanda ilk zeydi şiəsi hökmdar idi. O, Mötəzilə məzhəbindən etkilənən Zeydi şiə məzhəbinə mənsub idi. Ancaq zeydiyyə məzhəbi hənəfi sünni məzhəbinə daha yaxın idi, çünkü zeydiyyə fiqhdə Hənəfi məzhəbinə tabe idi. Bu baxımdan isna-əşəri (12 imamlı) şiə məzhəbi ilə uyumlu deyildilər.

Zeydiyyə isna-əşəri şiənin ilk dörd imamını qəbul edir, qalanlarını qəbul etmirdi. Zeydiyyəyə görə imamət dördüncü imam Zeynəlabidindən sonra onun oğlu Zeydə keçmiş, Baqirə keçməmişdi. Zeyd həm qardaşını, həm də atasını Əməvi zülmü qarşısında susmaqla

ittiham edirdi. Özü isə, qiyam edərək savaşda şəhid oldu.[127] Ancaq daha sonrakı dönəmlərdə Zeydiyyə sönükmüşdü. İsna-Əşəri Zeyd soyundan imamın olmadığı və Zeydin özünün də imam olmadığını söylər. Cəfər Sadiqə görə imam olunmaz, imam doğularmış. Cəfər Sadiq demiş: Kim imam olmaz və haqsız yerə imamlıq iddiasında bulunarsa Əli soyundan olsa bilə, yenə də kafirdir.[128] Bütün bu tarixi sənədlər və imam kimliyi ilə bağlı açıqlamalar Səfəvi şeyxlərinin iqtidara dırmanışları üçün yollarını açmaqda idi. Şiənin bütün təriqətlərində Əli ilə bağlı insanötəsi özəlliklər söz qonusu idi. Örnəyin Əlinin anadan olması ilə bağlı əfsanələr uydurulmuşdur. Əli Kəbədə dünyaya gəlmiş. Anası doğum yaparkən Kəbənin divarına dayanmış. Divar yarılmış və qadın Kəbənin içinə girmiş. Böyləcə Əli Kəbənin içində dünyaya gəlmiş! Bunu demək olar ki, bütün şiə qaynaqlı təriqətlər qəbul edər. Bu əfsanə ilə bağlı bir neçə sual: Hz. Məhəmməd Kəbədə dünyaya gəlməmiş. Bu, Hz. Məhəmməd üçün bir əksiklikmi? Bütün yer üzü və varlıq Allahın yaratdıqları deyilmi? Kəbədə dünyaya gəlmənin nə üstünlüyü ola bilər? Kəbə divarının yarılaraq qadının Kəbənin içinə keçib doğum yapmasını kim görmüş? Çünkü qadın doğum yaparkən ağır sancılardan başına nələr gəldiyini bilə, bilməz. Böylə bir olay gerçəkləşmişsə, nədən Əlinin anası oğluna Allah kimi baxmamış? Nədən Əlinin atası və qəbiləsi O´na tapınmamışlar? Əlinin

---

[127] Məhəmməd ibni- Əbdulkərim Şəhristani “Əlmeləl vəl nəhl” 1-ci cild, s. 251.
[128] Üsuli-kafi, bab 141, 1-4 hədislər.

atası İslamı da qəbul etmədən öldü, yəni Əli əslində müsəlman oğlu deyildir. Böylə bir olay gerçəkləşsəydi, bütün ərəb qəbilələri Əliyə Tanrı kimi tapınmazdılarmı? Böylə bir doğum haqqında nədən sadəcə azınlıqda olan şiə cəmaatının bilgisi var və digər ərəb və İslam dünyasının bilgisi yoxdur? Böylə bir olay olsaydı və gerçəkdən də Kəbənin sərt hörülmüş daşlarının aralanıb Əlinin Kəbənin içində doğumu doğru olsaydı, Hz. Məhəmməd bu haqda heç olmazsa bir tək cümlə söyləməzmi idi? İnsanların harda doğması onların mənəvi üstünlükləri üçün bir özəllik ola bilərmi? Əli dünyaya gəldiyində hələ İslam yox idi və Kəbə də bütlərin barındığı yer idi. Yəni Kəbə bütxanə idi. Kəbənin müsəlmanlar üçün dəyəri İslamdan sonra ortaya çıxmışdır. Bütxanədə dünyaya gəlmək, əslində sevimsiz bir durumdur. Bütxanədə dünyaya gəlmənin nə kimi üstünlükləri ola bilər? İrəlidə səfəvizədə türklərin Səfəvi dövləti qurulduqdan sonra bu kimi əfsanə və yalanlarla ağıllarının qaranlığa necə gömüldüyü haqda ayrıntılı bilgi sunulacaqdır.*

Uzun Həsən Təbrizə yerləşdikdən sonra Şeyx Cüneydin əmisi Şeyx Cəfəri yanına çağırdı. Ərdəbil xanigahının rəisliyi Cahan Şah dönəmindən bəri Şeyx Cəfərin əlində idi. Uzun Həsən xanigahın rəisliyini və mal varlığını ondan alaraq Şeyx Heydərə təslim etdi. Şeyx Heydəri

---

* Azərbaycan Cumhuriyətinin dövlət TV kanalında ərəb dilini bilən və dini bilgisi olan bir professor sürəkli tarixi əsasını olmayan bu əfsanəni din bilgisi adına xalqa təbliğ edirdi. Bu, İrani və şüubi İslam bilgisindən başqa bir şey deyildir.

Ərdəbilə göndərib xanigahın rəisiliyinə keçirdi. Bu zamandan sonra Şeyx Cəfər və onun soyundan heç bir xəbər olmamışdır. Başına nələr gəldiyi bilinməməkdədir. Böyük olasılıqla onu və ailəsini Heydərin müridləri şeyxlərinin intiqamını almaq üçün qətl etmişlər. Çünkü bu ailədən biri diri qalsaydı sonrakı dönəmlərdə ölkənin bir yerindən baş çıxarmalıydılar. Bu dönəmdən sonra Azərbaycandan Səfəvi məzhəbinə qatılanlara rastlanılmamışdır. Heydərin müridləri əsasən Anadoludan gəlmiş olan bəktaşi, şiə kütlədir. Çünkü əskidən Ərdəbil Səfəvi xanigahı Azərbaycanda sünni təriqətin təmsilçisi idi.

Şeyx Heydər çocuqluğundan atasının müridləri tərəfindən eyitilmişdi. Bu müridlər daha əskidən Şeyx Bədrəddinin xəlifələri olmuşdular. Bütün savaş texnikləri Heydərə öyrədilmişdi. Uzun Həsənə yardımlarından dolayı Şeyx Heydərin müridləri çox imkanlara qovuşdular. Uzun Həsən onlara hər tür azadlıq vermişdi. Hətta Ərdəbildə silah ürətim mərkəzi də təsis etmişdilər. Böyləcə Ərdəbil xanigahı dövlət içində dövlət durumuna gəlmişdi. Ərdəbil xanigahının 20-dən artıq kəndi var idi. Bunları moğollar hədiyə etmişdi. Kəndlilərin əməklərinin nəticəsi xanigahda toplaşırdı. Şeyx Heydər və müridləri aşırı dərəcədə təqiyyədə bulunduqlarından dolayı inanclarını çevrədən gizlətməkdə idilər. Ərdəbil və Azərbaycan Heydərin dədələrinin yolunda olduğunu sanırdı. Uzun Həsən bilə, Heydərin inancından xəbərsiz idi. Uzun Həsən də Heydərin dədələrinin yolunda yürüdüyünü sanırdı. Heydər olqun

yaşına ulaşdığında Uzun Həsən qızı Aləmşahı onunla evləndirdi. Bu evlilik Heydərin pozisionunu Şahın kürəkəni kimi daha da möhkəmləndirirdi. Bu zaman Təbrizdə yaşamış olan Fəzlullah Ruzbehan Xonci, Heydərin Ərdəbildəki fəaliyətləri ilə bağlı yazır: Daha çox zamanını silah ürətimi ilə keçirməkdədir. Savaş silahları düzəltməkdə və qullanmaqda bənzəri yoxdur. Neçə min süngü, qılıc, dəmir papaq və qalxan düzəltdiklərini eşitmişəm. Müridlərini də silah ürətimi üçün təşviq etməkdədir.[129] Buna bənzər bilgini Ziya Bünyadov da Xoncinin ingilis dilinə çevrilmiş əsərindən türkçəyə tərcümə edərək öz əsərində vermişdir: "1488-ci ilin hadisələrindən miskin şeytanın, yəni ərdəbilli Şeyx Heydərin üsyanını göstərmək olar. O, qalxmaq istəyirdi, lakin məğlub edildi... O, vaxtının çox hissəsini öz əməliyyatı üçün qılıc və nizə hazırlamağa sərf etdi. Rum, talış və Qaradağdan çoxlu adam onun yanına toplandı və deyirlər ki, onlar şeyxi özlərinə allah (məbud) hesab edir, dua və ümumi namaza fikir verməyib, ona qiblə kimi baxırdılar... Şeyx onların arasında ibahat etiqadını (yəni qadağan edilib haram sayılan əmələ icazə verilməsini) və Babəkin dini qayda- qanunlarını təbliğ edirdi."[130] Z. Bünyadov qızılbaşlıqla babək Xürrəmdin arasında ideya baxımından ilişki qurmaq istəmişdir. Ancaq bu haqda somur bilgi və bəlgə mövcud deyildir. Babəkdən 700 il sonra

[129] Fəzlullah Xonci, Aləm arayi əmini, 147, redaktə: Mənuçehr Parsadust.
[130] Ziya Bünyadov, "AZƏRBAYCAN VII-IX ƏSRLƏRDƏ", Şərqi-Qərb, Bakı- 2007, s. 358.

başlayan bir hərəkətdir. Böyük olasılıqla Şeyx Heydər Babək Xürrəmdinin heç adını da eşitməmişdi.

1478-ci ildə Uzun Həsən öldü. Varislik uğrunda oğulları Xəlil, Maqsud və Yaqub arasında savaş başladı. Şiraz hakimi olan Xəlil ordusuyla Təbrizi ələ keçirib qardaşı Maqsudu yaxalayıb öldürdü. Maqsudun anası Despina idi. Yaquba da Diyarbəkir valiliyini verdi. Altı ay sonra Yaqub Təbrizə ordu yürütdü. Qardaşı Xəlili öldürüb özü ölkənin şahı oldu. Sultan Yaqub yaxşı eyitim almış şahzadə idi. Ədəbiyata, sənətə meylli biri idi.[131] Abdulrəhman Cami kimi dönəmin ünlü şairləri Yaqub Şah üçün mədhiyələr yazmışlar. Dini qurallları aşırı dərəcə uyqulayırmış. O, Təbrizdə car çəkdirmişdi ki, şarab içənlərin boğazına qaynar qurşun töküləcəkdir.[132] Yaqub barışdan yana şah idi. Çevrə ölkələrlə, özəlliklə Osmanlı ilə yaxşı münasibətlər qurmaq istəyirdi. Bu zaman Osmanlıda Sultan Fatehin oğlu İkinci Bayəzid iqtidarda idi. İkinci Bayəzid atasının tərsinə olaraq heç bir fatehlik xəyalı daşımamaqda idi. İki dövlət arasında gəlişən qarşılıqlı ilişkilər nəticəsində Təbrizdə böyük ticari irəliləmələr ortaya çıxmışdı. Təbriz ürünü mallar İstanbula və oradan da Avropaya daşınmaqda idi. Yaqub Bayındır dönəmində Azərbaycan böyük iqtisadi qalxınmalara səhnə olmuşdu. Sultan Yaqub dönəmində xanigahlara deyil, mədrəsələrə önəm verildiyindən xanigahların durumu

[131] Həsən Urmulu, Əhsən-ut təvarix.

[132] Aləm arayi əmini, 215, redaktə: Mənuçehr Parsadust.

əskidən olduğu kimi deyildi. Dövlət xanigahları deyil, mədrəsələri savunurdu. Bu üzdən Ərdəbil xanigahı da Yaqub Bayındırın mədrəsələşdirmə politikasından etkilənmişdi. Yağmalama yoluyla qənimət qazanan Şeyx Heydər və müridləri Sultan Yaqubun barışcıl siyasətini sevməz olmuşdular. Mədrəsə və xanigah savaşında Ərdəbil xanigahı bir çox imkanlarını mədrəsənin qarşısında itirdi. Özəlliklə dövlət bu şəkildə istəməkdə idi. Bu da getdikcə Heydərin nüfuzuna zərər verməkdə idi. 1480-ci ildə necə olursa olsun mədrəsənin qarşısında Ərdəbil xanigahını qorumaq qərarına gəldi. Bu amac üçün Şeyx Bədrəddinin mücadilə yöntəmlərini canlandırmaq istədi. Bu üzdən müridlərinə 12 zolaqdan oluşan qırmızı boyalı keçə papaq geyinmələrinə əmr etdi. Bu zaman Anadoluda Bədrəddinin bütün müridləri Şeyx Heydərin öndərliyini qəbul etmiş durumdaydılar. Onlar Anadoluda Şeyx Heydərin qızılbaşlıq görüşlərini təbliğ edirdilər. Anadoluda bütün mürid türkmənlər qızılbaş olmağa, 12 zolaqlı qırmızı keçə papaq geyinməyə başladılar. Azərbaycan sünni olduğundan bu geyim qəbul edilmirdi. Şeyx Heydər Anadoluya gizlin bir fətva yolladı. Bu fətvaya görə bütün sünnilər kafir sayılır və qətlləri vacib idi. Mədrəsə ilə mücadilənin yöntəmi kimi Heydər bu metodu düşünmüşdü. Heydərin bu fətvası yeni deyildi. Daha əski dönəmlərdə şüubiyə, ismailiyə kimi şiə məzhəbləri bu şəkildə düşünmüş və teror əsdirmişdilər. Heydərin Anadoluya göndərdiyi bu göndərisinə (mesajına) görə sünni öldürmək şəri ´ vacibatdandır və sünnilərin qadınları qızları

halaldır, malları qəsb edilə bilər. Heydər də Bədrəddin kimi namaz, oruç və həcc kimi dini mərasimləri yasaqladı. Bundan sonra qızılbaş olaraq tarixə girən Heydərin müridləri düzənli silahlı savaşçılar halına gəldilər. Əsasən sünni olan Şirvan, Dağıstan və Güney Qafqazı cihad savaşları ilə yağmalayıb yaxdılar. Sünnilər kafir sayıldığından onlara qarşı savaş da cihad sayılacaqdı. Qızılbaşlar Ərdəbil kəndlərində də yağmalamalara başladılar. Fəzlullah Xonci qızılbaşların Ərdəbildəki yağmalamalarını yazmışdır: Heydər Ərdəbildəki müxaliflərinə zərər vermək üçün hər vasitədən yararlanır. Köpəkləri yağlayıb gecəyarısı yaxaraq müxaliflərinin məhəllələrinə göndərir. Canı yanan köpək soxulmağa yer axtarır və adamların evinə soxulur. Müxaliflərin evi tutuşub yanır. Ərdəbildə bir çox evlərin bu şəkildə yandığını deyirlər.[133]

Bədrəddinlə başlayıb Şeyx Heydərlə qızılbaşlıq olaraq tarixə girən sufilik hərəkəti aqressivliyi, saldırqanlığı özünə yöntəm olaraq seçmişdi. Daha öncəki sufilik hərəkətlərində adam öldürmək yasaqlanmışdı.[*] Təsəvvüf sosial

---

[133] Fəzlullah Xonci, Aləm arayi əmini, 148, redaktə: Mənuçehr Parsadust.

[*] Örnəyin Əbulsəid Əbulxeyirin bu dördlüyü sufiliyin əzbər dünyagörüşü kimi bilinməkdədir:

“Gəl-gəl, kim olursan gəl, heç durma saqın, gəl-gəl!
Sən kafər u gəbrisən, gəl-gəl, yenə gəl, yüksəl!
Heç kimsə bu dərgahdan, küsməz, küsəməz olsun
Qırmışsan əgər tövbə, gəl- gəl yenə gəl, gəl-gəl”

Farscacı:
Gəbr- Gavur
باز آ، باز آ، هر آنچه هستی باز آ

baxımdan üç mərhələni içərmişdir: 1- Pərhiz və ya qəhr təsəvvüfü. 2- Eşq və ya barış təsəvvüfü. 3- Saldırı və ya savaş təsəvvüfü. “Pərhiz təsəvvüfü” və ya “zühd” Əməvilər dönəmində şəkillənməyə başlamışdı. İlk dörd xəlifənin sadə həyat biçimləri, yerini saray ehtişamına buraxdığında Bizansı təqlid edərək yeni dönəmə keçilmişdi. Xilafətin xəzinəsini doldurmaq üçün iqtisadi yağmalamalar baş qaldırmış, yoxsullar üzərinə olmazın zülmlər edilmiş və köləlik yayqınlaşmışdı. Bu sosial ortamda bir qism müsəlmanlar pərhiz və zühd metodunu önə çıxarmışlar. Bu saray həyatından, zülm düşüncəsindən uzaqlaşmaq üçün çox şeylərdən könüllü olaraq imtina etmişdilər. Əməvi dövlət düşüncəsi ilə hər türlü əməkdaşlığı ortadan qaldırmışdılar. Bunlar “nosak” və ya zahidlər olmuşlar. Dövlətin zülm içərən dünyagörüşünə, xalqın zülmü qəbul edən dünyagörüşünə etiraz üçün yalnızlığa çəkilirdilər, onların dünya düzənini dəyişdirmək kimi amacları olmamış, sadəcə öz nəfslərini bu çirkablardan təmiz saxlamağa çalışmışlar. Dəyişimi Tanrıya həvalə edərək sosial həyatdan uzaqlaşmışlar. Bu üzdən də xalqdan və xaqandan uzaq durmuşlar. Səfəvilər dönəmində təsəvvüf saldırı və savaş yolunu seçmişdir. Səfəvi dövlətinin ilk quruluş illərində ordunun vurucu qolunu təşkil edənlər sufilər idi. Saldırı və savaş təsəvvüfü tarixdə bənzəri olmayan yırtıcılığa, hətta adam əti yemə

---

گر کافر و گبر و بت پرستی باز آ
این درگه ما، درگه نومیذی نیست
صد بار اگر توبه شکستی باز آ
Çevirən: G.G

səviyəsinə qədər aşağı düşmüşdür. Eşq və barış təsəvvüfü isə, sosial və tarixi bir görəv də üstlənmişdir. Nə saldırmış, nə də bir küncə çəkilib yalnızca yaşamağı düşünmüşdü. Eşq və barış təsəvvüfü toplumu dəyişdirməyi də öz hədəfi seçmişdi. Öz nəfsini təmizlədikcə topluma yararlı olma düşüncəsini daşımışlar. Yeni əxlaqi dəyərlər icab etmişlər. Bu yeni əxlaqi dəyərləri də öz fədakarlıqları hesabına icad edə bilmişlər.[134]

Heydər, Sultan Yaqubun bibisi oğlu və bacısının əri idi. Bu üzdən Sultan onun bəzi davranışlarına göz yumurdu. Durum kötüləşdiyində Heydərin anası Təbrizə gedib qardaşı oğlunu sakitləşdirirdi. Sultan bibisinə olan sayqısından dolayı Heydərin bəzi xətalarını bağışlamışdı. Bir kərə qızılbaşların saldırısından bezmiş olan Azərbaycan əhalisinin ağsaqqalları Təbrizə gedib Sultana şikayət etdilər. Sultan Yaqub, Heydəri Təbrizə çağırır. Atası kimi təqiyəni öz təriqətinin əsası sayan Heydər köhnə dərviş paltarı geyib bir dəstə dərviş müridləri ilə Təbrizə gedir. Sultanın hüzurunda Qurana and içir ki, onun müridləri belə iş etməmişlər, bundan sonra da etməyəcəklər. Bütün bu şayiələri onun düşmənləri olan mədrəsə fəqihləri yaymışlar. Ancaq çərkəzlərə qarşı savaşı Allahın cihad əmri olaraq Sultana anlatdı və kafirlərə qarşı müridlərinin savaşmasını önləyə bilməyəcəyini söylədi. Sultan Yaqub onu bu cihad eyləmindən də yasaqladı. Artıq onun müridlərinin çərkəzlərə qarşı cihad savaşlarına

[134] Nasirəddin Sahibəzzəmani "Üçüncü xətt", 1973-Tehran, s. 319-322.

qatılmayacaqlarına dair Heydər Qurana and içir. Ərdəbildə, yalnız xanigahda ibadətlə məşğul olacağını söyləyir. Ərdəbilə döndükdən bir sürə sonra anasını Sultan Yaqubun yanına göndərdi. Kafir çərkəzlərlə savaşmaq üçün Sultandan izn istədi. Xanigahın maddi durumunun yaxşı olmadığını anasının Sultana söyləməsini istədi. Çərkəz gənclərini əsir yaxalayaraq satıb gəlir qaynağı düzənləmək istəyirdi. Sultan Yaqub, Heydərin anasının bu istəyinə olumlu cavab verməsə də, onun cihad savaşına etiraz da etmədi. Heydərin əsas amacı çərkəzlrlə savaşmaq deyildi. Heydər daha güclü pozisionda olduğunu görürdü. Anadoluda vurucu müridləri var idi. Çərkəzləri bəhanə edərək Şirvana saldırıb atasının öcünü almaq istəyirdi. Heydər 1488-ci ildə bir dəstə müridləri ilə Ərdəbildən çıxıb Kür çayının kənarında dincəlmək adı ilə yola düşdü. Mücahid savaşçılarının onun yanına gəlmələri üçün Anadoluya xəbər göndərdi. İki ay içində altı mindən artıq savaşçı qızılbaş onun ətrafına toplaşdı. Yayın ortalarında Heydər Kür çayından keçərək əhalisi sünni olan Bərdəyə saldırdı, özəlliklə bütün din adamlarını öldürdü. Daha sonra Şamaxıya saldırdı. Şirvanşah bu savaşda yenilib fərar etdi. Heydər Şirvanın başkəndi Şamaxıya girdi. Şamaxıda bütün mədrəsə öyrənciləri və öyrətmənlərini öldürüb şəhəri yaxdı. Şirvanşah Fərrux Yəsar bu məğlubiyətdən sonra Gülüstan* qalasına sığınaraq Sultan Yaqubdan yardım istədi. Sultan Yaqub

* 1813-cü ildə Rusiya-İran arasında imzalana "Gülüstan anlaşması" burda imzalanmışdır.

gecikmədən Şirvana ordu göndərdi. Təbrizdən gedən ordu Təbərsəranda (Cüneydin öldüyü yerdə) Şirvanşahların ordusuna qovuşdu. Qızılbaşların Sultan Yaqubla Şirvanşahların birləşik orduları ilə savaşı başladı. Qızılbaşlar öncə birləşik ordulara böyük zərər verdilər. Savaşın tam ortasında Heydər oxlanıb öldü.[135] Başsız qalan qızılbaşlar fərar etməyə başladılar. Sultan Yaqubun ordusunun başçısı Şeyx Heydərin başını kəsib Təbrizə apardı. Fərari qızılbaşlar da Anadoluya geri dönmək zorunda qaldılar. Şeyx Heydər Şirvan əhalisinə çox zərər vermişdi. Şirvan əhalisi də Heydəri Sultan Yaqubun adamı bildiklərindən bayındırlı şahını əsas sorumlu olaraq görürdülər. Sultan Yaqub, Şirvan əhalisinin bu güvənsizliyini ortadan qaldırmaq üçün Heydərin kəsik başının Təbrizdə dolaşdırılmasına əmr verdi. Daha sonra hər kəsin görməsi üçün kəsik başı şəhərin ortasında bir dirəyə taxdılar. Bu olaydan sonra Sultan Yaqubun əmri üzərinə Ərdəbil xanigahı qapatıldı. Sultan Yaqubun ögey bacısı olan Şeyx Heydərin qadını Aləmşah üç oğlu ilə bir yerdə (Əli, İbrahim, İsmayıl) Təbrizə aparıldılar. Təbrizdən də Şirazın İstəxr qalasına sürgün edildilər.[136]

---

135 Şərəf Xan Bitlisi “Şərəfnamə” Əsatir yayınları Tehran, 2-ci cild, s. 133.

136 Şərəf Xan Bitlisi “Şərəfnamə” 2-ci cild, s. 133-134.

## Şah İsmayıl

1491-ci ildə Təbrizi sarmış olan vəba xəstəliyi bir çoxlarının, o cümlədən Sultan Yaqubun da canını aldı. Yaqubun ölümündən sonra varislik savaşı başladı. Dövlət öz sabitliyini itirdi. Öncə Sultan Yaqubun böyük oğlu Baysonqur taxta çıxdı. Ona qarşı üsyan edən Məsih Mirzə Bayındır öldürüldü. Yaqubun qardaşı oğlu Mahmud Mirzə Həmədandakı savaşda öldürüldü. Mardin hakimi olan Süleyman bəy Bayındır Baysonquru yenib Təbrizdə özünü Azərbaycanın şahı duyurdu. Uzun Həsənin nəvəsi Rüstəm bəy də səltənət iddiasında idi. Süleyman bəy onunla da savaşa girdi, ancaq yenildi və öldürüldü. Bu arada Şirvana qaçmış olan Baysonqur özünü toparlayıb yenidən Təbrizə saldırdı. Ancaq Rüstəm bəy qarşısında yenilib yenə də fərar etdi. 1493-cü ildə Rüstəm bəy Təbrizdə özünü Azərbaycanın şahı olaraq duyurdu. Səltənət iddiasında bulunan başqa Bayındır soylular da var idi. Daha öncə Məsih Mirzəni savunan Uzun Həsənin nəvəsi Əhməd bəy Osmanlıya fərar edərək orada özünü toparlamağa çalışdı. Baysonqurun qardaşı Murad bəy Şirvana qaçıb qardaşına qovuşub Təbrizə saldırmaq üçün hazırlıq işinə başladılar. Uzun Həsənin nəvələri Məhəmməd bəy və Əlvənd bəylər də Bayındırlıların bir bölümünün dəstəyi ilə səltənət iddiasındaydılar. Bütün Azərbaycanda sabitsiz bir durum var idi, xalq güvənsizlik içində idi. Bu

iç savaşlar iqtisadiyatı çökərtdi, tarım bərbad duruma düşdü. Ticarət həyatı axsadı. Hər iqtidar iddiaçısının xalqdan aldıqları ağır vergilər dözülməz durum yaratmışdı. Gündən günə xalq yoxsullaşırdı. Ən önəmlisi isə, bu iç savaşlarla zəifləyən Azərbaycana qızılbaşların geri dönmələri üçün imkan yarandı. Rüstəm bəy Şeyx Heydərin müridlərinin imkanlarını rəqiblərinə qarşı qullana bilmək üçün Sultan Yaqub zamanında İstəxrqala´ya sürgün edilən Heydər ailəsinin Təbrizə geri dönmələrini istədi. Qızılbaşları Azərbaycana çəkib güclərindən yararlanmaları üçün Heydərin oğlu Şeyx Əlini Ərdəbil xanigahının başına gətirdi. Anadoluda dağınıq şəkildə yaşayan qızılbaşlar Şeyx Heydər ailəsinin azadlıq xəbərini duyar-duymaz Ərdəbilə axın etdilər. Rüstəm bəy qızılbaşları rəqiblərinə qarşı qullandı. Şeyx Əlini qızılbaş ordusuyla bir yerdə Baysonqurla savaşmaq üçün Şirvana göndərdi. Baysonqur yenilib öldürüldü. Qızılbaşların bu uğuru Rüstəm bəyin əlini bərkitdi, bu üzdən onların Ərdəbildə sərbəst davranmalarına izn verdi. Azərbaycanın yerli mədəniyətini anlamayan qızılbaşlar xalqı talamaqda sərbəst buraxılmışdılar. Yeyəcəklərini təmin etmək üçün tək yol yerli xalqa saldırmaq, mallarını yağmalamaq idi. Özəlliklə sünni xalqın malları onlar üçün halal edilmişdi. Azərbaycana sırf savaşmaq üçün gələn qızılbaşlar yerli mədəniyəti məhv etməsəydilər özlərinə yer edə bilməzdilər. Azərbaycanın yüzillər boyunca şəkillənmiş olan yaşam biçiminə yabancı idilər. Yerli mədəniyətin şəkillənməsində əməkləri keçməmişdi. Anadolunun bozqırlarındakı

aqressivlik, damalarında qaynamaqda idi. Bunun üzərinə bir də “cihad” aqressivliyi əkləndiyi üçün hər tür cinayətə əl atmağa hazır durumdaydılar. Mürşidlərinin tək əmri bunun üçün yetərli idi. Qızılbaşların yağmalama saldırılarının həddi aşmışdı. Bu üzdən də onların Azərbaycana yerləşməsinə izn verən Rüstəm bəy qarşılarında durmalı idi, yoxsa xalq bezmişdi. Rüstəm bəy Əli və qardaşlarını Təbrizə aparıb kontrol altında tutdu. Ancaq 1493-cü ildə bir neçə qızılbaş Əli və iki qardaşını oğurlayıb Təbrizdən qaçırdılar. Rüstəm bəy onları yaxalamaq üçün arxalarınca ordu görəvləndirdi. Ərdəbilin yaxınlığında olan Şaməsbi adında bir kənddə qarşılaşdılar. 300 nəfərdən ibarət olan qızılbaşlar Əli və qardaşlarını verməmək üçün savaşdılar. Bir neçə adamı öldürdülər. Savaşın davamında Əlinin öldürüldüyünü yazırlar. Bitlisi və İskəndər bəy Türkmən Əlinin bu savaşda öldürüldüyünü yazmışlar.[137] Eşitdiklərini yazmışlar. Ancaq Əlinin bu savaşda sirli ölümü izah edilməmişdir. O zaman Səfəvi soyunun tanınmış adlarından biri olan Şeyx Əlinin ölümü haqqında ayrıntılı bilgi verilməmişdir. Şərəfxan Bitlisi Əlinin bu savaşda öldüyünü bir tək cümlə ilə yazar. İbrahim və İsmayılı qızılbaşlar Ərdəbilə aparıb güvənli yerdə gizlətdilər. Ancaq arxalarınca ordu olduğu üçün iki qardaşı aparıb Rəştdə gizlətdilər. İki qardaş Rəştdə yaşlı bir qadının evində qaldılar, daha sonra “Nəcm” adında qızılçı bir sənətkarın evində gizləndilər. Daha sonra Lahicana

[137] Bitlisi “Şərəfnamə” 2-ci cild s. 134.

yerləşdilər və İsmayılı Lahicanın zeydi şiə hakimi "Karkya Mirzə Əli"yə[138] tapşırdılar. Bu adamın Şeyx Zahid Gîlâni xanigahının müridlərindən olduğunu yazırlar. Şeyx Səfi nəvələri həm də Şeyx Zahid Gîlâninin qız nəvələri sayılırdı. Gîlâni xanigahına bağlılığından dolayı bunlara sahib çıxmış ola bilər. Ya da tarix üçün bilinməz olaraq qalan bir ön plan da söz qonusu ola bilər. Çünkü bir dövlətin axtardığı çocuqlara sahib çıxmaq və bu üzdən bir dövlətlə qarşı-qarşıya gəlmək ön plansız olamaz. Karkyanın da qızılbaşları öz amacları yolunda qullanma kimi bir planı nədən olmasın ki? Səfəvi tarixinin ən qaranlıq bölümü də burasıdır. Bundan sonra İsmayılın böyük qardaşı İbrahimdən xəbər çıxmamışdır. İskəndər bəy Türkmən onun Ərdəbilə geri döndüyünü yazar. Ancaq geri dönmüşsə, onun həyatı necə olmuş? Ona qızılbaşların və Ərdəbil xanigahının münasibəti necə olmuşdur? Bu haqda heç bir bilgi yoxdur. Necə yaşayıb öldüyü tamamən tarixin sirləri içində. Ən çox şübhə oyadan da bu bölümdür. Şeyx Heydər soyundan olan İbrahim Mirzə kimsənin diqqətini çəkməmişdir. Bitlisi, İbrahimi İsmayılın böyük qardaşı olaraq yazar. Nədən böyük qardaşa diqqət edilməmişdir? İskəndər bəy Türkmən, Şeyx Əlinin ölmədən öncə başındakı sülalə tacını çıxarıb İsmayılın başına keçirdiyini söylər və Şah İsmayılı vəliəhd və qaimməqam elan edər.[139] Şeyx Əli ölmədən öncə tarixi sir"lərini İsmayılın qulağına

[138] Bitlisi "Şərəfnamə" 2-ci cild s. 134.
[139] Iskəndərbəy Türkmən "tarixi-Aləmaraye- Abbasi", təcümə edən Şahin Fazil, Şərq-Qərb Bakı 2010, s 77.

pıçıldayaraq bu sirri ona əmanət edər! Xətailər şeirində də sıx-sıx keçən bu sirrin nəliyi haqqında bir az bilgi verib sonra davam edəlim.

səfəviyənin "sirri" olaraq bilinən və imamlardan onlara qədər davam etdiyi iddia edilən bu sözdə sirrin nə olduğu ilə ilgili oxucuların bilgilənməsində yara var. Bir çox təriqətlərdə, o cümlədən hürufilərdən səfəviyəyə də keçən bu sirrin adı **cefr** elmidir. Guya Hz. Peyqəmbər buzov dərisinə bəzi vəhy bilgilərini və Quranın batini sirlərini yazıb Hz.Əliyə vermiş və Əlidən də əhli-beytə və əhli-beytdən onların davamçılarına intiqal etmişdir. Bu təriqətlər, olayı öyləsinə nəql edərlər ki, sanki peyqəmbər Əliyə bu buzov dərisini verərkən onlar öz gözləri ilə görmüşlər. Hz. Əli isə, böylə iddiada bulunmamışdır. "Cefr" ərəbcədə buzov deməkdir. Ibni-Xəldun isə, yayqın anlayışın tərsinə olaraq cefrin bir elmi disiplin adı deyil, bireysəl yetənək olduğunu savunar və bunun sezgi və ilhamla ilişkisi üzərinə durar. Cefr, əslində Tövratın batini yorumları üzərində duran **kabala** elmindən etkilənmənin adıdır. İsmailiyə və ixvan-üs səfa açıqlamalarında cefr batini yorumların təməl qaynağı halına gəlmişdir. Təriqətlərcə cefr gələcəyin bilgisini içərən tanrısal bilim dalı kimi qəbul edilmişdir. Gələcəklə ilgili bilgilərin əhli-beytə vasitəsiz olaraq bağışlandığını savunan şiələrə görə cefr ilahi elm və peyqəmbəranə hikmətin ürünüdür. İmam Məhəmməd Qəzzali cefr elmini tənqid edər. Bunun bir xurafə olduğunu söylər. Qurana görə qeybə aid olan xəbərlərin qaynağı vəhydir. Şiəyə görə Hz.

Peyqəmbər kəndisinə gələn vəhylərin bir qismini, yalnız Hz. Əliyə bildirmiş. Bu səbəbdən Əlinin də bilgiləri vəhyə dayanmaqdadır. Bu da peyqəmbərə nazil olan vəhy bilgilərinin hamısının Quran yolu ilə xalqa duyurulduğu ilkəsi ilə çəlişməkdədir. Cefr elminin peyqəmbərdən əhli-beytə gizlin yolla verildiyi haqda heç bir tarixi bəlgə mövcud deyildir. İmamlar bilə bu haqda heç bir bilgi verməmişlər. Sadəcə Cəfər Sadiqin öyrəncilərindən biri bu iddiada bulunmuş və bu iddialarından dolayı da Cəfər Sadiq onu özündən uzaqlaşdırmışdır. Cefr olayının İsmailiyə tərəfindən İslam tarixinə soxulduğu anlaşılmaqdadır. Qəzzaliyə görə hərflərin və rəqəmlərin İslamiyətdə özəl anlam daşımalarının heç bir tutarlı dəlili olmamışdır. Əski Sasani nostaljisi ilə ortaya çıxmış olan Hürufi kimi bəzi təriqətlərə görə cefr elmi Adəmdən başlamış Hz. Məhəmmədə qədər bütün peyqəmbərlərə verilmişdir. Fəzl də bu ilahi elmdən nəsib alıbmış. Mötəzilə məzhəbinin Bağdad məktəbinin qurucuları şiəni anlamsız cefr elmi ilə uğraşmaqla suçlar. İbni Xəldun bəzi rəvayətləri nəql edər. Guya Harun-ul Rəşid və Məmun Abbasi xilafətinin yazqısı ilə ilgili cefr elmini bilən münəccimlərinə bir kitab yazdırar və bu kitab Moğol saldırısında yox edilər.[140] Bu gərəkli bilgidən sonra davam edəlim.

İsmayıln varis seçilməsi və İbrahimin yoxa çıxmasının tək səbəbi bumu? İbrahimdən xəbər

[140] Diyanet İslam Ansklopedisi. http://www.filozof.net/Turkce/islam-felsefesi/11808-cefrcifir-ilmi-nedir-tarihi-ozellikleri-hakkinda-bilgi.html

çıxmamışdır. Ancaq yoxa çıxan sadəcə İbrahim deyildir. “Əhsən-üt təvarix”in yazarı Həsən Rumlu İbrahimdən başqa dörd qardaşının daha İsmayılın yanında olduğunu yazar. Böyük olasılıqla İsmayılın bu dörd qardaşı Heydərin digər qadınından olmuşlar. Burada təqib edilən, sadəcə İsmayıl deyildi. Bəlkə də bu ailə yaxalansaydı çox kiçik yaşda olduğundan dolayı İsmayılla işləri olmazdı, ancaq daha yaşlıları öldürə bilərdilər. Heydərin bütün çocuqları aranırdı. Ancaq tarixi öyləsinə quraşdırmışlar ki, sanki bir anın içində hər kəsə qeyblərdən xəbər gəlmiş və Heydər ailəsinin içindən, ancaq İsmayılın gələcəkdə şah olacağı duyurulmuş! Bütün bunlar ortadakı bir sirrin gizlənməsi və ifşa edilməməsi üçün deyilmi? Həsən Rumlunun “Əhsən-üt təvarix” əsərinin ikinci cildinin 907-ci səhifəsində İsmayılın digər dörd qardaşları haqqında verdiyi bilgini olduğu kimi yazalım: “Bu səfərdə İsmayılın digər dörd qardaşı Seyid Həsən Mirzə, Seyid Süleyman Mirzə, Seyid Davud mirzə, Seyid Mahmud Mirzə yanındaydılar. Bəziləri qardaşlarının Rəştdə ona qatıldıqlarını yazarlar. Bəziləri isə, bu dörd qardaşın bir yerdə Çiçəkli adlanan Ağdağda İsmayıla qatılıb Rəştə yollandıqlarını söylərlər. Bu yolçuluqda onların yanında olayı anladacaq kimsə olmamışdır. Ancaq doğru olan budur ki, İsmayıl qardaşları ilə bir yerdə Rəştdə Ağməscidə gəldilər.”[141] Daha sonra nə bu dörd

---

141 Əhsən-üt təvarix, 2-ci cild, Hazırlayan Əbdülhüseyn Nəvai, Əsatir yayınları, s. 907.

احسن التواریخ» جلد دوم صفحه 907«

نویسنده: حسن بیگ روملو

qardaşdan, nə də İbrahimdən əsla xəbər çıxmamışdır. Hər bir Səfəvi soyu haqqında ayrıntılı bilgi varkən, İsmayılın beş qardaşı ilə bağlı heç bir bilgi yoxdur. Böylə bir sual ortaya çıxır: Əcəba, daha sonra Şah İsmayıl olaraq tarixə girən adam gerçəkdən Heydərin oğlu olan İsmayılmı, yoxsa bir başqasını "mehdi" bəkləyən qızılbaşlara sunmuşlar? Səfəvi tarixinin bu gizlin qatı böylə bir şübhə oyandırır. Əcəba, onların altısını da yox edib başqa bir adamımı tarixə Şah İsmayıl adına soxmuşlar? Nədən İsmayılın qardaşları haqqında tarixdə bilgi yoxdur? Qardaşların başına nə gəlmişsə, bu, təqribən altı illik Gîlân həyatında gəlmişdir. Çünkü daha sonra İsmayıla aid edilən şeirlərdə çox yerdə "Heydər oğluyam"** ifadəsinə rastlanılacaqdır. Anlaşılan odur ki, o zaman da İsmayılın Heydər oğlu olub olmadığına şübhə var imiş. Bu şübhədən sonra daha sonrakı Şah İsmayılın Heydərin oğlu olduğunu var sayaraq bu macəraya davam edəlim.

İsmayıl 1487-ci ildə Ərdəbildə dünyaya gəlmişdi. Anası Uzun Həsənin qızı Aləmşah

---

باهتمام: عبدالحسين نوايى
انتشارات اساطير

** Şah İsmayılın şeirlərində atasının Heydər olduğu vurqulanan bir çox bəndlər var. Onlardan bir neçəsi:
1-Mənəm sultan Xətai Heydər oğlu,
Mənim yolumda ğovğalar gərəkdir.
2-Mənəm bunda Xətai Heydər oğlu,
Şu Ismayıl kimi qurbanə gəldim.
3-Xətaiyəm özüm Şah Heydər oğlu,
Bu mehri görməsən sən dan içində!
4-Səfi nəsli Cüneydi-Heydər oğlu,
Əliyyəl-Murtəzaidir Xətai.

xanımdır. Nənəsi Trabzon imperatorunun qızı Despinadır. Despina ömrünün sonuna qədər xristian qalmış, qızı Martanı (Aləmşah) da xristian ruhunda böyütmüşdü. Diyarbəkirə gəlin gəldiyində yanında dini fərizələrini yapmaqda yardımçı olacaq keşiş də gətirmişdi. Diyarbəkirdə bir kilsə təsis etmiş, hər bazar günü orada ibadət edirdi. Başkənd Təbrizə daşındıqdan sonra da Despina Təbrizdə bir kilsə yapdırar. O zaman daha çox erməni nüfusu olan Ərzincanda da iki kilsə təsis etdi. Uzun Həsən də Azərbaycanın Təbriz, Əbhər və Tərcan şəhərlərində birər cami yapdırdı.[142] Despinanın ilk doğurduğu çocuq oğlan idi. Maqsud adındakı ilk beşiyini gələcəkdə ölkənin padşahı etməyi planlamışdı. İsmayılın anası Marta (Aləmşah) çocuq yaşlarında olduğunda sünni Osmanlılar onun ana yurdu Trabzonu işğal etmişdilər. Daha sonra qardaşı Maqsudu Xəlil və Yaqub şahzadələr öldürmüşdülər. Daha sonra Sultan Yaqub ərini öldürmüş kəsik başını Təbrizdə dolaşdırmış və onu da çocuqları ilə bir yerdə Şiraza sürgün etmişdi. Böyük oğlu Əli, Rüstəm bəy Bayındırlı tərəfindən öldürülmüşdü. Oğlu ilə bir yerdə Lahicanda gizlənmək zorunda qalmışdı. Bütün bu olaylar onda sünnilərə qarşı dərin nifrət duyqusu oluşdurmuşdu. Həm Osmanlı, həm də Bayındırlı onun düşməni və ərinin müridləri olan qızılbaşlar onun dostları sayılırdı. Tək ümidi qızılbaşların imkanlarına dayanaraq ailəsinin intiqamını almaq idi. Bu ruh halı ilə İsmayılı tərbiyə edirdi. İsmayılı Heydərin

[142] Valter Hins s. "İranda Milli Dövlətin təşkili" 142-143.

yeddi seçkin xəlifəsi Lahicana qaçırıb Karkyanın evində gizlətdilər. Karkya həm Gîlâni xanigahına mənsub idi, həm də Rüstəm bəy Bayındırla arası yaxşı deyildi. Karkya şiə olduğundan özlərini şiə olaraq tanıdan qızılbaşlara yaxşı davrandı. Qızılbaşlıq və zeydi şiəsi arasında ortaq bir şey yox idi. Ancaq qızılbaşların təqiyəsi bu fərqin ortaya çıxmasını önləməkdə idi. Bu üzdən də Karkya onları şiə olaraq qəbul etmişdi. Ən önəmlisi isə, İsmayılın burada ələvi-bəktaşi deyil, bir şiə olaraq eyitilməsi planı idi. İsmayıl burdakı eyitimi sonucunda daha sonra ələvi-qızılbaşları da aldadacaqdı, onları şüubiyənin siyası amacları yolunda qullanacaqdı. Çünkü qızılbaşlıq və şiə bir-birini qəbul etməzlər. Ələvi-şiə arasında böyük fərq vardır. Qayqusuz Abdal kimi ələvi ozanlar şiəyə qarşı şeirlər yazmışlar. İsmayıl isə, ələviliyi deyil, şüubiyə şiəsini ölkədə tətbiq etmişdir.

İsmayılı ta çocuqluqdan qızılbaş müridlər “şah” adlandırırdı. Bədrəddin sonrası onlar öz şeyxlərinə “şah” və “sultan” deyirdilər. Bu ləqəblərin o zamanlar siyasi anlamı yox idi. “Şah” ləqəbi bu dönəmdə bəzi sufi cərəyanlarına məxsusdur. “Şah Nemətulla Vəli” kimi şair sufilərə də bu ləqəb taxılmışdı. Şiənin 8-ci imamına da “şah” ləqəbi taxılmış və “şahi-qəriban” olaraq nitələnmişdir. Əbutaliboğlu Əliyə də şah ləqəbi taxılmış və ona “şahi-vilayət” demişlər.

“Şah İsmayıl”ı Lahicana aparan yeddi qızılbaş bunlar olmuşlar:

- Şamlu Hüseyn bəy Lələ- İsmayılın mənəvi atası və savaş fənlərini öyrədən eyitməni.

- Xadim bəy- Cüneydin və Heydərin özəl xəlifəsi.
- Qara Piri Qacar- Mücahid qızılbaşların komutanı.
- Rüstəm bəy Qaramanlı.
- Bayram bəy Qaramanlı.
- Əbdüləli bəy Dədə- Şeyx Heydərin özəl eyitməni.
- İlyas bəy Ayqutoğlu

Bunlar ümumən Anadolu türkmənləri olmuş. Ailələri Azərbaycanda olmamışdı. Karkya sarayının bir bölümünü bunlara buraxdı. Heydər oğullarının Lahicanda yerləşməsinin xəbərini alan Rüstəm bəy onları geri almaq üçün elçilər göndərdi. Karkya İsmayılı bir səbədə qoyub ağacdan asdı. And içdi ki, onların ayağı bu tərəflərə dəyməmişdir. Böyləcə İsmayıl təhlükədən canını qurtardı.[143] İsmayılın digər qardaşlarından yenə də xəbər yoxdur. Nədənsə axtarılan, ancaq və yalnızca İsmayıldır!
Azərbaycanda iqtidar savaşları başladığı üçün İsmayıl azadlığına qovuşdu. İsmayılı yetişdirən yeddi xəlifənin adı “ixtisas əhli” idi. Anadoluda Şah İsmayıl üçün müridlər toplama işlərini də sürdürməkdəydilər. İsmayılı gələcəyin hərbi, fikri və siyasi öndəri kimi hazırlamaqdaydılar. İsmayılın təhsili üçün Molla Şəms adında bir öyrətmən tapdılar. İskəndər bəy Türkmən Şah İsmayılın çocuqluğu haqda yazır: “O zaman İsmayılın yaşı yeddi də deyildi. Ancaq çox istedadlı idi. Sifətində şahlıq iqtidarı parlayırdı. Onu tərbiyə edən müəllimləri də İsmayılın

[143] Əhsən- üt təvarix 9.

varlığındakı istedadı görür və ona qeyblərdən yardım edildiyini düşünürdülər.”[144] İsmayıl qızılbaşların Allahı durumuna gəlmişdi. Qızılbaşlar ona tapınırdılar. Gizlincə Anadoludan onun ziyarətinə uğrayan qızılbaşlar nəzrlərini və hədiyələrini ona sunurdular. Qızılbaşların bu şəkildə davranması çocuq yaşda olan İsmayılda Tanrı olma düşüncəsini oyandırdı. İsmayıl özü də inanırdı ki, ona göylərdən yardım edilməkdədir. Atalarının kafir sünnilər tərəfindən öldürüldüyü düşüncəsini həm anası, həm də ixtisas əhli onun ruhuna əkmişdilər. Kərbəla olayında da “sünnilərin!” imam Hüseynə necə acı çəkdirdiklərini çocuğa ayrıntılı olaraq anlatmışdılar. İsmayıl çocuqkən bu qərara gəlmişdi ki, bütün sünnilər tarix boyu peyqəmbərin, imamların və onun öz atalarının düşmənləri olmuşdur. Daha sonra onun bu düşüncəsi ona aid edildiyi söylənən şeirlərdə açıqca görünəcəkdi. Əli soyu ilə uğraşanların sonunun çətin olacağını yazacaq və hətta Səlimə yazdığı bir məktubunda bunu açıqca dilə gətirəcəkdi. Sünni Osmanlını Əli düşmənliyi yapmaqla suçlayaraq onun dağılmasını yazacaq. Qutsal soya dayandığı üçün yenilməz olduğuna özü də iman gətirmişdi. Onunla uğraşacaq olanların yenilib cəzalanacağına inanmışdı.*

[144] İskəndərbəy Türkmən “tarixe-aləmaraye- abbasi”, Əmirkəbir yayını Tehran 1972, s. 25.

* Şah İsmayılın Səlimə yazdığı son məktubunda bu görüşü yansıdan farsca bir şeiri bu şəkildədir:
“Bəs təcrübə kərdim dər in deyiri-mükafat
Ba ali-Əli hər ke dər oftad, bər oftad”
Tərcüməsi belədir: Bu mükafat dünyasında çox təcrübə etdik bunu ki, Əli soyu ilə kim uğraşdıysa

Hafiz Şirazidən bir şeir çalaraq bunu Sultan Səlimə yazdığı məktubda dilə gətirər. Sünni onun xəyalında qorxunc bir yaradılışı xatırladır. Məhv edilməsi gərəkən qorxunc yaradılış. Sünnilərin paltarlarının altında quyruqlarının olduğuna da inandırılmışdı.[**] Çocuqluğundan etibarən öldürməyi məşq etməyə başlamış. Çocuqluqda ördəkləri, qazları, toyuqları oxlayıb öldürərək ox atmağı məşq edirdi. Ancaq öldürdüyü ördəklərin, qazların və toyuqların qarşılığını ödəyirdi.[145] Yeniyetməliyinin ilk vaxtında bəzən ov əyləncəsi ilə məşğul olub, Simamı, Əşkuru və o vilayətin mənzərəli yerlərini gəzərdi. Sürəkli dünyanı idarə etmək arzusu onun ürəyində yaşayır, öz himmətinin yüksəklərdə uçan şahinini məmləkət quzğununu şikar etmək məqsədi ilə uçururdu.[146] Qızılbaşlar ona Kərbəla və Cüneydlə Heydər haqqında mərsiyə söyləyib ağlaşır, sünnilərə lənət göndərirdilər. Sünnilərdən intiqam almaq üçün Allahın yardımını bəkləyirdilər. Qızılbaşların bu davranışları İsmayılı sünnilərdən intiqam almağa həvəsləndirirdi. Gecələr anasından və gündüzlər qızılbaşlardan eşitdiyi sünni düşmənliyi ilə bağlı

---

cəzalandı.
Hafiz şeiri də belədir:
Bəs təcrobə kərdim dər in deyre mükafat
Ba dordkeşan hər ke dər oftad, bər oftad.

[**] Səfəvilərdən qalan iki miras bu gün də İranın şiə kəndlərində yayqındır:1- Ayişənin əxlaqsız olduğu. 2- Sünnilərin quyruqlu olmaları.

[145] Cəvahir ul əxbar, Budaq Qəzvini.

[146] Iskəndərbəy Türkmən "tarixi-Aləmaraye- Abbasi", təcümə edən Şahin Fazil, Şərq-Qərb Bakı 2010 s. 65-66.

nağıllar çocuğun ruhunu nifrət və intiqam duyqusu ilə doldururdu. İsmayıl böyüdükcə yaraşıqlı görünüşü və iradəsi ilə qızılbaşları ümidləndirirdi. Qızılbaşlar onu canlı Allah kimi görürdülər. İsmayılın yanında olan yeddi ixtisas əhli qızılbaşların daha öncədən savaşçılıq təcrübələri də olduğundan ona savaşın bütün tekniklərini öyrədirdilər. "Ovçuluğa çıxdığı anlarda bilə, cahangüşalıq xəyallarından vaz keçmirdi."[147]

İsmayılın hazırlaşdığı bu dönəmdə Azərbaycanda bayındırlıların iqtidar savaşları davam edirdi. Yenilərək Osmanlıya qaçan Əhməd bəy Bayındır ordu düzənləyib Azərbaycana saldırdı. Rüstəm bəyin ordusunun bir qismi də Əhməd bəyə qatıldığından Araz çayının kənarında baş verən savaşda Rüstəm bəy yenilib öldürüldü. Əhməd bəy Təbrizdə özünü şah elan etdi. Rüstəm bəyə ihanət edənlərdən biri Əyyübə Sultan idi. Əhməd bəy ona verdiyi sözü yerinə gətirmədiyi üçün Əyyübə Şiraza gedib Qasım bəylə bir yerdə Əhməd Şaha qarşı savaş açdı. İsfahan yaxınlığında baş verən savaşda Əhməd bəy öldürüldü. Onlar Murad bəyi Təbrizə dəvət etdilər ki, Şirvandan Təbrizə gəlib dövlətə sahib çıxsın. Murad bəy Təbrizə gələrkən yaxalanıb zindana atıldı. Bu zaman Məhəmmədi bəy qiyam edib Təbrizi alaraq özünü şah elan etdi. Əlvənd bəy də özünü Diyarbəkirdə şah elan etdi. Əlvənd bəy Məhəmmədi bəyi yenərək özünü

---
[147] Cahangüşayi xaqan, Iskəndərbəy Türkmən "tarixi-Aləmaraye- Abbasi", təcümə edən Şahin Fazil, Şərq-Qərb Bakı 2010 s. 80.

Azərbaycanın şahı duyurdu. Məhəmmədi bəy İsfahana geri çəkildi. Əyyübə özünü İsfahanın hakimi sandığı üçün ona qarşı savaş açdı. Bu savaşda Əyyübə öldü. Zindanda olan Murad bəy qaçaraq Şirazı alıb orada özünü şah elan etdi. Məhəmmədi bəyi öldürüb Təbrizə yönəldi. Bu savaşlar bayındırlıları çökərtmişdi. Murad bəylə Əlvənd bəy savaşa girmədən öncə bayındırlı ağsaqqalları barış üçün araya girdilər. Başlanan müzakirədə Əbhərdə bir anlaşma imzalandı. Bu anlaşmaya görə Təbriz mərkəzli Muğan, Aran, Azərbaycan və Diyarbəkir Əlvənd bəyə buraxıldı. Şiraz mərkəzli İraq torpaqları da Murad bəyə buraxıldı. Qızılüzən çayı bu iki ölkənin sınırı təyin edildi.[148]

## Şüubiyə

637-ci ildə müsəlman ərəblərlə Sasani orduları arasında Qadisiyyə savaşı başladı. Bu savaş 3-4 gün davam etdi. Savaşın son günündə qorxunc külək əsib qum fırtınasını Sasani ordularına doğru apardı. Ərəblər bunu Tanrı yardımı olaraq anlayıb daha da həvəsləndilər. Sasani ordularının başında Rüstəm Fərruxzad adında bir komutan durmaqda idi. Bu savaşda Sasani orduları yenildi. Rüstəmin yenilgə

[148] Həbib-üs seyr 446.

xəbərini duyan şah başkənd Tisfun´dan Zaqros dağlarına fərar etdi. Başkəndin ərəblərə təslimi ilə bağlı bir anlaşma olmadığından şəhər yağmalandı, əhali öldürüldü. Diri qalanlar da kölə bazarlarına aparıldı. Ərəblər ölkənin içlərinə doğru irəlilədilər. Həmədanın güneyində Nihavənddə son savaş başladı. Nihavənd savaşında da Sasani komutanı Firuzan öldürüldü. Sasani şahı sürəkli qaçmaqda idi. Çünkü vardıqları yerlər ərəb orduları tərəfindən işğal edilirdi. Ordularını itirmiş və yalnız qalan Yəzdgərd bir dəyərmançıya sığınar. Dəyərmançı onun üzərindəki cəvahirləri əldə etmək üçün yatdığı yerdə Sasani şahını öldürər. 651-ci ildə Sasanilərin son padşahı Yəzdgərd də öldükdən sonra Sasani dövlətinin həyatına son verildi.[149] Qadisiyyə savaşına qədər farslar ərəblərin əfəndisi idi. Qadisiyə savaşında Sasanilər devrildikdən sonra ərəblər farsların əfəndisi oldular.[150] Sasani imperatorluğunda islamlaşma başladı. Ancaq bu yenilgənin təsirini farslar unutmaq istəmədilər.[151] Ərəb saldırısı və Sasani yenilgəsi ilə böhran keçirən fars kimliyi yeni bir kimlik arayışı içinə girdi. Əməvilərin sonlarına doğru fars milli kimliyi mərkəzli milli İslam

---

[149] Petruşevski "İranda İslam" Farscaya çevirən Kərim Kəşavərz, Pəyam yayınları, Tehran 1363 (h.ş) s. 41, 42, 43.

[150] Mustafa Kılıçlı, Arap Edebiyatında Şuubiyye, İşaret yayınları, 1-ci baskı, 1992- Ankara, s. 37.

[151] Petruşevski "İranda İslam" Farscaya çevirən Kərim Kəşavərz, Pəyam yayınları, Tehran 1363 (h.ş) s. 41, 42, 43.

oluşdurma çabaları başladı.[152] Bu mövzunu davam etmək üçün bir az ərəb tarixi və toplumsal psixolojisi üzərində durmaq gərəkəcək.

Ərəblər arasında birisi suç işlərsə, bütün qəbilə o suçu üzərinə alırdı. Qəbilə, suç işləyən bir fərdini himayədən vaz keçərlərsə, o kimsə başqa qəbiləyə sığınar və kəndini o qəbilənin bir fərdiymiş kimi sayardı. Bu devirdə ərəblərin vətəndaşlığı milliyət vətəndaşlığı deyil, qəbilə vətəndaşlığı idi. Ərəblərdəki bu qorunma və qoruma üçün qəbiləyə bağlanma şüuru **əsəbiyət** olaraq anılırdı.[153] Cahiliyə ərəblərində əsəbiyət qəbilənin ruhuydu. Bu da qəbiləyə və qəbilə mənsublarına sınırsız və şərtsiz bir sədaqət göstərərək aşırı bir tutquyla bağlanmaqdan ibarətdi. Onlarda qəbiləyə bağlılıq və sədaqət, ər-arvadın bir-birlərinə olan bağlılıq və sədaqətindən fərqsiz idi… Fərd daima, qəbilənin başarısının kəndi başarısı olduğunu düşünürdü.[154] İslam öncəsindəki bu baxışa görə ərəb milləti, bütün millətlərin ən əsilidir. İslamiyətin gəlişindən sonra isə, bu baxışın yerini təqvada üstünlük fikri almış, irq yerinə iman və fəzilətə böyük önəm verilmişdir. Xüsusən səhradakı bədəvilərin qürurlu, yüksəkdən baxış açısına görə, yerləşik həyat

---

[152] İgnac Goldziher "İranda İslam"

[153] İslam Milletleri ve Devirleri Tarihi, s. 4; Ferec-ul islam, s. 10; Mustafa Kılıçlı, Arap Edebiyatında Şuubiyye, İşaret yayınları, 1-ci baskı, 1992- Ankara, s. 27.

[154] Mustafa Kılıçlı, Arap Edebiyatında Şuubiyye, İşaret yayınları, 1-ci baskı, 1992- Ankara, s. 28.

sürən mədəni insan daha az mutlu və daha aşağı idi. Qanlarının saflığında, fəsahət və bəlaqətlərində, şeir sənətlərində, qılıc və atalarında, hər şeydən ötə əsil soy və nəsəblərində ərəblər sonsuz bir iftixar duyurdular. Onlar uzayıb gedən fövqəladə nəsəb şəcərələrindən son dərəcə xoşlanır və genəlliklə bunu Hz. Adəmə qədər aparırdılar. Ərəblərdən başqa heç bir millət nəsəb qonusunu bir elm dərəcəsinə çıxarmış deyildir.[155] İbni-Xəldun, əsəbiyətin insan fitrətindəki təbii özəlliklərdən biri olduğunu, nəsəbin uzaqlığı və yaxınlığı ilə çoxalıb azaldığını, ərəblərin o devirdəki həyatlarına damqasını vuran şeyin, onların qıtlıq və məşəqqət içindəki yaşantılarının, susuz və çöl halındakı vətənlərinin, sürəkli köçlərinin olduğunu; bu həyat şərtlərinin onlarda bir dostluq və yaxınlıq havası yaratdığını söylər.[156] Ərəblərdəki əsəbiyət şüuru o qədər yüksək olmuş ki, qzılarını bilə Sasani şahlarına vermək istəməmişlər. "Numan ibni əl- Munzir qızına elçi gələn Sasani padşahının elçilərinə rədd cavabı verərək "əcəmlərlə evlilik qonusunda ərəblərin çəkingənliyi var" söyləmişdi."[157] Əməvilər devrində ərəblərə müxalif bir hərəkət haqqında şüubi və ya şüubiyə ləfzinin qullanıldığı

[155] İslam tarihi, 1, 52; Mustafa Kılıçlı, Arap Edebiyatında Şuubiyye, İşaret yayınları, 1-ci baskı, 1992- Ankara, s. 29.
[156] Əl- Mukaddime, s. 128, 129; Mustafa Kılıçlı, Arap Edebiyatında Şuubiyye, İşaret yayınları, 1-ci baskı, 1992- Ankara, s. 29-30.
[157] Mustafa Kılıçlı, Arap Edebiyatında Şuubiyye, İşaret yayınları, 1-ci baskı, 1992- Ankara, s. 31.

görülməmişdir.[158] Yalnız Üçüncü xəlifə Osman bəzi işlərin idarəsini Əməvi soyundan gələn əqrəbalarına buraxması bir əsəbiyət zuhur etməsinə fürsət hazırlamışdı. Fəqət bu əsəbiyət ərəblərlə məvali arasındakı kimi irqə dayanan bir əsəbiyət deyil, Haşimilərlə xəlifənin tərəfi Əməvilər arasındakı bir qəbilə əsəbiyəti idi ki, nəticədə Xəlifə Osmanın öldürülməsinə səbəb oldu.[159] Əməvilər bir qanun icad edərək ərəblərin Ərəbistan yarımadası dışında özlərinə ərazi almalarına izn verdi. Bu istək Əbubəkir və Ömər dönəmində yasaqlanmışdı. Bu qanunun üzərindən əlli il keçdikdən sonra ərəblər Misir, Suriyə, İraqi-Ərəb və İraqi-Əcəmdə (İranda) ən verimli ərazilərə sahib oldular. Qısa sürədə ərəblər feodallara dönüşdülər. Bu durum ərəb olmayan əhalininin qəzəbinə səbəb oldu. Əməvi düşmənləri gündən günə artmağa başladı.[160]

Şüubiyənin Abbasilər devrindəki fəaliyəti və öncüləri, Əməvilər devrindəki hazırlıq devrəsindən sonra ortaya çıxmış və geniş bir ədəbi, siyasi, dini mücadilənin qapılarını açmışdır. Əməvi idarəsinin son illərində İslamiyətin bərabərlik fikrinə, Quran və hədisdə bu fikri dəstəkləyən ilkələrə dayanaraq əhli-təsviyə (bərabərlik tərəfdarı) adı ilə yavaş-yavaş

---

[158] Mustafa Kılıçlı, Arap Edebiyatında Şuubiyye, İşaret yayınları, 1-ci baskı, 1992- Ankara, s. 85.

[159] Mustafa Kılıçlı, Tarix-ul islami-s siyasi, I, 265, 354; Mustafa Kılıçlı, Arap Edebiyatında Şuubiyye, İşaret yayınları, 1-ci baskı, 1992- Ankara, s. 41.

[160] Həna Əlfaxuri- Xəlil Əlcər, "İslam dünyasında fəlsəfə tarixi", ərəbcədən farscaya çevirən Abdulhəmid Ayəti 3-cü yayım "İslami inqilab yayınları" 1367 (hicri-şəmsi), s. 161.

yüksələn şüubiyə propaqandası Abbasi xəlifəsi Səffahın (750-754) xilafət günlərindən Harun-ul Rəşid (786-809) devrinin sonunadək çoxu fars olan tərəfdarları sayəsində sonsuz bir həyəcanla səsini duyurma təlaşı içinə girmiş və imkan daxilində irəliləmişdir.Məmun və Mötəsəm devrində isə hər yönü ilə qüvvətlənmişdir. Bəzən xəlifələrin də dəstəyi ilə məvalinin ərəblərdən intiqamını almaq istəmişdi. Sadəcə irqi deyil, eyni zamanda elmi əqidə görünümündə olan şüubiyə, əsrlərcə sürən mücadiləsinə davam etmişdir.[161]

Bu hərəkətin amacı ərəblərə qarşı toplumda nifrət duyqusu oluşdurmaq idi. İslamı da öz çıxarlarına görə açıqlayırdılar. Ərəbsiz fars İslamından yanaydılar. Bu hərəkət özünü **"şüubiyə"** olaraq tanımlayırdı. Şüubiyə deyilincə ərəblərin fəth etdikləri yerlərdə hüquqi, siyasi təhəkkümə və üstünlüklərinə qarşı çıxan bir axım və mənsublarını ifadə edər.[162] Ancaq cahiliyə devrində bir şüubilik fikri ərəblərdə mövcud deyildi. Çünkü ictimai, dini, iqtisadi və siyasi amillər hələ şüubiyə hərəkətinin oluşmasına ərişəcəyi bir havaya girməmişdi. Qənaətimizcə bu da farslara qarşılıq vermək üçün ərəblərin İslami devirdə anlaşıldığı mənada bir millət olmamalarından irəli gəlirdi.[163]

---

[161] Mustafa Kılıçlı, Arap Edebiyatında Şuubiyye, İşaret yayınları, 1-ci baskı, 1992- Ankara, s. 82.

[162] Barthold, w, "İslam Medeniyeti Tarihi" Ankara, 1963 s. 99.

[163] Mustafa Kılıçlı, Arap Edebiyatında Şuubiyye, İşaret yayınları, 1-ci baskı, 1992- Ankara, s. 32.

Şüubiyə əməvilərin devrilməsində böyük rol oynadı. Onlar özlərini ərəblərdən üstün bilirdilər. Ərəblərin ərəb olmayanlara məvali (ikinci dərəcəli insan) müamiləsinə qarşı farslarda ortaya çıxan bir antitez idi. Məvaliyə, ərəb ünsürün siyasi və hüquqi təhəkkümü Əməvilər devrində son həddinə vardı. Ərəb olmayan müsəlmanlar İslamın dini və sosial eşitlik prinsipinə rəğmən, əsla ərəblərlə müsavi sayılmır, onların köləsi qəbul edilirdilər.[164] Sasanilər dönəmində farsların ərəblərlə olan bütün münasibətləri əfəndinin kölə ilə münasibətlərinə bənzədilə bilər. Çünkü farsların o devirdə kəndilərindən başqalarını aşağılayan örnəklərə rastlanılmaqdadır. Farslar ərəblər üçün abd (kölə) ləfzini qullanırdılar.[165] Və farslar bunu unutmamışdılar. Əskidən kölə olaraq nitələdiklər ərəb qövmü indi onların əfəndisi olmuşdu.

Əməvilər ərəblik yönündən son dərəcə təəssüb içinə girdiklərindən məvaliyə kötü və həqarət dolu nəzərlərlə baxdılar.[166] Bu da İslamın ana ilklərinə qarşı tutum idi. “Hz. Peyqəmbər İslamn ədalət və müsavat ilkələri çərçivəsində, irqi nə olursa olsun, bütün müsəlmanları birləşdirməyi; özəlliklə ərəblərdə

---

[164] Barthold, w, “İslam Medeniyeti Tarihi” Ankara, 1963 s. 99.

[165] Yaqubi, Tarih, I, 215, 225; Mustafa Kılıçlı, Arap Edebiyatında Şuubiyye, İşaret yayınları, 1-ci baskı, 1992- Ankara, s. 32.

[166] De Lacy O´leary “İslam Düşüncəesi ve tarihteki yeri” Çeviren Hüseyn Yurdaydın-yaşar Kutluay, İlahiyat Fak. Yayınları, Ankara 1971 s. 48.

yayqın olan təəssüb və qəbilə qruplaşmasını ortadan qaldırmağı hədəf almışdı. Bu hədisdə deyir: “Kim əsəbiyətə çağıraraq yaxud əsəbiyətdən dolayı başqasına qızaraq qeyri-müəyyən bir cəmaatın bayrağı altında savaşırsa, onun ölümü cahiliyədəki ölüm kimidir.”[167] İslam peyqəmbərinin nəzdində qara dərili Bilal Həbəşi ərəblərlə eyni haqqa sahib olmuşdu.

Əməvilərin yıxılmasına nədən olan bu politikanın tərs üzü Abbasilər dönəmində də davam etdi. Hətta 753-775 illəri arasında hökm sürən xəlifə Mənsur zamanından etibarən farslar üstünlük iddialarına başladılar. Şüubiyə adı verilən ərəb əleyhdarı bir firqə qurdular. Bu firqə mənsubları ərəb olmayan müsəlmanların ərəblərə eşit olduğuna deyil, əksinə farslar və suriyəlilərlə müqayisə edildiyi zaman hər baxımdan ərəblərin geri və ilkəl bir irq olduğuna qane bulunurlardı. Bu hərəkət Məmun devrində (813-833) böyük bir sosio-politik axım nitəliyini qazanaraq siyasi həyatda etkisini göstərdi.[168] Fəqəqt Abbasilərin Samirə həyatı dönəmində türklər ön plana çıxmağa başladı. “Farsların Abbasi xilafət sarayından kənara çəkilmələrindən və türklərin iş başına gəlmələrindən sonra ərəblərin oturduqları bölgələrdə şüubiyənin fəaliyəti zəifləmişdi. Ancaq farsların qalabalıq olduğu Xorasanda özəlliklə Tahirilər (821-873), Səffarilər (867-

---

[167] Mustafa Kılıçlı, Arap Edebiyatında Şuubiyye, İşaret yayınları, 1-ci baskı, 1992- Ankara, s. 33.

[168] Barthold, w, “İslam Medeniyeti Tarihi” Ankara, 1963 s99, De Lacy O´leary “İslam Düşüncəesi ve tarihteki yeri” s. 69-70.

900), Samanilər (875-999) dönəmində hökmranlıq edən farslar bu hərəkəti kəndi gücləri ilə canlı tutmuşdular."[169]

Ərəblər cahiliyə devirlərində şüur birliyi içində bulunan və milli bir amac üçün çalışan vahid bir millət deyildilər. Onlar qəbilə əsəbiyətinin kəndilərinə öndərlik etdiyi dağınıq qəbilələrdən ibarət idilər. Milliyətləri lehindəki əsəbiyətləri o devirlərdə hələ qəlblərində yer etməmişdi. Çünkü o sırada yaşadıqları bölgədə onlarla qonşuları arasında bunu təhrik edəcək qüvvətli nədənlər mövcud deyildi. Onlarla yarımadaya qonşu fars, rum, həbəş millətləlri arasında savaş nitəliyi daşıyan bəzi toqquşmalar olmuşdu. Ancaq bunlar dünya savaş tarixində önəmli sayılan türlərdən deyildi. Ərəblərin cahiliyə devrindəki qəbilə əsəbiyətlərinin mövcudluğundan dolayı qövmi əsəbiyətləri İslamdan sonra da tamamı ilə yox olmuş deyildi. Ərəb toplumunu bir araya gətirən, onu dağınıq qəbilə düzənindən toplu bir dövlət nizamına soxan İslamiyət gəlincə gətirdiyi düzənin ilkələrinə bağlı olaraq ərəblərdəki əsəbiyət fərddən topluma, qəbilədən millətə daşınmışdır. Köklü bəzi səltənətləri yerlə bir edən, məğlub olan millətlərdən bəzilərinin qəlblərini qalib ərəblərə qarşı öfkə və kinlə dolduran bu əsəbiyət İslami fəthlərdən sonra bariz şəkildə ortaya çıxmışdı. Ona paralel olaraq digər millətlərdəki qövmi əsəbiyət də qızışmış və

---

[169] Mustafa Kılıçlı, Arap Edebiyatında Şuubiyye, İşaret yayınları, 1-ci baskı, 1992- Ankara, s. 83.

şüubilik duyquları ərəb olmayanların qəlblərinə sirayət etməyə başlamışdı.[170]

Şüubiyə gücləndikcə ərəblər də üstünlüklərini bilinc planına daşımağa çalışırdılar. Bu düşüncə savaşları dillərin üstünlüyünə çəkdi. Ərəblər, Allah Quranı ərəbcə endirdiyindən ən üstün dil ərəbcədir deyirdilər. Farslar deyirdilər Allah qızqın olduğu zaman Quranı ərəbcə endirmiş, ona görə Allahın qəzəbli ayətləri Qurandadır. Ancaq Allah daha mərhəmətli olduğu zaman farsca qonuşmuş. Bu anlamda Şüubiyə bir hədis də uydurdu. Buna qarşılıq da ərəblər cənnətin dilinin ərəbcə olacağı ilə ilgili yalan və saxta hədislər uydurdular. Peyqəmbər "Ərşin ətrafındakı mələklər farsca qonuşurlar" demişdir. Ərəbi sevməklə ilgili yüzlərcə hədis uyduruldu. Üç səbəbdən ərəbi sevin! Mən ərəbəm, Quran ərəbcədir, cənnətin dili ərəbcə olacaq. Bu şəkildə qarşılıqlı olaraq yüzlərcə hədis uydurdular. Üstünlüklərini isbat etmək üçün bu saxta hədisləri kütləyə çatdırırdılar. Bu haqda ayrıntılı incələmə İranlı araşdırmaçı tarixçi Nasir Purpirara aiddir. Bu qonuyla ilgili o qaynaqlardan yararlanmaq yaxşı olar. Şafeinin ərəb olması və Hənəfinin ərəb olmaması da dartışmalara qonu oldu. Hənəfinin ərəb olmamasını şüubiyə təqdir edirdi. Şüubiyə Qurandan bir ayətə dayanaraq ərəblərin kafir və münafiq olduqlarını, müsəlman olmadıqlarını və ola bilməyəcəklərini yazırdı. Quranın 9-cu surəsinin 97-ci ayətində "Ərəblər kafir və

[170] Mustafa Kılıçlı, Arap Edebiyatında Şuubiyye, İşaret yayınları, 1-ci baskı, 1992- Ankara, s. 80.

münafiqdir” deyilməkdədir. Bu ayət şüubiyənin əlində bayraq edilmişdi. Şüubiyə kafir və münafiq olan ərəbləri peyqəmbərin və Allahın düşməni sayırdı. Şüubiyə ərəblərə qarşı savaşını gücləndirmək üçün zənciləri də yanına almağa çalışırdı. Çünkü zəncilər də ərəblər tərəfindən aşağılanır və müsəlman olmaları önəmsənmirdi. Şüubiyənin hədisində “Kim həbəşli bir erkək və ya qadını evinə soxarsa, Allah da onun evinə bərəkət soxar” Ərəb isə, zəncinin aşağılanması ilə ilgili hədislər uydururdu. Həm Şüubiyənin, həm də ərəblərin uydurduğu bu hədislər günümüzə qədər öz varlığını və etkisini sürdürməkdədir. Ortalıqda gah ərəb, gah da fars kimi müsəlman olmaq istəyən türklər isə, hər iki tərəfdən sömürülmüşdür. Farsların oluşdurduqları şüubiyə hərəkəti iki yöndə davam edirdi. Şüubun (şöbələrin) və qəbilələrin Quranda bərabərliyi vurqulanırdı.[171] Bu mərhələ şüubiyə həyatında “əhli-təsviyə” (müsavat əhli) adlanır. Ancaq daha sonra şüubiyəçilik başlar. İkinci dəstə ərəb irqçiliyinə qarşı aşırı fars irqçiliyi oluşdurdu. Əcəmin ərəbə üstün olduğuna inandılar. Daha sonrakı dönəmlərdə “əhli-təsviyə” də şüubiyənin içində yer aldı. Şüubiyə öz inkişafı sürəsincə kültürəl və ədəbi cərəyanlar oluşdurdu. Şüubiyə sözü açıqca ərəb düşmənliyi çağrışdıran bir qavrama dönüşdü.[172] Şüubiyənin dini yorumları mütləq ərəb düşmənliyi üzərinə qurulmuşdur. Şüubiyəyə

[171] 49-cu surə 13-cü ayət.

[172] Hüseynəli Mümtəhen, Şüubiyə hərəkəti və onun siyasi-ictimai nəticələri, tarixi araşdırmalar, 1353 (h.ş), xordad və tir ayı, s. 188.

görə ərəblər ən aşağı millətdir. Şüubiyə ərəb kültürünə qarşı əski Sasani mədəniyətini canlandırmağa başladı. Maninin təlimlərini gündəmə gətirdi. Bir sürü saxta qaynaqlar da oluşdurdu.

Araşdırmaçılar isbat edirlər ki, tarixdə İbni-Nədim adında şəxs olmamış. Bunu Şüubiyə uydurmuş və İbni-Nədim adına "Əlfihrist" kimi əsərlər yazmışlar. Əlfihrist əski Sasani mədəniyətini canladırma kitablarıdır. Ayrıca "Şahnamə"ni Şüubiyə öncə nəsr halında yazmış. Nəzmə dönüşməsi üçün Dəqiqini işə almışlar. Dəqiqi bir Qəznəvi türk əsgəri tərəfindən öldürüldükdən sonra Firdovsini tapmışlar. Şüubiyə tərəfindən hazırlanan nəsr əsəri Firdovsi tərəfindən nəzmə çəkilmişdir. Buna qarşılıq Samani dövləti ilə ilişkidə bulunan Şüubiyə Firdovsini ödülləndirirdi. Lakin Samani dövlətinin devrilməsi və Sultan Mahmud tərəfindən şüubiyə örügütü fəaliyətinin durdurlması "Şahnamə"nin yazılma işində axsaqlıq oluşdurar.[173] Şüubiyənin fikri və təşkilati həyatı sonraki dönəmlərdə davam etmişdir. Şüubiyə bir məzhəbdən ibarət olmamışdır. Bütün məzhəblərdə fars-irani kimliyini altdan-altdan, ya da açıqca yürütmüşdür. İsmailiyə ən önəmli şüubiyə hərəkəti olmuşdur. Açıqca fars milliyətçiliyi etmişlər. Şüubiyənin amacı əski Sasani coğrafiyasını içində barındıracaq olan bir dövlət qurmaq idi. Ən açıq fəlsəfi etkinlikləri "ixvan-üs

[173] Nasir Purpirar, Keçmişə körpü, İkinci kitab, İslamın yüksəlişi, birinci bölüm, Karəng nəşriyyatı, Tehran, 1380 (h.ş) s. 145-229.

səfa” cərəyanında olmuşdur. İxvan-üs Səfa öz risalələrində fars irqinin üstün olduğunu savunurdu.[174] Şüubiyənin oluşdurduğu zəngin estetik və dini ədəbiyat fars olmayan bir çox fikir adamlarını da öz etkisi altına almışdır. İbni-Xəldun ulusları iqtisadi qaynaqlarına və çalışmalarına görə sinifləndirir. Şəhər həyatını birinci sırada yerləşdirir və bunu farslara məxsus bilir. Sonra tarımla uğraşan millətlər gəlir ki, kiçik uyqun yerlərdə səpələnmişlər. Daha sonra heyvançılıqla uğraşan uluslar gəlir. Bərbərlər, türklər, türkmənlər kimi. Dəvəçiliklə uğraşan uluslar ən sonda gəlir, ərəblər və kürdlər kimi.[175] Ayrıca, dövlət işindən baş çıxarmayan millət varsa, o da ərəblərdir.[176] “Batiniyə” açıqlamalar şüubiyənin fikri fəaliyətlərinin ürünü olmuşdur. İsmaililər də özlərini batiniyə adlandırırdı. İsmaili hərəkəti Şüubiyənin silahlı örgütü idi. Müxaliflərini terorla ortadan qaldırırdı. Həm silahlı, həm də fikri hərəkəti. İsmailiyəni moğollar örgüt olaraq tarixdən silərlər və Ələmut qalası ələ keçirildikdən sonra qaladakı kitabları yandıralar.

Ələmut qalasının işğalından sonra Cüveyni Hülakü Xanın hüzuruna varıb qaladakı kitablara

---

[174] Həna Əlfaxuri- Xəlil Əlcər, “İslam dünyasında fəlsəfə tarixi”, ərəbcədən farscaya çevirən Abdulhəmid Ayəti 3-cü yayım “İslami inqilab yayınları” 1367 (hicri-şəmsi), s. 198.

[175] Həna Əlfaxuri- Xəlil Əlcər, “İslam dünyasında fəlsəfə tarixi”, ərəbcədən farscaya çevirən Abdulhəmid Ayəti 3-cü yayım “İslami inqilab yayınları” 1367 (hicri-şəmsi), s. 728.

[176] Eyni qaynaq s. 739.

baxması üçün izn istəyir. Hülakü Xan əmr verdi ki, Əlaəddin qalaya getsin və Həsən Səbbahdan bəri 170 il içində birikən ordakı xəzinəni və kitabları kontrol etsin. Şaha uyqun olanlar gətirilsin, qalanları da yaxılsın. Əlaəddin qalaya gedir və nücuma (uzaybiliminə) aid olan kitabları ayırıb gətirir və qalanları da yaxılır. Bu kitabların içində bir də Həsən Səbbah haqqında yazılmış əsər vardı. Bu əsərin özəti "Cahangüşa"nın 3-cü cildində verilmişdir. Rəşidəddin Fəzlullah da "Əl təvarix dər tarixi-İsmailiyə-i Ələmut" (Ələmut İsmailiyəsinin tarixi) kitabında bu haqda bilgi vermişdir.[177] İsmailiyə hərəkəti moğollar tərəfindən silindikdən sonra da Şüubiyənin fikri cərəyanları və siyasi idealı Gîlânın ormanlıqlarında davam etmişdir. 15-ci əsrdə Gîlân hakimi olan Karkiya özünü Sasani soyuna mənsub bilməkdədir. Bu, şüubiyənin ortaya qoyduğu tarix anlayışı və siyasi ideal idi. Şah İsmayılın öyrətməni olan Şəmsəddin Lahici də bir şüubi. Şah İsmayıl Şüubiyə ilkələrinin barındığı ortamda yetişmişdir. Daha sonrakı Şah İsmayıl tətbiqatı tamamən şüubiyənin idealları doğrultusunda olacaq və İran adlı bir ölkə təsis ediləcəkdi. Neo-şüubiyə Pəhləvi dönəmində Səfəvi və Sasani arasındakı 900 illik zaman boşluğunu siyasi fətrət olaraq tanımlar. Yəni iki zaman arasındakı boşluq. Modern şüubiyə, Səfəvi dövlətinin quruluşunu fətrət dönəminin qapanışı olaraq nitələr və Səfəviliyi Sasaniliyin dirilişi olaraq dəyərləndirər. İran İslam

[177] Əlaəddin Ətaməlik Cuveyni "Tarixi-cahangüşayi Cüveyni" Tehran-2006, dünya-i kitab, s. 43-44.

Cümhuriyətinin ideoloqları da özlərini modern səfəviyə kimliyi ilə tanımlarlar.

Bir az da Şah İsmayılın yetişdiyi ortama diqqət edəlim. Onun müəllimi kim olmuş, o ortam necə ortammış? Bu haqda ayrıntılı bilgi əldə etmək çətin işdir. Çünkü tarixdə gizlin hədəflər üçün edilən işlər adətən arxalarınca iz buraxmazlar. İsmayıl kimi tarixi bir dövlət adamının müəllimi olan Şəmsəddin Lahici haqqında nədən ayrıntılı bilgi yoxdur? Ya da nədən bu ortamda İsmayıldan daha böyük olan qardaşı İbrahim və ya digərləri üzərinə durulmamış da İsmayıl üzərinə fikri və maddi sərmayə yatırılmış, onu Allah olaraq görmüşlər? Şeyx Heydərin oğlu İbrahim və digərləri necə oldu, nədən onlardan xəbər yox? Onların haqqında nədən bilgi yox? Ölümləri və həyatları haqda nədən tarix susqundur? Onların hansı əksik yönləri varmış? Qanuna uyqunluq kimi varislik İbrahimin olmurdumu? Çünkü İbrahim yaşca daha böyük və qardaşları Şeyx Əli öldürüldükdən sonra varislik öz-özünə ona devr edilməli idi, ya da digər böyük qardaşlara. İskəndər bəy Türkmən kimi səfəvilərin rəsmi tarixçiləri onu dərviş sifət kimi tanımlayaraq bu sirrə toxunmaqdan oxucunu uzaqlaşdırmaq istəmişlər. Soylu bir ailənin digər çocuqlarından xəbər yoxdur. Nədən Səfəvi soyundan İsmayıldan başqa kimsə qalmamışdır? Bütün bunlar cavabsız suallardır. Bu suallar cavabını taparsa, o dönəmin gizlin qatları da aydınlığa qovuşar.

15-ci əsrin sonu və 16-cı əsrin əvvəllərində Gîlân iki xanidan tərəfindən yönətilirdi. Fomən,

daha sonra Rəşt mərkəzli Biyəpəs xanlığı sünni məzhəb idi. Lahican Mərkəzli Biyəpiş xanlığı şiə idi. Lahican hakimi olan Karkiya özünü Sasani soyundan bilməkdə idi və böyük İranı təsisetmə xəyalları ilə yaşayırdı.

İsmayılın öyrətmənliyini etmiş Şəmsəddin Məhəmməd Gîlâni haqqında qaynaqlarda az bilgi var. Ancaq İsmayılın məzhəbi tərbiyəsində və onun bir şiə olmasında Şəmsəddinin böyük rolu olmuşdur. Ona Lahici və Gîlâni də deyilmişdir. Altı il İsmayılın öyrətmənliyini etmiş, İsmayılın bilincini bu adam şəkilləndirmişdi. Bu üzdən də bu adamın tarixdə sirli və gizli qalması çox suallar doğurur. Kimmiş bu adam? O dönəm şüubiyənin ideolojik təmsilçisimi? Çünkü Səfəviliyin qurumsallaşmasında bu adamın böyük rolu olmuş. Şah İsmayılın oğullarını da eyitmişdir. Tarix kitablarında bir neçə yerdə Lahici haqqında cüzi bilgi verilmişdir.

İsmayıl Gîlânda olduğunda Şəmsəddin Lahicidən ərəbcə və farsca öyrənir.[178] Lahici İsmayıla, yalnızca din dərsləri, farsca və ərəbcə öyrətməmiş, dövlət qurallarını da öyrətmişdir. Bu öyrətimdən amacı nə olmuşdur? Bir çocuğu nədən dövlət adamı kimi eyitmək gərəkirdi? İsmayıl taxta çıxdıqdan sonra Şəmsəddin Lahici imperatorluğun din işlərindən sorumlu şəxs və başbaxan olur. Şah İsmayıl iqtidara gəldikdən sonra Şəmsəddin Lahicini başbaxanlıq görəvinə gətirir.[179] Bir kəlmə Türkçə bilməyən Lahici nəyə güvənərək türk şəhərində dövlət vəzifəsində

[178] Zübdət-ül təvarix s. 48, Cahangüşayi xaqan s. 64.
[179] Təkmilət-ül əxbar s 40.

çalışmağı üstlənmişdir? Üç il bu görəvi tək başına yürütdükdən sonra Məhəmməd Kaşani ilə başbaxanlıq görəvini birlikdə yürüdürlər.[180] Şəmsəddin Lahici Məhəmməd Kaşani ilə bir yerdə Osmanlı elçisini qarşılayırlar.[181] Məhəmməd Lahici haqqında son bilgi onun Şah İsmayılla bir səfərdə bərabər olmasıdır.[182] Sam Mirzənin təzkirəsində onun haqqında yarım yarpaq bilgi var. Daha sonrakı təzkirələrdə verilən bilgilər Sam Mirzənin "Töhfeyi-Sam" əsərindən alınmışdır. Sam Mirzə əsərində Məhəmməd Lahicidən bu məzmunda bir şeir də vermişdir: "Gənclik getdi sənin yolunda, artıq yaşlanmışam mən, sonsuz bəlalarla arxadaş olmuşam"[183] Şəmsəddin Lahici 90 ildən artıq yaşamış və gözəl şeirlər yazmışdır.[184] 90 il yaşamış bir şəxsiyət, Şah İsmayılın düşüncələrinin, siyasi və məzhəbi görüşlərinin gerçək memarı haqqında ancaq bu qədər bilgi var!

Bunlarin dışında bu gizəmli adam haqqında bilgi yoxdur. Pərdə arxasının gizlin qəhrəmanları ortaya çıxmır. Bayındırlı dövlətinin sonlarında Azərbaycanda, Şirazda, İsfahanda bu qədər iç savaşların olması istər istəməz farsları da

---

180 Xülasət ül təvarix 1-ci cild s. 84. , Xuldi-bərin s. 125.

181 Cahangüşayi xaqan s. 225.

182 Eyni qaynaq s. 363.

183 Cəvani rəft dər rahe to piire ruzeqarəm mən
Gereftare bəla vo dərd o ahe bi şemarəm mən.
جوانی رفت در راه تو پیر روزگارم من
گرفتار بلا و درد و آه بی شمارم من

184 الذریعه ج9 ص 542 3000- جی سایی

rahatsız edir, güvənsizlik ortamı oluşdururdu. Bu durumu ortadan qaldırmaq üçün onlar sadəcə seyirci qalmamışlar. Onların da planları olmuş. Səfəviliyin iqtidara gəlməsi və İranın bütünlüyünü təmin edərək əski Sasanı ehtişamını bərqərar etmək farsların altdan-altdan yürüdülən planları idi. İndiki İranı şüubiyə zehniyəti ilə Səfəvilər təsis etmişlər. Fars amili tarixi bir hədəf daşımaqda idi. Bu hədəfi 9-cu əsrin əvvəllərindən etibarən şüubiyə bölgə tarixi üçün bəlli etmişdi. Digər tərəfdən Bayındırlıların bir-birini parçalaması bölgəni rahatsız edir, həyatı yaşanılacaq durumdan çıxarırdı. Ortam şüubiyənin hədəflərinin türk gücü ilə gerçəkləşməsinə çox uyqun idi və öylə də oldu. şüubiyə tarixi hədəfinə Səfəviyə adı ilə qovuşmuş oldu. Səfəvilərdən sonrakı tarixi sürəc qısa Nadir Şah dönəmi istisna olmaqla Şüubiyənin bəlli etdiyi hədəfə görə yürümüşdür. Səfəvilərin arxasınca gələn Qacarlar da şüubiyənin açdığı yolda fədakarlıq göstərmişlər.

Ağaməhəmməd Xan, Qacar dövlətini qurduqdan sonra Ərdəbildən Şah İsmayılın qılıcını Tehrana aparıb belinə taxdı.[185] Səfəvi şiəsi timsalında şüubiyə xidmətçisi olacağını göstərirdi. Bəlkə türklər şüubiyənin oyununa necə gəldiklərinin bilincində olmamışlar. Çünkü türklüyün özünəməxsus din anlayışı olmamışdır. Bu olmayış həm Səlcuqluda, həm Osmanlıda türkülüyü içdən-içə gəmirmişdi. Şüubiyənin açdığı iz iqtidara gəlmək üçün qolaylıq

[185] Səid Nəfisi, İran ictimai və siyasi tarixi, 1-ci cild, s. 510.

sağladığından iqtidar hirsi adına olsa da, bu yolda yürüməyə təslim olmuşlar. Sonuç olaraq bu gün Şüubiyənin tarixi idealı əsasında gerçəkləşən və İran adlanan geniş bölgədə türk dili, türk kimliyi tarixdən silinmək üzrədir. Şüubiyənin də amacı bu idi: Türksüz və ərəbsiz bir fars ölkəsi qurmaq.

Burada bir az daha şüubiyənin kimliyi üzərinə düşünmək mövzunun anlaşılmasına yardımçı ola bilər. Özü də modern bir şüubi olan və İran İslam Devriminin gerçək ideoloqu sayılan Əli Şəriəti Şüubiyəni bu şəkildə anladar:

- Sasani dövlətini devirən Ömər şüubiyə əfsanəsində Əli ilə qarşı-qarşıya gətirilir. Əli gerçək İslamın təmsilcisi, Ömər isə İblis İslamının təmsilcisidir. Əli övülür, Ömər məhkum edilir.
- Sasanilərin devrilməsində iç etkənləri göz önündə bulundurmazlar, bir impratorluğun yüksəlişi və çöküşü yasalarına diqqət etməzlər. Sasanilərin devrilişində bütün suçları Ömərə yüklərlər.
- Sasani səltənəti ilə müxalif olan imamət deyil, xilafətdir. Bu üzdən də səltənət və imamət arasında uyqunluq var.
- Ömər sünniliyi sasanliyin düşməni və Əli şiəliyi sasaniliyin dostudur.
- Ömərin Sasaniləri məğlub etməsi ilə İslam Sasani ölkəsinə girməmişdir. Hz. Fatimənin Sasani qızı Şəhrbanunun yuxusuna girməsi ilə İslam Sasani ölkəsinə girmişdir. Hələ Sasanilər devrilmədən öncə Əlinin qadını Fatimə Mədain sarayında Yəzdgərdin qızı Şəhrbanunun yuxusuna

girmiş, onu İslama dəvət etmiş və İslamın qurallarını yuxuda ona öyrətmişdir.

- Ömər tərəfindən yenilib tarixdən dışlanan Sasanilərin son padşahı Yəzdgərd əfsanəvi şəkildə peyqəmbər tərəfindən tarixə geri gətirilir və peyqəmbərin əhli-beytinə daxil edilir.
- Şüubiyənin Əbubəkirdən daha çox Ömərə nifrət etməsinin də səbəbi budur. Sasaniləri devirən Əbubəkir deyil, Ömərdir. Şüubiyənin Əbubəkiri sevməməsinin səbəblərindən biri də Fədəklə bağlıdır.* Əbubəkir Fədəki qəsb etmiş, Ömər Sasaniləri. Ancaq Fədək olayı ərəb tarixinə aid olduğundan şüubiyəni bir o qədər də ilgiləndirməmişdir.
- Sasanilərin tək yadigarı olan Yəzdigərdin qızı yuxuda Hz. Fatimənin dəvəti və yardımı ilə müsəlman olur. Müsəlman olduqdan sonra yenə də yuxuda Fatimə onu oğlu Həsənlə deyil, Hüseynlə evləndirmək istəyir. Yuxuda hansı ildə danışdıqları da bəlli deyil. Çünkü nə Hz Fatimə Sasani farscasını bilir, nə Şəhrbanu ərəbcə bilir. Bunlar necə anlaşa bilmişlər? Əsir olaraq Şəhrbanu Mədinəyə

---

* Fədək peyqəmbərin kəndi qızı Fatiməyə verdiyi bir bağ olmuş. Peyqəmbərin vəfatından sonra Əbubəkir "peyqəmbərin mirası olmaz" deyə bu bağı Fatimədən almışdı. İslam alimləri də "peyqəmbərin mirası olmaz" fikri üzərində anlaşmışlar. Hz. Əlinin özünün də bu duruma etiraz etdiyi bilinməməkdədir. Ortada bir haqsızlıq olsaydı, haqdan yana olduğu vurqulanan Hz. Əli səssiz qalmazdı.

aparıldığında Mədinənin bütün cavanları içindən Hüseyni seçir, hətta Hüseyndən daha yaraşıqlı olduğu söylənən Həsənə də könül vermir. Çünkü yuxuda Fatimə onu oğlu Hüseynə istəyibmiş! Çünkü imamlıq Həsən soyundan deyil, Hüseyn soyundan davam etmişdir. Böyləcə imamlıq Sasani və peyqəmbər soyu arasında paylaşılır. İmamlıq bir tərəfdən peyqəmbər soyuna dayanır, bir başqa tərəfdən də fars soyuna.

- İmamlığın imam Səccad (4-cü imam) tərəfindən 12-ci imama qədər davam etməsi Sasani səltənətinin əbədiyətə qədər, ya da "Mehdi" gələnə qədər davam etməsi anlamındadır. Çünkü "Mehdi"nin qanında Sasani qanı var. Onun da gəlib gəlməyəcəyi, ya da nə zaman gələcəyi bəlli olmadığı üçün Sasani səltənəti qeyb dünyasında davam edəcək. Bu dünyada yaşayan şiə əhli o səltənətin gerçəkləşməsi yolunda çalışmalı, çünkü bu, "Mehdi"nin də diləyidir.
- Əhli-beytin bütün əxlaqi və üstün özəllikləri peyqəbər və Sasani soyundan qaynaqlanır.
- Allah qatından qaynaqlanan peyqəmbər işığı bu yolla əhuraməzda-Sasani işığı ilə birləşmiş olur. İmamların əbədiyətə qədər davam edəcək iqtidarında Sasaniliyin iqtidarı da bu inancda əbədiləşdirilir.
- Həm Əlinin Ömər tərəfindən haqqı yeyilmiş və xilafət iqtidarından uzaqlaşdırılmışdır, həm də Sasani dövləti

Ömər tərəfindən devrilmişdir. Ömər həm Əliyə zülm etmişdir, həm də Sasanilərə. Ömərə qarşı və dolayısıyla Ömərciliyə qarşı Əlilik və Sasanilik birləşmiş olur. Bu birləşmə duyqusu Mehdinin varlığında davam edir. Mehdi zühur etdiyində həm dədəsi Əlinin, həm də Sasanilərin intiqamını Ömərdən və Ömərcilərdən alacaqdır. Öməri dirildib mühakimə edərək yenidən yaxacaq, Ömərciləri də, yəni sünniləri də qılıcdan keçirəcək.[186]

Şüubiyə bu verilərdən yola çıxaraq Şah İsmayıl adında bir Sasani casusu tərbiyə etmişdir. Çünkü islamşünaslıq uzun ömür tələb edən bir hadisədir. 13 yaşında çocuq İslamı necə tanıya bildi ki, əhalisinin çoxu şafei məzhəbində olan Azərbaycanda şiə inanışını tərcih edə bilsin? Əslində İsmayıl, qızlbaşlığı və ələviliyi yayqınlaşdırmalı idi. Ancaq qızılbaşlıq İsmayılı tərbiyə edənlər üçün uyqun olmadığından şiənin icabları ona öyrədilmiş, şiəni yayqınlaşdırmağı ona tapşırmışdılar. Çünkü qızılbaş kütləsi pərdə arxasında nələrin olub-bitdiyindən xəbərsiz idi və şüubi-şiə əlində qızılbaş kütləsi oyuncaqdan başqa bir şey deyyildi. Amac Əməvilərin devrilişindən sonra Sasani ölkəsini yenidən təsis etmək idi və bu niyyət üçün Şah İsmayıl adında Sasani inanclı biri ortaya atılmışdı.

Anlaşıldığı kimi Sasaniləri devirən Ömər deyil, Əli olsaydı şüubiyənin tarixdə icad

---

[186] Əli Şəriəti “Ələvi şiəsi və Səfəvi şiəsi” على شريعتى تشيع علوى و تشيع صفوى

etdiyi nifrət Ömərə qarşı deyil, Əliyə qarşı yönələcəkdi. Əliyə qarşı yönəltilmiş olan sevgi də Ömərə, ya da bir başqasına yönələcəkdi. Şüubiyənin 16-cı əsrdə bəlirgin şəxsiyəti Şah İsmayıldır. Şüubiyə Azərbaycandakı soyqırımı öz ilkələri doğrultusunda tarixi bilinci olmayan türk-qızılbaşları qullanaraq gerçəkləşdirmişdi. Siyasi səfəviyət birinci olaraq türk dil birliyini, tarix birliyini və sonra da İslam birliyini parçalamışdı. Səfəvi öncəsi heç bir türk-İslam dövləti insanların və kütlələrin dinini, məzhəbini sorqulamamışdı. Türküstan və Anadolu arasında müsəlman türklərin gəl-getləri üçün heç bir əngəl yox idi. Səfəvilər buna əngəl törətdilər. Şiə olanlardan 12 imam adına 12 il vergi almayacaqlarını bir qural olaraq duyurdular. 600 illik doğal türk birliyi ortadan qaldırıldı. Türkçə pozulmağa və farslaşmağa başladı. Islamda bütün insanlar başda peyqəmbər olmaqla Allahın qulu ikən şüubiyə Səfəviyəsi bir də 12 imam qulu deyə İslam inancına şirk qatdı. İnsanları insanların qulu halına gətirən inancı yayqınlaşdırdılar. Əlinin, Həsənin, Hüseynin qulları olaraq əliqulu, həsənqulu, hüseynqulu kimi insan ləyaqətini və şəxsiyətini aşağılayan adlar yayqınlaşdı. Köləlik çocuğun doğduğu ilk gündən qulağına oxundu. Kimliklərini bilmədikləri adamların qulları olacaqdılar. İslam təlimlərində isə, bu, açıqca şirk sayılmaqdadır. Məhəmmədin bilə, qulu deyə İslamda bir ilkə yoxdur. Çünkü Hz. Məhəmməd özü də Tanrının quludur və qula qul olunmaz.

Şüubiyənin əsas əməllərindən biri tarixi saxtalaşdırmaq olmuşdur. Tarixdə

varlıqları olmayan şəxsiyətlər uydurararaq onların adına kitablar yazmışlar. Bunlardan ən önəmlilərindən biri “İbni-Nədim”və guya onun yazdığı “Əlfihrist” əsəridir. İbni-Nədim adlı kimliyi bilinməyən biri Sasani dönəminə aid kitabları saxtalaşdırıb və ya kitablar yazaraq, bunların Sasani dönəminə aid olduğunu qeyd etmişdir.[187] İbni-Nədim və onun “Əlfihrist” adlı kitabı şüubiyənin ən böyük başarılarından biridir.[188] İbni-Nədim haqqında mövcud olan verilərin anlatdığına görə, 10-cu yüzilin sonlarına doğru Bağdadda İbni-Nədim adından biri yaşayırmış və Ərəb dilinin dışında başqa dil bilmirmiş. İbni-Nədim tanış olduğu kitabları fihristləşdirməyə başlamış. Bu günə qədər kimsə bu sualı sormamış ki, İbni-Nədiminin təqdim etdiyi 7530 kitabın müəllifləri kimlər olmuş? Bu qədər kitabların müəllifləri gerçəkdən tarixdə olmuşlarmı? Əlfihristi Fars dilinə tərcümə edən cənab Təcəddüd yazır ki, Bağdad civarına aid olan İbni-Nədimin işarə etdiyi bir sıra kitabların varlıqları təsdiqlənməmişdir. Anlaşılan bəzi müəlliflərin varlıqları sadəcə Əlfihristin içində olmuş və bu əsərin dışında öylə şəxslər həyatda və tarixdə olmamışlar. Ayrıca, Əlfihristin işarə etdiyi millətlərin dini inanışları daha çox röya və yuxuya bənzəməkdədir. Örnəyin Mani haqqında yazdıqları başdan sona qədər gerçək dışıdır və tarixi etibarı yoxdur. Necə olmuş da onun İslami

[187] Naser Purpirar, “İslamın doğuşu” (Bər amədəne Eslam) ikinci kitab, birinci bölüm: bəlgələrin araşdırılması, ikinci basqı, Karəng yayınları, Tehran-1380 (2001), s. 156.
[188] Eyni qaynaq, s. 157.

inanışı ilə uyqun gəlməyən bir dini bu qədər övmüşdür?[189] İbni-Nədimlə müqayisədə daha aşağı düzeydə olan bütün tarixi şəxsiyətlərin adı İbni-Xəlkanın əsərində keçmişdir. Həm də bunların çoxu İbni-Nədimlə eyni dönəmdə yaşamışlar. Ancaq nədənsə İbni-Nədim kimi bu qədər araşdırma ilə uğraşan birinin adı İbni-Xəlkanın əsərlərində keçməmişdir. Onun adını çəkənlər də öyləsinə çəkmişlər ki, İbni-Nədimin kimliyi anlaşılmır. Sanki qəsdən onun anlaşılmaz qalması üçün qarmaşıq ortam oluşdurmaq istəmişlər.[190] İbni-Nədim "Əlfihrist"in yazarıdır. Məhəmməd ibni Əbuyəqub, İshaq ibni Məhəmməd ibni İshaq Vəraq olan müəllif "İbni-Nədim" adı ilə ünlənmişdir. Onun haqqında özündən başqa kimsə bilgi verməmişdir. 17 noyabr 990-cı ildə ölmüşdür. Bağdadda olmuş və onu şiəliklə ittiham etmişlər." Dirnaq içində verdiyimiz bu yazının tarixi yoxdur. Böyük olasılıqla Əhməd paşa moqriziyə aiddir. Moqrizi 1421-ci ildə ölmüşdür. İbni-Nədim şiə olduğunu gizlətmirmiş. Əli və onun torunlarının adı gəldiyində "Əleyissəlam" ifadəsini qullanırmış.[191] Onun məchul qalmasını sünnilərin şiələrə qarşı laqeyd qalması ilə ilgiləndirənlər vardır.[192] "Əlfihrist" giriş bölümünü bir dəfə, iki dəfə, ya da ən az on dəfə oxumaq gərəkir. Oxucu böylə böyük bir işin öhdəsindən gələ biləcək şiə inanclı birini tarixin əsla tanımadığı qənaətinə

[189] Eyni qaynaq, s. 160.
[190] Eyni qaynaq.
[191] Eyni qaynaq, s. 161.
[192] Eyni qaynaq, s. 162.

varacaqdır. Demək olar ki, heç bir nəzər sahibi İbni-Nədim və onun əsərləri haqqında tanıtım içərikli bilgi verməmişdir. Necə ola bilər böylə çalışqan və bu qədər kitabların müəllifi haqqında tarixdə heç bir tutarlı bilgi olmasın?[193] İbni-Nədimin ölümündən altmış il sonra Xətib Bağdadi mötəbər "Bağdad tarixi" kitabında da ona heç işarə etməmişdir. Heç şübhəsiz ki, "Əlfihrist" bu qədər həcminə və içərdiyi bilgilərə görə araşdırmaçıların əl kitabı olması gərəkirdi. Müəllifin ölümündən iki yüz il sonraya qədər onun adına heç bir qaynaqda rastlanılmır. Bu qədər uzun zaman dilimi içində nədən "Əlfihrist" heç bir araşdırmaçının diqqətini cəlb etməmişdir?[194] İbni-Nədim bütün rəvayətləri məchul şəxslər adından vermişdir. Öz alqılamasının ürünü olaraq bilgi verməmişdir. Rəvayət etdiyi bilgilər üçün uyqun adlar tapmadığında rəvayətçinin yerini boş buraxmışdır.[195] İbni-Nədim daha sonra Fars dili və ədəbiyatı bölümünə girir. Burada İbni-Nədimi yaradanların saxtakarlıqları öz-özünə ifşa edilməyə başlayır. Burada "Əlfihrist"i yazan şüubinin ustalığı da üzə çıxır. İbni-Nədimin daha sonra "Şahnamə"nin məlzəməsi olaraq qullanılan bilgiləri hansı qaynaqdan aldığı bəlli olmur.[196]

---

[193] Eyni qaynaq, s. 162.

[194] Eyni qaynaq, s. 163.

[195] Eyni qaynaq, s. 181.

[196] Eyni qaynaq, s. 182.

Daha sonra mədrəsələşən şüubiyə-şiə fiqhi aşura hadisəsi ilə bağlı da bir sürü yalanlar uydurdu. Əli ilə daha öncəki xəlifələrin düşmən olduqlarını isbatlamaq üçün aşura olayını da təhrif etdilər. Bu təhrif günümüzə qədər davam etməkdədir. Aşura günü Əbutaliboğlu Əlinin, Həsənin və Hüseynin öldürülən evladlarının adını xalqdan gizlədilər. Sadəcə Əlinin iki şəhid oğlunun adını əzbərlətdilər. Hüseyn və Abbas dışında şəhid edilənlərin adlarını xalqa söyləməz oldular. Bir də Həsənin oğlu Qasim və Hüseynin oğlu Əkbər və Əsğər haqqında mərsiyələr söyləndi. Çünkü söyləsəydilər onların yalanları açıqca ifşa olardı. Əli və Həsən necə daha öncəki xəlifələrlə düşmənmişlər ki, oğullarının adlarını Əbubəkir, Ömər, Osman qoymuşlar? Hansı insan düşməninin adını öz evladına ad olaraq seçər? Kərbəlada Əlinin öldürülən oğulları arasında bu adlar var: Hüseyn, Osman, Əbubəkir, Ömər, Cəfər, Abbas, Abdulla. Ayrıca, Həsənin də Əbubəkir adında bir oğlu Kərbəla olayında öldürülür. Hətta Kərbəlada şəhid edilənlərin arasında iki “yəzid” adı da var: Yəzid ibni Səbit və Yəzid ibni Məğfəl. Şah İsmayılı tərbiyə edib yetişdirən şüubiyə üçün bu tarixi gerçəklər lazım deyildi. Lazım olan İsmayıl adında karizmatik bir gənc vasitəsi ilə fars-şiə irqçiliyinin Azərbaycanda kök salması idi. Tarixi gerçəklərin bilinməsi onların bütün yalanlarını ifşa edə bilərdi. “Yəzidə lənət”, “Ömrə lənət” kimi söyləmlərdə “hansı Yəzidə və hansı Ömrə lənət?” sorusu ortaya çıxmasın deyə, bu adların Əli soyundan olduğunu xalqa açıqlamadılar. Hələ də məhərrəmlik törənlərində açıqlamazlar.

Sanki Əlinin bu adlarda evladları və nəvələri yoxmuş! Böyləcə nifrət və kin Şah İsmayıl tərəfindən bayındırlı türk yurdunda öyləsinə kök salacaqdı ki, daha sonrakı dönəmlərdə köksü nifrət və kinlə dolub daşan xəstə bireylər və dolayısıyla düşüncəsini bilimə, İslama və həqiqətə qapataraq fars şiə-irqçiliyinin əlində oyuncaq olan bir toplum yetişəcəkdi. Şah İsmayıl dönəmində yasaqlanan ədəbi qaynaqlardan biri də Mövlana Cəlaləddin Ruminin əsərləri olmuşdur. Üç səbəb üzündən Mövlananın əsərləri yasaqlanmışdır:

1- Sünni olduğu üçün.

2- Məsnəvisində Hz. Öməri övmüş, özünü Ömərə, Şəmsi-Təbrizini də Hz. Mustafaya bənzədərək demişdir:

“Ey mənə sən Mustafa, mən də Ömər,
Xidmətin çin bağlar oldum da kəmər”*

3- “Məsnəvi”sində qüllati-şiənin “aşura” günündəki əməllərini tənqid etdiyi üçün. Mövlana Məsnəvinin 6-cı dəftərində bir hekayə anladar. Bir şair aşura günü Antakiyadan keçərkən insanların sürülər şəklində ağlayıb-sıtqadıqlarını görər. Kimin öldüyünü sorduğunda ona Əlioğlu Hüseynin bu gün öldürüldüyünü söylərlər. Şair şaşaraq onlara “bu ki, çox uzun zaman öncənin olayıdır, siz indimi eşitmisiniz?” söylər və deyər: Siz Hüseynə ağlamayın, öz halınıza ağlayın. Hüseyn ağlanası biri

---

* Türkçətə çevirən: G.G.
Ey məra to Mostəfa mən çon Omər,
Əz Bəraye xedmətət bəndəm kəmər,
ای مرا تو مصطفی من جون عمر،
از برای خدمتت بندم کمر.

olmamışdır. Öz inancı yolunda bədən zindanından qurtulmuşdur. Dərin cəhalət yuxusundasınız, oyanın!**

İslam tarixində ən böyük şəxsiyətlərdən biri Hz. Ömər olmuşdur. Hz. Əli çocuqluğundan Hz. Peyqəmbərin yanında böyüdüyündən onun böyük insan oluşu doğaldır. Amma Ömər ən yobaz, ən saldırqan, ən aqressiv və qaba bədəvi ərəb idi. Peyqəmbəri bilə, öldürmək istəmişdi. Eyitimin amacı böylə birini eyitmək olmalıdır. İslam böylə birini eyitərək ölkələrin fatehi və ilk çağ müslümanlarının əxlaq öndəri yapmışdır. Eyitim yəni bu. Böyüklük də yəni bu. Ömər İslamın möcüzələrindən biridir. Hədəfi bəlli olmayan, İslam öncəsi törələrin və batil inancların əlində oyuncaq olan Öməri İslam eyitdi və tarixi bir şəxsiyətə dönüşdürdü. Hz. Ömər, Sasani-Pers imperatorluğunu devirmişdir. O dönəmdə də devrilmiş Sasanilərin pers təbəələri Öməri sevməz olmuşdular. Bunu anlamaq da mümkündür, çünkü Ömər onların dövlətlərini devirdi. Bu nədənlə Firuz Əbulolo, Hz. Öməri öldürdü. Daha sonra şiə-pers məzhəbi Firuz Əbulolo´nun terorist görüşü üzərinə gəlişdi. Şiə-Sasani quruntusu Ömər düşmənliyi üzərində quruldu. Sasani dövlətini Ömər deyil, Əli devirsə idi, bugünküÖmərə qarşı olan şiə-pers nifrəti Əli´ni hədəf alacaqdı. Əslində heç bir 12 imam möcüzəsi söz qonusu deyildir. Şiə-Sasani quruntusunun Sasani nostaljisinə

** Pəs əza bər xod konid ey xoftəqan
Zanke bəd mərgist in xabe geran
پس عزا بر خود کنید ای خفتگان
زانکه بد مرگیست این خواب گران.

dayanaraq Ömər düşmənliyi yapması söz qonusudur. Bu amaç doğrultusunda Şah İsmail adlı Sasani casusu çıldırmış qızılbaşları Sasani nostaljisi yolunda qullanmışdır. Son 500 ildə tarixi İran mühitində İslam tarixi ilə ilgili yapılan bütün quramlar (teorilər) şiə-Sasani inanışı üzərinə hazırlanmışdır. Türklərin ağlını son 500 ildə bu yaxlaşımla çalmışlar. Arada Nadir Şah bu sorunu çözmək istəsə də, onun terror edilməsi dolayısı ilə bu iş yarım qalmışdır. Amma İranda yaşayan Türklərin İslam tarixi ilə ilgili doğruları bilməsi gərəkir. Ulusal oyanış dediyimiz olay bütün uluslarda dini doğrular üzərinə yenidən yaxlaşımlarla başlamışdır. Almanya, Fransa, Finlandya və ... örnəklərində olduğu kimi. Nədən bizim xalqımız “Ömər´ə lənət!” söyləməkdən zövq alır? Nədən aşura namazında sürəkli “Allah Ömər´ə lənet eyləsin!” deyilir? Bizim Türk ulusu olaraq Ömər´lə nə sorunumuz var? Nədən Əbubəkir´dən, Osman´dan daha çox Ömər´ə nifrət edilməkdədir? Bu, Ömər´in Sasani ölkəsini fəth etməsindən dolayı deyilmi? Gerçəkdən Ömər və Əli düşmənmi olmuşlar? Gerçəkdən Ömər Əli´nin eşi və peyqəmbərin qızı Hz. Fatimə ´ni gəbə ikən dövərək öldürmüş mü? Ömər´lə bizim sorunumuz nə? Ömər bizə və İslam´a nə kötülük etmiş? İslamı dünyaya yayan Ömər olmamış mı? Müsəlman isək, nədən Ömər´i sevməz olmuşuq? Səfəvilərin içimizə doldurduğu bu qədər nifrətlə biz insan ola bilərikmi?

Bütün bu gəlişmələr isə Sasaniliyin Səfəvi adı ilə yenidən dirilişinə xidmət etməkdə idi.

Yeni “İran”ın nütfəsi Səfəvilər zamanında bağlandı. Səfəvilər dönəmində (1501-1722)

Sasanilərdən sonra paramparça olan ölkə 900 ildən sonra bütünləşdi. Bu illər ərzində isna-əşəri şiəsi ölkənin rəsmi məzhəbinə dönüşdürüldü. İran-Avropa ilişkiləri də yeni mərhələyə girdi.[197]

## İsmayılın meydana çıxması

1499-cu ilin Avqust ayında 13 yaşlı İsmayıl Lahicandan Ərdəbilə yola düşdü. Onun yanında yeddi nəfərdən ibarət ən yaxın şəxslər var idi; Hüseyn bəy Lələ Şamlu, Əbdüləli bəy Dədə (Dədə bəy), Xadim bəy Xüləfa, Rüstəm bəy Qaramanlı, Bayram bəy Qaramanlı, İlyas bəy Ağutoğlu və Qarapiri bəy Qacar.[198] [*] Onlar Aləmşah xanımı Şeyx Səfi zaviyəsinə göndərdilər. Özləri isə, üç ay Xalxalda və çevrəsi

---

[197] Melville, Charles, Safavid Persia: The History and Politics of an İslamic Society. I. B. Tauris&Co published in Association with The Centre of Middle Eastern Studies of The university of Cambridge. London. 1996, P. 426.

[198] Oqtay Əfəndiyev "Azərbaycan Səfəvilər dövləti" Şərq-Qərb yayını Bakı -2007, s. 45.

[*] Bu yeddi nəfər "əhli-ixtisas" olaraq bilinir.

Tarımda** qaldılar. Anadoluya Şah İsmayılın zühur etdiyi xəbərini ulaşdırdılar. Anadoludan Azərbaycana qızılbaş axınları başladı. Artıq yanında 1500 qızılbaş savaşçı var idi.[199] İsmayıl Ərdəbilə dədələrinin türbəsini ziyarətə getdiyində yanında 3000 qızılbaş vardı. Bir neçə gün Ərdəbildə qaldılar. Ərdəbil hakimi onlara şəhərdən çıxmaları üçün xəbərdarlıq etdi. Qızılbaşlar Talış məntəqəsinə çəkilib Ərcivan kəndində yerləşdilər.[200]

Xəbər yayıldı ki, Şeyxoğlu Şah İsmayıl zühur etmiş və cahangüşalıq etmək istəyir. Şamdan, Diyarbəkirdən və Sivasdan dörd min savaşçı qızılbaş Şah İsmayıla qatıldı.[201] Sufilərin hərəkəti bu zaman şeyxləri ilə bir yerdə təriqət səyahətini anımsatdığı üçün Azərbaycan hakimlərini şübhələndirmirdi. Vardıqları yerlərdə, hətta onlara dərvişlər olaraq nəzrlər də verilirdi. Yaz fəslində qızılbaşlar Muğandan **Gölçə**yə*** vardılar. Gölçə kənarında Anadoludan

---

** Tarım indi Zəngana bağlı bölgədir. Buranın əkin üçün çox uyqun torpağı olduğu üçün tarım adlanmış. Tarım, yəni əkinçilik. “Tarım” sözünü farscaya görə açıqlamaq doğru deyildir.

199 Eyni qaynaq. S. 46.

200 Tarixi-Aləm Arayi Abbasi . 192-193.

201 Rözət-üs səfa 10, 10 روضه الصفا

*** Günümüzdə bu göl “Göyçə” olaraq bilinir. Əski qaynaqlarda “gölçə” yazılmışdır. Özəlliklə Qacar qaynaqlarında gölçə yazılmışdır. Anlaşılan gölçə tələffüzü daha doğrudur. Gölçə, yəni kiçik göl. Xəzərin, Vanın və Urmu gölünün yanında ancaq gölçə tələffüz edilməsi daha məntiqli görünür. Ayrıntılı bilgi üçün baxın: Əminə Pakrəvan “Abbas Mirzə və Azərbaycan” Çevirən Güntay Cavanşir, Qanun Nəşriyatə Bakı- 2007.

axın edən qızılbaşlar yenə də Şaha qatıldılar. 1500-cü ilin yay fəslində Ərzincanda Şahın ordusunun sayı yeddi min nəfər olmuşdu. Bu arada Anadoludan qızılbaş axınları durmadan davam edirdi. Qızılbaş ordusunu təşkil edən əsasən doqquz boydan ibarət idi:

- Şamdan gələn Şamlu Türkmən boyu.
- Güney Anadoludan gələn Təkəli Türkmən boyu.
- Doğu Anadoludan Qacar boyu.
- Rumlular. Bunları Əmir Teymur Şeyx Əliyə bağışlamışdı. Şeyx Cüneydin yanında yenidən Anadoluya getmişdilər. Onlar və onların törəmələri.
- Konya və Kilikiyədən Qaramanlı boyu.
- Ağdəniz Quzeyindən Varsaq boyu.
- Fırat ötəsindən Zülqədər boyu.
- Doğu Anadoludan Ustaclu boyu.
- Doğu Anadoludan Bayat boyu.

Ayrıca, Talış sufilər də Şah ordusuna qatılmışdı. Qızılbaşlardan fərqlənmək üçün bunlara “Taliş sufilər” deyirdilər. Əfşar boyundan da orduya qatılmışdılar.

Yol xəritəsini bəlli etmək üçün “ixtisas əhli”nin qatılımı və Şahın başçılığı ilə payızda Ərzincanda qurultay keçirildi. İlk saldırının Gürcüstana, yoxsa İrəvana olacağı üzərinə söhbətlər oldu. Azərbaycanın sünni yerləşim yerlərinə saldırıdan yana olanlar ağırlıqda idi. O gün anlaşa bilmədikləri üçün yol xəritəsinin bəlirlənməsini “Şeyxoğlu İsmayıl Vəliullah”a göylərdən gələcək qeybi yardıma buraxdılar. Gecə Şah İsmayıla gələcək olan vəhy sabah qızılbaşların yol xəritəsini bəlli edəcəkdi. Şah,

dədələri və imamlarla gecə məsləhətləşib nəticəni qızılbaşlara söyləyəcəyini duyurdu. Şirvanşahdan dədələrinin intiqamını almasını uzun zaman idi düşünməkdə idi. Yuxusunda Şirvana saldırdığını gördü. Qızılbaşlar bunu Allahın vəhyi olaraq dəyərləndirdilər. Qızılbaşlar Şirvana doğru yola düşdülər. Qızılbaşların gəldiyini xəbər alan Şamaxı əhalisi şəhəri boşaldıb dağlara çəkilib güvənli yerdə gizlənmişdilər. Qızılbaşlar Şamaxıya girib şəhərdə qalan nə vardısa yağmaladılar. Şirvanşah Yəsar bu zaman Gülüstana yaxın bir yerdə idi. Bundan xəbər tutan qızılbaşlar onu yaxalamaq istədilər. Şirvanşah qızılbaşların gəldiklərini öyrənib Gülüstana çəkildi. Bir çox qızılbaş Şirvanşah ordusunun oxçuları tərəfindən öldürüldü. Şirvanşah, ordusuna saldırı əmri verdi. 1500-cü ilin sonunda Gülüstan qalası yaxınlığında Cəbani adlı yerdə İsmayılla Fərrux Yəsar arasında döyüş başladı.[202] Ancaq qızılbaşlar qılıc savaşında daha başarılı olduqlarından Vəliullahın əmri üzərinə qəhrəmanca savaşırdılar. Şirvanşah bu savaşda öldürüldü. Şirvanşahın cəsədini Şahın əmri üzərinə yaxdılar. Qızılbaşlar əldə etdikləri qənimətləri götürüb evlərinə geri dönməsinlər deyə, Şah bütün qənimətlərin çaya atılmasını istədi. Belə ağıllı bir fikiri Şah özü düşünmüş, yoxsa ixtisas əhlimi təklif etmişlər bəlli deyil. Qızılbaşlardan biri daha sonra bu şəkildə söyləmişdi: Şeyxoğlu Şah sünnilərin mallarının nəcis olduğunu söyləyib hamısını suya atmamızı

[202] Oqtay Əfəndiyev “Azərbaycan Səfəvilər Dövləti” Şərq-Qərb Bakı- 2007 s. 48.

istədi. Sufilər, hətta sünnilərin at-qatırlarını da suya atdılar. Şirvanşahın xəzinəsindən bir çuval cəvahir tapmışdım. Çuvalın ağzı iki tərəfdən möhürlənmişdi. İçində cəvahir olduğuna əmin idim. Neçə kərə düşündüm ki, cəvahiratın suya atılması doğru deyil. Ancaq mürşidi-kamilimizin əmrinə tabe olmaq zorunda idim. Cəvahirat çuvalını çaya atdım.[203] Ətrafındakılarla fərar etmiş Şirvanşahın oğlunu təqib etmək üçün Şah bir dəstə qızılbaş görəvləndirdi. Ancaq Şirvanşahın oğlu gəmi ilə Gîlâna qaçmışdı.[204] Şirvanşahın öldürülməsi ilə Şirvan bütünüylə qızılbaşlar tərəfindən işğal edildi. Şirvanşahın xəzinəsi Bakı qalasında barınmaqda idi. 1501-ci il yazın əvvəlində Şah özünün başlıca qüvvələri ilə Mahmudabaddan Bakıya hərəkət etdi.[205]

Bakının işğalı ilə bol qənimət əldə etdi və Şah bu qənimətləri mübah olaraq duyurdu. Şirvanşah qalıqlarından bölgəni tam olaraq təmizləmək üçün şirvan saraylarını yaxıb yox etdilər. Şirvan bağlarını yaxıb külə çevirdilər. Yüzillərin mədəniyəti şəhər həyatı görməmiş qızılbaşlar tərəfindən məhv edilirdi. Səfəvi nəfəsi bölgəni yandırıb yaxdıqdan sonra başqa bir dönəm başlayacaq, tədricən bütün ölkə Səfəvi qaranlığına bürünəcəkdi. Ancaq Şirvanşah qalıqları yox olmadı. Çünkü daha öncədən onların böyük qismi dağlara çəkilmişdi. İsmayıl başqa yerlərdə savaşlarla uğraşdığında Şirvanşah varisləri toparlanacaqlardı. Bu, irəlidə

[203] Xülasət üt təvarix 61-62. 61-62 خلاصه التواریخ.
[204] Oqtay Əfəndiyev "Azərbaycan Səfəvilər Dövləti" Şərq-Qərb Bakı- 2007 s. 49.
[205] Eyni qaynaq, s 50.

anlatılacaqdır. Bu zaman Uzun Həsən və Sultan Yaqub dönəmində dövlət katibliyi etmiş, daha sonra iqtidar savaşlarına qatılıb yenildiyi üçün Əlvənd bəy Bayındırdan intiqam almaq fürsətini axtaran Bayındır soylu təbrizli Əmir Şəmsəddin Zəkəriyya Keçəci, İsmayıla təslim oldu. İsmayıl bu adamı hörmətlə qarşıladı. İsmayıl Gülüstana saldırmaq istəyirdi. Keçəci, Təbriz haqqında ona bilgi verib və Təbrizə saldıraraq Əlvənd bəyin işini bitirib Bayındırlıların səltənətinə son verməsini məsləhət gördü.

## Təbrizin işğalı

Əlvənd bəy, Murad bəylə anlaşaraq Azərbaycanın və Diyarbəkirin şahı olmuşdu. Qızılbaşların Şirvandakı qələbə xəbərini duyduğunda onlarla savaşmaq üçün Naxcıvana getdi. Qızılbaşlar Əlvənd bəyi qafil yaxalamaq üçün sürətlə Naxcıvana yola düşdülər. Şərur düzlüyündə 1501-ci ilin ortalarında İsmayılla Əlvənd arasında həlledici savaş baş verdi.[206] Əlvənd bəy yenilib Ərzincana geri çəkildi. Bu zəfərdən sonra qızılbaşlar Təbrizə yola düşdülər.

[206] Eyni qaynaq s. 53.

Təbrizin qızılbaşlara təslim olmasında Zəkəriyya Keçəcinin böyük rolu oldu. O, Bayındırlılar dövlətində yüksək vəzifələrdə çalışdığı üçün Təbriz əhalisi tərəfindən tanınan sima idi. Şəhərin öndə gələn isimləri ilə söhbətləşib və İsmayılın önəmli bir soydan gəldiyini, Azərbaycanı bayındırlı xaosundan qurtamaq istədiyini söylədi. Yalnız İsmayılın Azərbaycana güvənlik gətirə biləcəyini təbrizlilələrə açıqlayıb onları inandırdı. Qızılbaşlar haqqında bilgiləri olmayan təbrizlilər bayındırlıların iç savaşlarından bezmişdilər. Bildikləri sadəcə onların başında Səfiyəddin soyundan birinin durması idi. Daha sonra başlarına gələcək bəlaları düşünməyərək heç bir şərt qoymadan könüllü olaraq şəhərlərini qızılbaşlara təslim etdilər. Artıq Şüubiyə öz amacına çatmışdı. Azərbaycanın başkəndi şüubiyə zehniyətinin işğalına uğramışdı. Dilləri türkçə olmayan şüubiyə rahat bir şəkildə Təbrizdə yerləşərək daha sonrakı planlarını tətbiq edə bilərdi. Bu üzdən də İsmayılı sırf bu amac üçün yetişdirmiş olan şüubiyənin nümayəndələri Təbrizə axın edərək dövlət vəzifələri tutmağa başladılar. Türk qızılbaşlar dövlətdə sadəcə savaşçı güc olaraq şüubiyənin hədəfləri yolunda savaşacaq və fars şüubiyə isə, əlinə qılıc almadan dövlətin yüksək vəzifələrində yerləşəcəkdi. Tarixin axışının fərqində olmayan türk qızılbaşlar farsların tarixi hədəfləri yolunda canfişanlıq edəcəkdilər. Təbrizə yerləşən şüubiyənin ilk nümayəndəsi Gîlânda bu iş üçün İsmayılı hazırlamış olan fars soylu Şəmsəddin Lahici idi. Şəmsəddin Lahici öz yandaşları və yardımçıları ilə bir yerdə 13 yaşlı

İsmayıl adlanan çocuğun bundan sonrakı yol xəritəsini ayrıntılı biçimdə yazacaq və Azərbaycanın necə şiələşdirilməsi planlarını çizərək Firdovsidən o zamana qədər haqqında əfsanələrdə danışılan İran adlı ölkəni təsis edəcək və türk Azərbaycan ölkəsini İraniləşdirəcəkdilər.

İsmayıl Təbrizə girdikdən sonra birbaşa Cənnət Səltənət Sarayına getdi. Bu saray Qaraqoyunlular zamanında təsis edilmiş, Uzun Həsən və Sultan Yaqub zamanında da daha möhtəşəm artırmalar olmuşdu. Təqribən 14 yaşında olan İsmayıl burada başına şahlıq tacı qoydu. Başına tacqoyma mərasimində 12 cümlədən ibarət bir mətn oxudu. Bu mətni 14 yaşında çocuğun yaza bilməyəcəyi bəllidir. 14 yaşında çocuğun bu qədər tarix bilgisi ola bilməzdi. Gîlânda İsmayılın müəllimi olmuş, Təbriz işğal edilər-edilməz İsmayılın yanına qoşmuş olan Şəmsəddin Lahici bu mətni yaza bilərdi. Çünkü bu 12 cümlədən ibarət olan mətn şüubiyənin ideallarını əks etdirən manifestdir. 12 rəqəminin qızılbaşlar yanında önəmi olmuşdur. 12 imam, 12 zolaqlı qızıl papaqları kimi. Ancaq bu mətndəki 12 cümlənin bu rəqəmlərlə heç bir əlaqəsi yoxdur. Bu 12 cümlə şüubiyənin tarixi amacını gerçəkləşdirən sənəddir. Nə idi o tarixi amac? Zaman axışı içində türksüz və ərəbsiz İran ölkəsi oluşdurmaq, özəlliklə türkləri fars ülküləri yolunda qullanmaq və yox etmək. Bu 12 cümləyə baxalım:

1. Mən bu gün yerə endim.
2. Sərvər və şahənşah mənəm.

3. Əmin ol ki, Heydərin oğlu mənəm.
4. Mənəm Firidun.
5. Mənəm Xosrov. 6. Mənəm Cəmşid.
7. Mənəm Zəhhak.
8. Mənəm Zaloğlu Rüstəm
9. Mənəm İskəndər.
10. Ənəl-həq sirri mənim bağrımda gizlidir.
11. Çünkü mənəm mütləq həqiqət.
12. Həqiqət mənim sona çatdırdığım işlərdir.[207]

Daha sonrakı tarixi sürəc və indiki durum bu mətndəki düşüncələrin gerçəkləşməsindən başqa bir şey olmamışdır. Bütün Səfəvi dönəmində avam qızılbaş kütləsinə və Azərbaycan türklərinə Sasani tarixi idealizə edilərək təqdim edilmiş, ”Şahnamə”dəki mitolojik tarix gerçəklik kimi sunulmuşdur. Şəmsəddin Lahicinin bu zaman Təbrizdə olması bu mətni onun hazırladığına dəlalət etməzmi? Səfəvilərin özünü imam soyuna mənsub bilmələri də bir şüubiyə düşüncəsidir. Çünkü İslam irqçi bir din deyildir. İrqçiliyi şiə və şüubiyə İslam kültürünə gətirmişdir. Səfəviyə-şüubiyə Quranda keçən 108-ci ”kövsər” surəsinin Əbutaliboğlu Əli və onun soyuna xitab etdiyini söylər. Ancaq hansı qaynağa görə? Bu, sadəcə bir irqçi açıqlamadır. Çünkü peyqəmbərin mənəvi və inanc soyu ola bilər. İslamiyəti içdən qəbul etmiş və onun ilkələrinə görə yaşayan hər bir müsəlman bu inanc və düşüncə soyuna mənsubdur. Kövsər bu anlamda olsa gərək. Çünkü yalnız bu anlamda irqçilik anlamı

[207] Ettelaate Eqtesadi-siyasi, 1378-ci il, sayı 147-148, s. 23 və Ettelaate Eqtesadi-siyasi 1385-ci il sayı, 225-226.

daşımaz. Zâtən sırf peyqəmbərin bioloji anlamda soyu olmaz düşüncəsindən dolayı Hz. Əbubəkir ”Fədək”i Hz. Fatiməyə buraxmamışdı. Hər bir müsəlman peyqəmbəerin inancsal soyuna mənsubdur. İmam soyuna mənsub olmayan gerçək müsəlmanların suçu nədir ki, üstün islam əxlaqından bərxurdar ola bilməsin? Daha irəlidə bunu anladacağam. İmam soyuna mənsub olmanın İslamda heç bir önəmi yoxdur. Səfəviyətlə işğal edilən Azərbaycan sadəcə şiələşməklə qalmamış, həm də sürətli şəkildə öz dilindən, kimliyindən uzaqlaşmışdır. Azərbaycan Cümhuriyətində İsmayılın türk dilini dövlət dili elan etdiyi əfsanəsi də uydurma yalandan başqa bir şey deyildir. Öylə olmuşsa, nədən bütün tarix kitabları farsca yazılmış?

Ta əski çağlardan bəri bir şəhər özü təslim olduğunda oraya girən fateh qətl törətməzdi. Təbrizin o zamankı əhalisini tarixçilər ümumən 200 min nəfərdən artıq yazmışlar. “Anonim tarixçinin yazdığına görə 16-ci əsrin əvvəllərində əhalisinin sayı 300 minə çatan Təbrizdə…”[208] 200-300 min arasında əhalisi olan Təbriz yeddiminlik qızılbaş ordusu qarşısında özünü savunacaq və hətta qarşı tərəfi yenə biləcək ən az 50 minlik ordu düzənləyə bilərdi. Təbriz əhalisi sadəcə güvənlik istəyirdi. Şəhərdə ticarət həyatı güvənlik tələb edər. Təbrizin Şah İsmayıla dirənməməsinin əsas səbəbi güclü bir dövlət adamının şəhərdə güvənlik yarada biləcəyi ehtiyac idi. Onlar bilirdilər və duymuşdular ki, könüllü təslim olan şəhərlərdə

[208] Oqtay Əfəndiyev “Azərbaycan Səfəvilər Dövləti” Şərq-Qərb Bakı- 2007 s.59.

şəhərə girən fateh qətl törətməz. İsmayılın da bu şəkildə davranacağını sanmışdılar. İllər boyu iç savaşdan bıxmış olan Təbrizdə ticarət həyatını və iqtisadiyatı güvənsizlik sarmışdı. Təbrizlilər İsmayıla yardım edərək bu güvənliyi bərqərar etmək fikrindəydilər. Ağıllarına gəlməzdi ki, İsmayıl şəhərə girdikdən sonra onların məzhəblərinin dəyişməsinə əmr verəcək və məzhəblərini dəyişməyənləri dəstə-dəstə qətl edəcəkdi. Təbriz tarixində kütlələri inancından və məzhəbindən dolayı qətl edən bir dövlət yönətimi olmamışdı. Şah İsmayılın sünniləri qılıcdan keçirməsi tarixin ilk təcrübəsi idi. Azərbaycan öz tarixində ilk dəfə böylə bir cani və qatillə rastlanmaqda idi. Təbriz, Bakı, Şamaxı, Zəngan, Xoy, Urmu, Marağa və Mərənd kimi Azərbaycan şəhərləri sünni məzhəbindəydilər. Qismən də zeydiyyə məzhəbində. Səfəvilərə qədər Azərbaycanda heç bir dövlət toplumun inancı ilə uğraşmamışdı. Səlcuqlardan Səfəvilərə qədər Azərbaycanda demək olar ki, məzhəb özgürlüyü olmuşdur. Şah İsmayılın sünnilərə qarşı illər boyu içində daşıdığı nifrət təbrizlilərin başında çatlayacaqdı. Təbrizin işğalında İsmayıla yardımçı olmuş Zəkəriyya Keçəci necə bir ihanət etdiyinin bilincinə varmışdı. Təbriz şüubi planları əlində əsir qalmışdı. İstədikləri cinayətləri törədəcəkdilər.

Zəkəriyya Keçəci Şah İsmayıla şiələşdirmə siyasətindən vaz keçməsini təklif etdi. Təbriz əhalisi şiə padşah istəməz dedi.[209] Ancaq

[209] Aləm Arayi Səfəvi 64.

sünniləri təhlükəli yaradılış, quyruqlu məxluqlar sayan Şah İsmayıl həm atalarının intiqamını almaq, həm də şüubiyənin ona verdiyi görəvi yerinə yetirmək fikrində idi. Xalqı “haq dini!”nə gətirmək istəyirdi. Özünü mütləq haq sandığından Təbriz əhlini də bu haqla tanış etmək istəyirdi. Ayrıca, Kərbəla şəhidlərinin də intiqamını sünnilərdən almaq fikrində idi. Təbriz əhli sünni olduğundan onları Əlioğlu Hüseynin qatili kimi görürdü. Üzərinə Tanrı tərəfindən bir mission qoyulduğunu düşünürdü. O mission da sünniləri yer üzündən silmək idi. O, qeybə çəklidiyi söylənən 12-ci imam haqqında bolca əfsanələr eşitmişdi. Eşitmişdi ki, 12-ci imam zühur etdiyində ilk üç müsəlman xəlifəsinin və daha sonrakı xəlifələrin məzarını açıb onları diriltdikdən sonra cəzalandıracaq. Daha sonra İslam düşməni olan peyqəmbərin eşi Ayişəni məzardan çıxarıb və nədən Əli ilə savaşdığı üçün onu yarqılayıb yaxacaq. Bütün sünnilərin məzarını söküb yenidən atəşdə yaxacaq.[*] İslam tarixində ən liberal məzhəbin banisi olan Əbuhənifənin məzarını söküb və məzarının üstündə tualet yapdırması da bu inancına görə olacaqdı. 12-ci imamın zühuru zamanı baş verəcəklərə bütün varlığı ilə inanan İsmayıl onun kimi davranmaq istəyir, sünniləri onun kimi qətl etmək istəyirdi. Özünü müsəlman sayan şüubi-

[*] Mehdinin zühuru ilə bağlı Məclisinin “Bəhar-ul ənvar” kitabının “Mehdiyi moud” bölümünə müraciət edilə bilər. Orada Mehdi gəldiyini necə qanlar axıdacağı, sünniləri necə qətl edəcəyi haqda ayrıntılı fantastik bilgi verilmişdir. Mən sadəcə cüzi bir qisminə işarə etdim.

Səfəvi, peyqəbərin namusu olan Hz. Ayişəni əxlaqsız qadın olmaqla suçlayır. Nə var ki, Hz. Ayişə və Hz. Əli arasında savaş olmuşdur. Bu savaşda kimin haqlı olduğunu tək bilən Allahdır. Həm Hz. Əli, həm də Hz. Ayişə İslamın böyükləri. Hz. Ayişə olmasaydı günümüzdəki Quran da olmayacaqdı. Əski mədəniyyət mərkəzi olan Təbriz bir dəlinin əlində əsir olmuşdu. Bu üzdən Təbriz əhalisinin dinlərinə qarışmamasını təklif edən adama Şah İsmayıl bu cavabı verir:

Məni bu iş üçün göndərmişlər. Böyük Tanrı və məsum imamlar mənimlədir. Mən kimsədən qorxmuram. Rəiyyət söylədiklərimi qəbul etməzsə, Tanrının yardımı ilə hamısını qılıcdan keçirərəm.[210] O, çocuqluq xəyallarına qarışmış olan nifrət və kinlə öyləsinə iç-içə girmişdi ki, tarixi və sosial gerçəkləri anlamaq istəmirdi, anlaya bilməzdi. Bir əmri üçün canını fəda edəcək Anadolu bozqırlarından gəlmiş qızılbaşların qeydsiz-şərtsiz itaətləri onun cəsur davranmasına səbəb olurdu. Onun baxışında dünya xeyir-şər, aydınlıq-qaranlıqdan ibarət idi. Xeyir və aydınlıq tərəfi şiə və şərlə qaranlıq tərəfi sünni idi. Xeyir və aydınlıq şər və qaranlığın kökünü qazmalı idi. Bütün bu cəzaları da Təbrizin sünni türkləri ödəməli idi. Sanki Kərbəla olayında sünni Təbrizlilər də iştirak etmişdilər. Oysa ki, Kərbəla olayında sünni-şiə ayrımı hələ yox idi. Nə Əlioğlu Hüseyn şiə idi, nə də Yəzid sünni idi. Bu məzhəblər çox sonralar ortaya çıxdı. Ərəbistanın tarixi və sosial gerçəkliyində baş vermiş bir savaşın cəzasını

---

[210] Eyni qaynaq.

indi Təbriz əhalisi ödəməli idi. İsmayıl bu dönəmdə öylə bir yaşdadır ki, onun ağlını iki amil yönləndirməkdədir: 1- Çocuq fantaziyaları 2- Şüubiyə bilgələri və bilgiləri. Bədrəddindən başlayıb İsmayılda iqtidara yüksələn hilulçuluq, yəni ruhun bədəndən bədənə keçmə görüşü şüubiyənin əlinə bir fürsət kimi düşmüşdü. İsmayılda 12 imamın ruhu mərkəzləşmiş və vəliullah olmuşdu.

Vəliullahlıq kültürünün ilkin ortaya çıxışına Sasani kültüründə tanıq olmaqdayıq. 12 imamın məsumiyəti və qutsallığı da Sasani kültürünün dirilişindən başqa bir şey olmamışdır. Çünkü imamları məsum və qutsal olaraq görmək İslam və Quran verilərinə görə şirk sayılmaqda, Allaha şərik qatmaq anlamındadır. İslama görə mütləq qutsallıq Allaha xasdır. Şahnamədə də öz əksini bulan "fərri-izədi" adında bir anlayış var. Bu anlayış Sasani kültüründən gəlmədir. Sasanilərdə şahın içində fərri-izədinin olduğuna inanılırdı. Yəni şah öz içində Tanrı ışığı daşıdığı üçün sorqusuz-sualsız ona uymaq gərəkirdi. Bu inanca görə şah doğuşdan məsumdur. Allah onları hər tür xətadan arındırmışdır. İslamiyətin çökərtdiyi bu inanc Sasani sonrası Pers düşüncə fəaliyətlərində yenidən canlanmağa başlamışdı. Sasani kimliyini yenidən diriltməyə çalışan Pers İslam alqılayışı bu dəfə "fərri-izədi" anlayışı ilə 12 imamın məsumluğunu tanımlamağa başlamışdı. Hz. Əli və İsmayılı da "şah" ləqəbi ilə tanımlamaq əslində fərri-izədi (Tanrı ışığı) anlayışı ilə bağlantılıdır. Şah günah işləmədiyi kimi fərri-izədini Sasani qızı Şəhrbanudan alan imamlar da günah işləməzələrmiş. Türk tarixinə

də girmiş olan bu inanc öncə Şeyx Bədrəddinin əsərlərində öz yansımasını bular, daha sonra Şeyx Heydər bu anlayışı qızılbaşlıq adı ilə yenidən gündəmə gətirər. Səfəvilik Sasaniliyin yenidən dirilişi olduğundan fərri-izədi də fərqli şəkildə "İsmayıl vəliullah" adı ilə ortaya çıxar. Şah İsmayılı Tanrının mütləq iradəsi kimi görmə inancı Pers-İslam anlayışının uzantısı olmuşdur. İslamiyəti dirək olaraq ana qaynaqdan almayan, Perslərdən alan Türklər qızılbaşlıq adı ilə Pers-İslam anlayışını Səfəvi dövləti adı altında imperatorluq səviyəsinə daşıdılar.[211]

Qızılbaşların Təbrizi işğal etdiyi günün ertəsi cümə günü idi. Cümə günü Şah İsmayıl "Cami" məscidinə gəldi. Camidə bulunan hər iki sünni arasında bir əli qılıclı qızılbaşın hazır durmasını istədi. Şah İsmayıl sünni məzhəbinin mənsux (batil) olduğunu duyurdu. Camidəki qalabalığın şaşqınlıqdan nəfəsləri tutulmuşdu. Sonra Əbubəkirə, Ömərə, Osmana və Ayişəyə lənət söyləməyib səssiz qalanların başlarının həmən vurulmasına əmr verdi. Minbərə çıxıb orada bulunan qalabalığa dedi: "Sünnilərdən təbərra edin (uzaqlaşın)", "Əbubəkirə, Ömərə və Osmana lənət söyləyin!" Orada əllərində qılıc duran qızılbaşlar "Çox lənət, daha çox lənət!" deyə bağırdılar. Xalq etiraz etdi və çaxnaşma qopdu. Şah yenidən yüksək səslə "Kim bu

---

[211] Ənuşirəvan Sasani dilindən Şahnamədə Fərri-izədini bu şəkildə açıqlanar:
To dadi məra fərr o fərhəng o ray
To başi be hər nik o bəd rəhnomay.
(Mənə fərr və kültürü sən verdin, hər kötülük və yaxşılığın qaynağı sənsən.)

sözləri söyləməsə öldürüləcəkdir" dedi.[212] Təbriz əhalisi şaşqın qalmışdı. Bir müsəlman necə ola bilər peyqəmbərin ən yaxın əshabələrinə, peyqəmbərin ən çox sevdiyi eşinə lənət söylər olsun, deyə qara-qara düşünürdülər. İsmayıl isə, nə səhabilərin kimliyini, nə də İslam tarixini bilirdi, nə də peyqəmbəri doğru-dürüst tanıyırdı. Onların inancına görə imamlıq görəvi peyqəmbərlik məqamından üstün idi. Sadəcə 12-ci imam kimi davranmaq ona öyrədilmişdi. Əbubəkirin, Ömərin, Osmanın və Ayişənin müsəlman olmadıqları, Əli düşmənləri olduqları çocuğun ruhuna və şüuruna doldurulmuşdu. Peyqəmbər düşməni olan onlar Əlinin iqtidar haqqını yemiş və özləri iqtidara gələrək Əbusüfyan dini olan sünniliyi yaymışlar. Ömər Əlinin evinə saldırmış və peyqəmbərin qızı Fatiməni yaralayaraq qarnındakı "Möhsün!" adlı çocuğun düşməsinə səbəb olmuşdur. Möhsün böyləcə Ömər tərəfindən şəhid edilmişdir. Bu olaydan bir neçə gün sonra da Fatimə özü şəhid olmuşdur.* Şah İsmayılın İslamla ilgili bütün bildikləri bu əfsanələrdən ötəyə keçmirdi. Bu bildiklərini əzbərləmişdi. Bunlar ona

[212] Aləm Arayi Səfəvi 64.

* Ömər bu saldırılarını edərkən Əli harda imiş və ailəsini niyə savunmurmuş bəlli deyil. Nədənsə Hz. Əli Ömərin bu qədər qabalığına, saldıqanlığına və eşi Hz. Fatiməni öldürməsinə baxmayaraq, Hz. Fatimədən olan qız Ümkülsümü Ömərlə evləndirmişdi. Nədən əcəba? Ömər haqqında şüubiyənin söylədikləri doğru isə, o zaman Ömərin Hz. Fatiməyə etdiyi zülmdə Hz.Əli də seyirci qalaraq şərik olmuşdur. Sadəcə bir nifrət ideolojisi oluşdurmaq gərəkirmiş tarixi gerçəklərə uymayan.

əzbərlətilmişdi. Bu əzbər bildiklərinin dışında onun üçün İslam anlayışı yox idi. İndi Əli və Fatimənin, Möhsünün (!) və Kərbəlada şəhid olanların intiqamını Azərbaycan türklərindən almanın zamanı gəlmişdi və Təbriz əhalisi qətl edilməli idi. Təbriz əhalisi etdikləri "suçlardan" dolayı ya tövbə etməli, ya da qətl edilməli idi. Şah İsmayıl camidə bu soyqırımı gerçəkləşdirirkən onu bu amac üçün hazırlamış olan müəllimi Şəmsi-Lahici və digər Gîlândan gələn axın gülər üzləri ilə olayın seyircisi idilər.

Şah İsmayılın və şüubiyənin nifrət etdiyi Əbubəkir haqqında özət olaraq bilgi verməkdə yarar var. Konstan Virjil[**] yazır: "Əbubəkir İslamı qəbul edən Bilalı sərbəst buraxdırmaq istədi. Bilalın ağasının yanına gedib onu satın almaq istədiyini söylədi. Bilalın sahibi bu qara köləni sataraq para qazanacağına sevinmişdi. Əbubəkir onun istədiyi paranı ödəyərək Bilalı sərbəst buraxdırdı. Peyqəmbər Bilalı müəzzin etdi. Müəzzin ərəb dilində bir məsajı başqasının qulağına çatdıran anlamdadır. Müəzzin bir sözü tələffüz edir ki, başqaları duysun. İslamda bu söz yeni anlam qazandı. İslamda müəzzin insanları öz səsi ilə ibadətə çağıran adamdır."[213] Yenə də davam edir: "Toplumun yoxsul kəsimi Bilal kimi bir kölənin insanları ibadətə səsləmələrini gördüklərində cəsarətlənib İslamı qəbul etməyə başladılar. Ömərin iki kənizi var

---

[**] Konstan Virgil George "Muhammad a Prophet for all Humanity"

[213] Konstan Virgil George "Mohəmməd peygəmbəri ke əz no bayəd şenaxt" (farsca), çevirən Zəbihulla Mənsuri, Əmirkəbir yayını, 11-ci çap, s. 82.

idi. Bu iki qadın İslamı qəbul etmişdi. İslamı buraxsınlar deyə Ömər onları işkəncə edirdi. Əbubəkir bu iki kəniz qadını da öz parası ilə satın alıb özgürlüklərini sağladı."[214] Budur Şah İsmayılın təhqir etdiyi Əbubəkir.

Camidəki əhali türkçəni Gîlək ləhcəsi ilə danışan və əlində qılıc tutan İsmayıl adında bu yabancı çocuğun "Əbubəkirə, Ömərə və Osmana lənət söyləyin!" bağırtısını yenidən duydular. Xalq iki qorxu arasında sıxışıb qalmışdı. Bir tərəfdən İslam böyüklərinə lənət söyləsələr Allahdan qorxurdular, digər tərəfdən də əllərində qılıc dayanmış öldürməyə hazır olan qızılbaşlardan. Çoxları bu sözləri duymamaq üçün barmaqları ilə qulaqlarını tıxadılar. Şəhərin İslam alimlərindən bir neçəsi camidən çıxmaq istədilər. Ancaq minbərdə əlində qılıc oturmuş Şah bu dəfə daha yüksək səslə "Təbərra edin!" dedi.[215] Kimsə təbərra etmədiyi üçün Şah camidə olanların hamısının başlarının kəsilməsinə əmr verdi. Təbriz camisi böyük bir qətlgaha dönüşdü. Kimsə qızılbaşların əlindən sağ qurtulmadı. Bunun üzərinə qızılbaşlar təbrizlilərin mallarına və namuslarına təcavüz etmək üçün sərbəst buraxıldılar. Şəhərin bütün din adamları, müəzzinləri, müəllimləri və pişnamazları tutuqlandı. Onlardan xəlifələrə lənət söyləmələri istəndi. Axirətdən qorxan Təbriz türkləri bunu etmədikləri üçün öldürüldülər. Evləri yaxıldı, qadınlarına, qızlarına təcavüz edildi. "Azərbaycan sünnilərin murdar

---

[214] Eyni qaynaq, s. 83.
[215] Aləm Arayi Səfəvi 15.

və iyrənc varlıqlarından təmizləndi."[216] Şah İsmayılın bu davranışı çirkin niyyətlər üçün tərbiyə edilmiş vəhşi bir insanın təbiətini açıqca göstərməkdədir. Səfəvi rəsmi tarixçilərinin murdar və iyrənc varlıqlar olaraq tanımladıqları qətl edilən bu insanlar Azərbaycanın din alimləri və sünni inanclı insanları idi. Qızılbaşlar Təbrizin küçələrində əllərində balta dolaşır xəlifələrə lənət göndərirdilər. Evdən dışıarı çıxıb "daha çox lənət" söyləməyənlərin evlərinə girib ailəni qətl edib qızlara təcavüz edirdilər. Anadolunun bozqırlarından gəlmiş aqressiv kütlə mədəniyət və ticarət mərkəzi olan Təbrizi məhv edirdi. Sünnilərin dəyəri sadəcə köpək qədər olduğu üçün onların köpəklərini də öldürürdülər. Təbriz heç bir zaman belə bir dəhşətlə qarşılaşmamışdı. Şəhərin öndə gələn adları başqa ölkələrə qaçmaq üçün yol axtarırdılar.[217] Təbriz sünni alimlərindən çoxu ailələrini də götürüb şəhərdən qaçdılar.[218] Bu arada şəhərin lotuları və avaraları da qızılbaşlara qatılıb qılıcla quşanaraq qadınlara təcavüz etməyə, sünniləri yağmalamağa başladılar. Qızılbaşlarla bir yerdə "təbərrayan" adında bir təşkilat qurdular. "Təbərra" ərəb dilində uzaqlaşmaq və "təvəlla" yaxınlaşmaq, sevmək deməkdir. Şiənin iki təməl qavramı "təvəlla" və "təbərra"dır. Təvəlla, yəni əhli-beyti sevmək və təbərra, yəni əhli-beyti

[216] Əmir Mahmud Xandəmir "Tarixi-Şah İsmayıl və Şah Təhmasib" 66.

[217] Venizlilərin səfərnaməsi, təırcümə Mənuçehr Əmiri Xarəzmi nəşriyatı Tehran 1349) سفرنامه ونیزیان در ایران، ترجمه منوچهر امیری انتشارات خوارزمی تهران 1349

[218] Həbib- ül Seyr Qiyasəddin Xandəmir 468.

sevməyənlərdən uzaqlaşmaq. Əhli-beyt, yəni evin əhli. Əlinin öz evi var idi. Əhli-beyt gerçək anlamda Hz. Məhəmmədin qadınlarından ibarət olmuşdur. Əhli-beyt Quranda Hz. İbrahim və Hz. Məhəmmədin ev xalqı kimi qullanılmışdır. İslamdan öncə əhli-beyt ləqəbi Qureyş qəbiləsinə aid idi. Buradakı "beyt"dən, yəni evdən məqsəd isə Kəbədən ibarət olmuşdur. İslamdan sonra "əhli-beyt" anlayışı siyasi anlam daşımağa başlamışdır. Üçüncü xəlifə Osmanın vəfatı və Əli ilə Əməvilər arasındakı xilafət yarışından sonra bu anlayışın siyasi yükümlülüyü daha da armışdır. Bu siyasi anlayışa görə əhli-beytdən amac peyqəmbərin ailəsi olaraq nitələnən Əli, Fatimə, Həsən və Hüseyndən ibarətdir. Quranda əhli-beyt üç surədə keçər. 28-ci surənin 12-ci ayəti. 11-ci surənin 73-cü ayəti. 33-cu surənin 33-cü ayəti. Daha sonrakı dönəmlərdə iqtidar savaşında bu ayətlərə dayanaraq Hz. Məhəmməddən hədislər ortaya çıxarılmışdır.

Şiəyə görə sünnilər əhli-beyti sevmədikləri üçün onlardan uzaqlaşmaq və fürsət olursa, onları qətl etmək lazımdır. Ancaq sünnilərin əhli-beyti sevmədikləri ilə bağlı heç bir bəlgə yoxdur. Kərbəla olayından dolayı sünnilər məmnun olmamışlar. O bir iqtidar savaşı olmuş. İslam tarixindəki acı hadisədir. Oluşumunda da sünnilərin rolu olmamış. Fars dilində bir də "təbər" sözü var. Fars dilindəki "təbər" balta anlamındadır. Təbər sözü "təbərra" sözünə yaxın sözdür. Təbrizdə qurulan "təbərrayan" təşkilatının iki anlamı var idi. Sünni inancı olanları qətl etmək və bir də təbər qullanaraq

qətl etmək. Bu üzdən də "təbərrayan" təşkilatının qatilləri əllərində "təbər" (balta) şəhərdə dolaşır və xəlifələrə lənət göndərilməsini istəyirdilər. Səsi çıxmayan, ya da yavaş söyləyənin başı təbərrayan təbərləri (baltaları) ilə vurulurdu. Təbərrayan təşkilatını yaxşı anlaya bilməmiz üçün İranda Xomeynidən sonra qurulmuş olan "Sipah Silahlı Örgütü" göz önündə bulunmalıdır. Xomeyni, Şah İsmayılın kopisi olduğu kimi "sipah" təşkilatı da "təbərrayan" təşkilatının kopisi olmuşdur. Təbərrayan təşkilatının Təbrizdə qətl etdikləri insanlar haqqında tarixdə bilgilər var: Bir neçə gün içində Təbrizdə 20 min əhali öldürüldü. Şah İsmayılın Təbrizdə törətdiyi cinayətə bəşər tarixi tanıq olmamışdır. Bəlkə Şah İsmayılı Neronla qiyaslamaq olar.[219] Şah İsmayılın törətdiyi qətllərin xəbəri Avropaya da gedib çatmışdı.

Şah İsmayılın anası Aləmşahbəgüm Bayındırlı soyuna mənsub olan xanım idi. Uzun Həsənin qızı idi. Təbrizdə qətl edilən bayındırlılar onun qan qohumları idi. Qardaşları, qardaşlarının uşaqları, bacıları, əmiləri idi. Bu qətli durdurmaq üçün Şah İsmayılın anasından yardım istənilmiş olmalı ki, Aləmşahbəgüm oğluna qarşı çıxdı. İsmayılı Təbrizdə bayındırlı soyqırımı törətməkdən saqındırdı. Adam öldürməkdən ləzzət alan Şah İsmayıl anasını da onun əmrinə qarşı gəldiyi üçün öldürdü. Tarixdə anasını öldürən ünlü hökmdarın biri Neron isə, digər də Şah İsmayıldır. Şah İsmayılın anasını

---

219 Venizlilərin İranda səfərnaməsi, çevirən: Mənuçehr Əmiri, Xarəzmi nəşriyyatı, 1381( 2003)-Tehran, s. 436.

öldürməsini venizli tacir bu şəkildə anlatmaqdadır: "... Şah İsmayıl Təbrizə girdiyində heç bir müqavimətlə qarşılaşmadı. Buna baxmayaraq şəhərdə qətl törətdi. Onun əmri üzərinə hamilə sünni qadınların da qarnını sökdülər. Sultan Yəqubun və digərlərinin məzarını söküb sümüklərini çıxarıb yaxdılar. Təbrizin 300 fahişəsini bir yerə toplayıb qılıcları ilə ikiyə parçaladılar. Əlvəndə bağlı 800 kişinin başını kəsdilər. Təbrizin köpəklərini də öldürdülər. İsmayıl bir çox cinayət törətdikdən sonra anasını hüzuruna çağırtdırdı. Anasının bir Bayındırılı albayı ilə evləndiyini bildikdən sonra əmr verdi ki, gözləri önündə onun başını kəssinlər. Nerondan sonra böylə bir zalimin tarixdə olduğunu sanmıram."[220]

Qızılbaşlar çox qısa zaman içində Təbrizin bütün tarixi memarlıqlarını sünni ürünü olduğundan söküb yox etdilər. Səfəvi öncəsi Təbriz memarlığından Ərk qalasından və Göyməsciddən başqa heç bir şey qalmadı. Bunların qalmalarının səbəbini irəlidə anladacağam. Dörd xəlifənin adları yazılı olan camiləri və başqa yerləri sökdülər. Sünni bayındırlılardan qalan bütün memarlıq miraslarını sökdülər. Sünnilərin qutsal yerlərində at-eşşək bağlayıb tövləyə dönüşdürdülər. Qəbristanlıqlarda daşlar üzərinə xəlifə adları yazılan məzarları sökdülər. Bayındırlıların və Qaraqoyunluların məzarlarını tamam sökdülər. Təbrizdən sonra sıra başqa şəhərlərə gəlirdi.

---

220 Venizlilərin İranda səfərnaməsi, çevirən: Mənuçehr Əmiri, Xarəzmi nəşriyyatı, 1381( 2003)- Tehran, s. 436.

Bütünüylə sünni olan Ərdəbil əhalisi ilə də Təbrizdəki kimi davrandılar. Ərdəbilin fəqihlərini, din müəllimlərini, müəzzinlərini yaxalayıb öldürdülər, qadınlarına və qızlarına təcavüz etdilər. Şah İsmayıl əhaliyə əmr verdi ki, evlərinin içinə kərmə-təzək doldursunlar. Təbərrayan Ərdəbilin küçələrində dolaşır və "Əbubəkirə, Ömərə, Osmana lənət" deyə bağırırdılar. Hansı evdən səs çıxmırdısa, evə qalanmış olan odun yaxılırdı, ev yanıb külə dönürdü. Evlərin içində çocuqlar da yanıb yaxılırdılar.[221] Bir il içində Azərbaycan Xandəmirin dediyi kimi "murdar və iyrənc" adamlardan təmizləndi. Öldürülməyənlər də qaçıb başqa ölkələrə yerləşdilər.[222] Təbrizin qızılbaşlar tərəfindən işğal edilmə xəbəri Anadoluda ıldırım sürəti ilə yayılmış və türkmən qızılbaşlarda ruh yüksəkliyi yaratmışdı. Anadoludan Azərbaycana qızılbaş axınları başlamışdı. Öz yurdlarını tərk edib Azərbaycana axışan qızılbaş türkmənlər mal-davarlarını dəyər-dəyməzə satır, ya da qızılbaş ordusuna bağışlayırdılar. Osmanlının basqılarından və ağır vergilərindən bezmiş olan ələvilər bir qurtuluş yolunun açıldığını sanmışdılar. Ələvi ozanlar "Açılın qapılar şaha gedəlim" deyə coşurdular.[*]

---

[221] Aləm Arayi Səfəvi 54.

[222] Həbib- ul Seyr 468.

[*] Pir Sultan Abdalın bir çox şeir parçaları 16-cı əsr Anadoludakı qarış və pozuq durumun göstəricisidir. Bu dördlüklərə baxalım:

Bu il bu dağların qarı ərıməz
Əsər badi-səba, yel pozuq-pozuq
Türkmən qalxıb yaylağına yürüməz
Yıxılmış əşirət el pozuq-pozuq

Osmanlı tarixçisi Kamal Paşazadə Anadolu qızılbaş türklərinin Azərbaycana axışını bu misralarla anladar:
Türklər tərk etdilər diyarlarını
Yox bahaya satdılar davarlarını.[223]

Yenə Səadətdin Hoca deyə bir başqa Osmanlı yazarı İsmayılın taxta çıxmasını və ağılsız türkləri özünə mürid etməsini bu şəkildə anladar:
Başına tac aldı çıxdı o pəlid
Etdi biidrak ətrakı mürid.[224]

Bu zaman qızılbaşların yağmaladığı qənimətləri almaq üçün Təbrizdə bulunan Venizli bir tacir xatirələrində yazır:

Təbrizdə olduğumda Anadoludan könüllü olaraq Şah İsmayılın buyuruğu altına və onun bayrağının altına keçən axınları gördüm. Özəlliklə Anadoludan, Qaramandan axınlar

---

Qızılırmaq kimi çağladım axdım
Əl vurdum köksümün bəndini yıxdım
Gül üzlü cərənin bağına çıxdım
Girdim baxçasına gül pozuq-pozuq

Əlim tutmaz güllərini dərməyə
Dilim tutmaz xəstə hâlın sormaya
Dörd cavabın mənâsını verməyə
Sazım düzən tutmaz tel pozuq-pozuq.

Pir Sultan'ım yaratıldım qul deyə
Zâlim paşa əlinden mi öl deyə
Dostum məni ısmarlamış gəl deyə
Gedəcəyəm amma yol pozuq-pozuq.

[223] Faruk Sümer “Safevi devletinin kuruluşu ve gelşmesinde Anadolu Türklerinin rolü”

[224] Eyni qaynaq.

gəlirdi. İsmayıl da onlara inayətdə bulunur, vəzifə və məqam verirdi.[225] Qızılbaşların sayı artdıqca Azərbaycan türklərinin qara günü də artırdı. Azərbaycana çatan hər qızılbaş sünni öldürüb şeyxlərinin intiqamını alırdı. Əslində isə, intiqam adı altında xalqın mallarına sahiblənirdilər. Venizlilərin anlatdıqlarına görə Təbriz, Ərdəbil və Zəngan kimi Azərbaycanın böyük şəhərləri qanlı günlər keçirir xalq qətl edilir, aclıq və səfalətdən yox olurdu. Yerli əhalinin qızları və qadınları fahişəliyə zorlanırdı. Yaraşıqlı sünni cavan oğlanlarla seks yapır onlara cinsi təcavüz edirdilər. Günümüzdə İran İslam zindanlarında oğlanlara edilən cinsi təcavüz Səfəvi kültürünün mirası olsa gərək. "Şah İsmayıl əmr etdi ki, Təbrizin ən yaraşıqlı və gözəl gənc oğlanlarından 12 oğlan gətirsinlər. Sarayda şah onlarla seks yapdı. Sonra onlara təcavüz edilməsi üçün qızılbaşlara buraxdı."[226] Bütün bu yöntəmlər sünniliyi aşağılamaq üçün idi. Bu yolla Azərbaycan əhalisi aşağılanmış məzhəblərindən asanca qopa bilərdilər. Bir tərəfdən qətl, digər tərəfdən aşağılama. Bunların hesabına Azərbaycan Səlcuqlu, Eldəgizlər, Qaraqoyunlu və Bayındırlı türk kültürü və kimliyindən tamamən qoparaq İran şüubiyə kimliyinin bir parçası olacaqdı.

Necə bir tuzağa düşdüklərinin bilincində olmayan qızılbaşlar Şah uğrunda fədakarlıqlarına davam edirdilər. Şah İsmayıl Təbrizi işğal edər-etməz ölkədə farslaşama başlatdı. Farsların dövlətin həssas vəzifələrinə

[225] Venizlilərin səfərnaməsi 413.
[226] Eyni qaynaq.

yerləşdirilmə sürəci davam etdi. Şah İsmayılı iqtidara daşıyan əsasən yeddi kişidən ibarət olan "İxtisas qurulu" idi. Buna türk dilində "Lalalıq" deyilirdi. Lalalıq türk bəylərinin yönətim qurulu idi. Şah İsmayıl başına tac qoyduqdan sonra Lalalıq qurulunu qaldırdı. Yerinə "Vəkili-nəfsi-hümayun" gətirdi. Bu ifadə istər-istəməz bizə 20-ci əsrdə Pəhləvilərin siyasi qavramlarını xatırladır.

Şah İsmayıl dövlətin quruluşundan altı il sonra 1508-ci ildə Hüseyn bəy Şamlunu bu görəvdən aldı və yerinə bir fars oturtdu.[227] Bu görəv Şah İsmayılın həm "padşah" olaraq siyasal iqtidarının, həm də "mürşidi-kamil" olaraq inancsal iqtidarının vəkillik qurumu idi. Bu qurum bir sürəliyinə həm də başbaxanlıq görəvini yapdı. Vəkil, Şah İsmayılın "alter ego"su, yəni ikinci kişiliyi idi. Bu qurumun yaradılması, Şah İsmayıl nəzdində, teokratik yönətim biçimi ilə siyasal brokrasi arasındakı boşluğu qapatan körpü idi.[228] Bu tarixdən etibarən Fars ünsürü ortaya girmiş, quruluşunda heç bir qatqıları olmayan aristokratik ailələr, ortodoks şiə aracılığı ilə gələnəksəl rollarını oynamağa başlamışlar. Yönətimə qatılacaqlar və sonra kəndi inanc, dil, kültür və denəyimləri ilə dövləti ələ keçirəcəkdilər.[229] Qızılbaş bəylərin etkisini azaltmağa yönəlik Şah İsmayılın bu davranışı bir İran dövləti yaratmaya yönələn ilk

[227] Ankara Hüseyin Gazi Derneği, YOL dergisi sayı 19 İsmail Kaygusuz "Aleviliğin Kızılbaş Siyasi Hareketi ve Şah İsmail" Ankara.
[228] Eyni qaynaq.
[229] Eyni qaynaq.

bəlirti idi.[230] İqtidardan uzaqlaşmalarını görən qızılbaşlar buna etirazlarını Şahın təyin etdiyi elbayları (valiləri) teror edərək ortaya qoyarlar. 1508-1524 illəri arasında beş Fars, Şah vəkili bir-birini izlədi. Şah İsmayıl, Şah vəkilini qızılbaş ordusunun baş komutanı əmir-ul üməranın (əmirlərin əmiri) səlahiyətinə eşit qılmışdı. Şah İsmayılın bu davranışına etiraz olaraq beş vəkildən üçünü qızılbaşlar öldürdülər.[231] 1508-ci ildən sonra qızılbaşlar necə bir tuzağa düşdüklərini hiss etməyə başlamışdılar. Başlarına dillərini bilmədikləri farsların keçəcəyini ağıllarından keçirməmişdilər. Bu üzdən də 1508-ci ildən sonra Anadolu qızılbaşları artıq şah İsmayıla əsgər verməz.

Şah İsmayıl 1509-cu il Yıldızdağı toplantısından sonra kəndisinə əsgər verməyən Anadolu qızılbaşlarını üzü üstə buraxmışdı. 1511-ci ildə bozquna uğrayan Şahqulu tərəfdarlarını Səfəvilərə sığınarkən, karvanlara basqın yapmışlar bəhanəsi ilə öldürtmüşdü.[232]

Şah İsmayıl zamanında isna-əşəri şiə alimləri yüz illərdən sonra şiə bir şaha və ölkəyə sahib olmuşdular. Təqiyə etməkdən çıxıb açıqca fikirlərini bildirirdilər. Bu üzdən də Şah İsmayılın bütün cinayətlərinə və müsəlmanlar üzərinə yapıdğı soyqırımlara xoşgörü ilə yanaşır, onun daha çox cinayət törətməsi üçün dini hökmlər də çıxarırdılar. İsna-Əşəri alimlərə görə bütün bu

[230] Eyni qaynaq.
[231] Eyni qaynaq.
[232] Eyni qaynaq.

soyqırımlar din yolunda idi. Hətta Şah İsmayılın şarab içm\sinə də xoşgörü ilə baxırdılar.[233]

Böylə bir sual ortaya çıxır. Bölgədə heç bir fiqhi kitabı və alimi olmayan şiə inanışını İsmayıl nədən rəsmi dövlət məzhəbi kimi qəbul etdi? O, nəyi hədəfləmişdi? Bu suala cavab tapmaq çox çətindir. Səfəvi ailəsində ilk olaraq kimin şiəni qəbul etdiyini bilmirik. İsmayılın dədələrindən hansı şiə olmuşdur? Bu haqda təqdim edilən bəlgələrin və bilgilərin heç biri yetərli deyildir. Bu suala cavab vermək üçün o zamankı fiqhi kitabları araşdırmaq gərəkir. Bunun üçün bir sorun var. O kitablar əldə deyildir.[234]

Qızılbaş türkləri Şah İsmayıl vasitəsi ilə şüubiyənin necə qullandığı açıqca görülməkdədir. Araşdırmalarımızın davamında Şah İsmayılın bir şüubiyə məmuru görəvini yapdığını görəcəyik.

Yeri gəlmişkən bəzi qaynaqlara dayanaraq Şah İsmayılın necə sadist xəstə olduğuna işarə etmənin yarar vardır:

"Şah İsmayılın əmri üzərinə qızılbaşlar şirvanlıların həyatını söndürdü. Qızılbaşlar mürşidi-kamillərinin əmri üzərinə Şirvanda qətl etdiklərinin kəllələrindən minarə düzəltdilər. Hətta hamilə qadınların da qarnını söküb çocuqlarını öldürdülər. Mürşüdi-kamil bununla da yetinməyib əmr verdi ki, Sultan Yəqubun məzarını söküb sümüklərini çıxarsınlar. Düşmən

---

[233] Rza Niyazmənd "İran tarixində şiə" (Şiə dər tarixe İran), s. 143.

[234] Hans Robert Roemr "Yeni çağda İran" (İran dər əsre cədid), Tehran universiteti yayınları, sayı 2535, s. 258.

sandığı əhalinin qadınlarını və qızlarını təcavüz üçün orduya buraxdı. Bir sözlə mürşidi-kamil diriləri məzara göndərdi və məzardakıları da söküb çıxardı”[235] “Mürşidi-kamil Təbrizdə 20 min və Təbəsdə 7 min əhalini qətl etdi.”[236] “Təbirzdə 20 min nəfər qətl etdikdən sonra əhali qızılbaş bayrağı qaldırıb və Əbubəkirə, Ömərə lənət deməyə başladı.”[237]

## Səfəvi dövlətinin tətbiqatı

Şah İsmayıl Təbrizi İşğal etdikdən sonra özünü İran şahı olaraq duyurdu. O, çocuqluq illərini İstəxr qalasında və Karkiya sarayında dörd divar arasında keçirmiş, Təbrizin işğalından

---

[235] Həsən Rumlu “Əhsən-üt təvarix”, Tehran, 12-ci cild, s. 92.

[236] Nəsrullah Fəlsəfi, Birinci Şah Abbasın həyatı”, 3-cü cild, s. 32. “Rövzət-üs Səfəviyyədən alıntı.

[237] G. Angiolello, “Early voyages in Persia” II. P. 104.

öncə təqribən bir il də qızılbaşlar arasında olmuşdu. Yeddi yaşından 14 yaş arasına qədər Gîlânda olmuş geniş irtibat çevrəsi olmamışdı. Gîlânda olduğu müddətcə digər qardaşlar haqda bilgi verilməmişdir. İskəndər bəy Türkmən İbrahimin Ərdəbilə geri döndüyünü yazır. Ərdəbildə öylə məşhur bir soydan olan çocuq məchul yaşaya bilməzdi. Onlar axtarışdaydılarsa, İbrahim yaxalanıb sorqulanmalı, axtarışda olan qardaşlarının harda olduqları sorulmalı idi. Yoxsa nədən yalnızca bir tək yeddi yaşında İsmayıl adlı çocuq axtarılmalı idi?

Yüzlərcə kilometr uzaqlıqdan, Anadoludan İsmayılın ayağını, ətəyini öpmək üçün qızılbaşlar ziyarətinə gəlirdi. Qızılbaşlar bu ziyarəti Məkkəyə getməyə bərabər bilir, həcc adlandırırdılar. İsmayıl qızılbaşların onu bu şəkildə qutsamalarını gördükcə istər-istəməz çocuqluq dünyasında fərqli düşüncələr yaradır və gerçəkdədən də özünü yenilməz sanırdı. Çünkü ruhunda imamların ruhunun barındığına inanılırdı. Onu ziyarət edən minlərcə qızılbaş kütləsi İsmayılın özünü bu şəkildə görməsini istəyirdi. O da bu istəklərə olumlu cavab verdi və qızılbaşların yenilməz vəliullahı, bəklənən mehdisi sandı özünü. Allahın yer üzündə tək vəlisi olduğuna inandı, inandırıldı. Şirvandakı ilk qələbəsi bu inancı onda daha da gücləndirdi. Böylə bir inancla Təbrizdə başına tac qoyub Tanrı dövlətini, yəni Səfəvi dövlətini qurdu. Təbrizdəki ilk qonuşmasında və türk-sünni soyqırımı əmrini verdiyində göylər tərəfindən görəvləndirildiyini deyir və məsum imamların

onun yardımçısı olduğunu söyləyirdi. Şəmsəddin Lahici və digər pərdə arxasındakı şüubiyə uzmanlarının yardımı ilə Şah İsmayıl səltənətin təşkilatını qurmağa başladı.

Hüseyn bəy Lələ şahın vəkili təyin edildi və qızılbaşların genəl qurmay başqanı olaraq “Vəkili-nəfsi- Hümayun” təşkilatının başına keçirildi. Əmir-ül üməra (əmirlərin əmiri) adlandı. Hüseyn bəy Lələyə “ata” da deyilirdi. Onu Şahın mənəvi atası sayırdılar. Hüseyn bəy Lələ hərbi işlərdə qərar verəcək olan ilk kişi oldu. Qızılbaşların yağmaladıqları malların qeydə alınması üçün dəftər işlərinə baxacaq önəmli biri lazım idi. Qızılbaşların yazıb-oxumaları yox idi. Bayındırlı dövlətində katiblik etmiş və İsmayılın Təbrizi işğal etməsinə yardımçı olmuş Zəkəriyya Keçəci “Vəziri-divani-ə´la” ləqəbi ilə bu iş üçün təyin edildi. Yarqının başına isə, Molla Şəmsəddin Lahici gətirildi.[238] Bütün hüquq düzəni Şəmsəddin Lahici tərəfindən şüubiyə-şiə qurallarına görə düzənlənəcək və zaman axışı içində “mollalıq” adında İslam tarixində bənzəri olmayan bir institut qurulacaqdı. Şüubiyə arxasınca iz buraxmadığı kimi, Molla Şəmsəddin Lahicinin də haqqında önəmli bilgi Səfəviyə tarixində verilməmişdir. Şah İsmayılın yetişdiricisi, Səfəvi dövlətinin pərdə arxasındakı amillərdən biri olan Şəmsəddin Lahici. Böyük bir dövlətin baş yarqıcı olan bir adamın tarixdə belə gizlin qalması çox maraqlıdır. Onun haqqında verilən bilgi daha öncə anlatdıqlarımın dışında deyildir. İsmayılın

[238] Əhsən- üt təvarix 12-ci cild, s. 61.

müəllimi olmuş, Gîlânda onu eyitmişdi. Səfəvi dövləti qurulduğu zaman bayındırlılardan qalan yarqı düzənini, hüquq sistemini tamamən rədd etdilər və yeni hüquq düzəni üçün bir tək kitabları da yox idi. O dönəmlərdə hüquq düzəni şəriət əsasında idi. Sünni fiqhini Səfəviyə qəbul etmədiyi üçün yeni hüquq düzəni oluşdurulmalı idi. Yəni şiə fiqhini təşkil etməli idilər. Şiə fiqhini biləcək tək adam Azərbaycanda yox idi. Bunun oluşumu üçün də zaman lazım idi. Şəmsəddin Lahici və pərdə arxası digər şüubiyə adamlarının planlamaları üzərinə qüllati-şiənin yuvası olan Lübnandan dəstə-dəstə şiə fəqihlər Təbrizə dəvət ediləcəkdi. Öncə bütün hüquq düzəni Şəmsəddin Lahiciyə buraxılmışdı. Molla Şəmsəddin “təbərrayan” teror təşkilatının fikir dədəsi olaraq bilinir. Təbərrayan təbərləri (baltaları) ilə Təbriz əhalisini fars Molla Şəmsəddinin buyuruqları üzərinə öldürürdülər. Şüubiyə Firdovsinin “Şahnamə”də yazdığı sifarişi yerinə gətirməkdə idi. Firdovsi türkün qanını tökməkdən, türk öldürməkdən daha zövqlü bir şey olamaz, türkün soyu kəsilməlidir yazmışdı.[239] Təbrizdə də türkün soyunu kəsməyə

---

239 Firdovsi “Şahnamə”
Ke an türk bəd rişə vo rimən əst
Ke həm bəd nəjad əst o həm bəd tən əst
Təne türki-bədzaat bican konəm
Ze xunəş dele səng mərcan konəm.
Əz an pəs beporsi əz an türki-zeşt
Ke ey dozəxi ruy dur əz beheşət
Çe mərdi o name nəjade to çist?
Ke zayənde ra bər to bayəd gerist
Soxən bəs kon əz hormoze türk zad
Ke əndər zəmane məbad in nəjad

başlamışdılar. Əski bir şüubiyə sifarişi idi. Şüubiyənin əski fikir öndərlərindən olan Firdovsinin buyuruqlarını 16-cı əsrdə fars zehniyəti səfəviyə adı ilə formolizə etmişdi. Tətbiqatçısı isə, Anadolunun bozqırlarından gələn adlarını bilə yaza bilməyən köçəri türklər idi. Sağını-solunu, gələcəyini anlamayan və bir batil inancın bağnazı (fanatiyi) olan qızılbaş türklər. Yeni dövlətin hüquq düzəninin oluşdurulması tamamən Molla Şəmsəddin Lahiciyə buraxılmışdı. Bir tək cümlə türkçə bilməyən, təmiz fars olduğunu savunan, Sasani kimliyinə bağlılığı ilə övünən bir kişiyə. Şəmsəddin Lahici, Sasani kimliyinə mənsubiyətindən dolayı qürur duyan Gîlân Karkiya kiçik dövlətindən Təbrizə gəlib yerləşmişdi. Şah İsmayılın bütün psikolojisini bilməkdədir, çünkü Gîlânda onun müəllimi

---

Ke in türkzədə səzavar nist
Kəs u ra be şahi xəridar nist
To xaqan nəjadi nəi əz qobad
Ke kəsra to ra tac bər sər nəhad.
که آن ترک بد ریشه و ریمن است
که هم بد نژاد است و هم بد تن است
تن ترک بد ذات بی جان کنم
ز خونش دل سنگ مرجان کنم
از آن پس بپرسید از آن ترک زشت
که ای دوزخی روی دور از بهشت
چه مردی و نام نژاد تو چیست؟
که زاینده را بر تو باید گریست
سخن بس کن از هرمز ترکزاد
که انذر زمانه مباد این نژاد
که این ترکزاده سزاوار نیست
کس او را به شاهی خریدار نیست
تو خاقان نژادی نه از کیقباد
که کسرا تو را تاج بر سر نهاد

olmuş, onun ruhunun memarı olmuşdu. Şah İsmayılın ağlındakı bütün bilgiləri Şəmsəddin onun qafasına doldurmuşdu. Gîlânda altı illik müəllimliyi sırasında Şah İsmayılın beynini əsir alan Lahici indi isə, bütün Azərbaycanı əsir almaqdadır. Həm Şah İsmayıl adlı bir çocuğu arxada idarə etməkdədir, həm də Azərbaycanın tarixi türklük bağlarını sökmək üçün planlar hazırlamaqdadır. Bu tətbiqatında o, bir tək adam deyildir. Pərdə arxasında fars çevrəsi ilə bir yerdə əməl etməkdədir. Bu tətbiqat nəticəsində Azərbaycan türk kimliyindən və türk dünyasından qoparılaraq fars inancının və fars şüubiyə kimliyinin içində həbs ediləcəkdi. Saxta və xəyalı Ənuşirəvan Sasani ədalətinin nostaljisi ilə yaşayan şüubiyə Təbrizdə yuvalanmağa başlamışdı. Bu planlar üzərinə çox qısa sürədə qızılbaşları da etkisiz hala gətirəcək, “türk!” deyərək aşağılayıb dövlət düzənindən uzaqlaşdıracaqdılar. Səfəvi dövlətinin qurulduğu andan etibarən türk sözünün içi boşaldılacaq və bu etnik qavramın içi aşağılıq duyqularla doldurulacaqdı. Bu sürəc könüllü asimilasionun əsasını qoyacaqdı. Öylə ki, son 500 il zaman içində, yalnız səfəvizədə türklər hızla asimilə ediləcəkdir.

Şah İsmayılın ilk illəri ilə bağlı tarix kitabları onun Azərbaycanda soyqırım törətməsindən başqa bilgi verməməkdədir. Sünniləri bütün çocuqları ilə bir yerdə qətletmə kimi bilgilər tarix kitablarında boldur. Tarixi verilər din və məzhəb mövzusunda Molla Şəmsəddinin Səfəviyədə birinci şəxs olduğunu göstərir. Birinci güvənilir şəxs olmasının səbəbi Şah İsmayılın çocuqluq

xatirələrinə dayanmaqda idi. Çünkü Gîlândakı gizlin həyatında ondan dərs almışdı. Bu arada, özəlliklə Səfəvi dövlətinin qurulması ilə Anadoludan axınlar davam etməkdə idi. İskəndər bəy Türkmən 72 türk qəbiləsinin axınından bəhs edər.[240]

Azərbaycan şəhərlərindəki şiələşdirmə və şüubiyələşdirmə qorxunc öldürmələrlə böyük uğurla davam edirdi. Azərbaycan qısa sürədə bir tərəfdən qətllər sonucu olaraq, digər tərəfdən də ölkəni tərketmələrin nəticəsi kimi sünni kimliyindən və tarixi həyat tərzindən ayrılaraq iranilәşirdi. Şah İsmayıl və qızılbaşları sevsək də, sevməsək o, bizim tariximizdir. Ancaq son 500 il içində Səfəvi planı olaraq türk dilinin farslaşdırılması və türklüyün doğal varlığından boşaldılması söz qonusudur. Şah İsmayıl açan cığırda irəliləyən tarix sürəkli fars kimliyini inkişaf etdirmişdir. Sonuc olaraq bu tarixin içindən modern fars dövləti doğmuşdur. İran İslam Cümhuriyəti Səfəviliyin modern variantıdır. Tarixi olayları səbəbinə və nəticəsinə görə araşdırmaq gərəkir. Səfəviyət nəticə olaraq fars dövləti doğurmuşdur. Heç bir nəticə səbəbinin dışında ortaya çıxmaz. Səbəbi bilməmək nəticənin səbəbsiz olması anlamında deyildir. Səbəb-nəticə arasındakı dialektik bağların incələnməsi ilə tarixi gerçəklərin açıqlanması elmiliyə daha yaxın ola bilər. Bu, özəlliklə İbni-Xəldun tərəfindən ortaya qoyulmuş bir araşdırma yöntəmidir. Yəni tarix, sadəcə rəvayətlərdən, nağıllardan ibarət deyildir. Onun

[240] 1084 -1087 عالم آرای عباسی. Aləm arayi-Abbasi 1084-1087.

ürünləri var. Tarix, yalnız səbəb olmadığı kimi, sadəcə nəticə də deyildir. Bir bütündür. Bunları bir bütünlük bağlamında araşdırmaqda yarar var. Osmanlının nəticəsi modern türk dövləti və səfəviliyin nəticəsi modern fars dövləti olmuşdur. Bu verilər nəyi göstərməkdədir? Bu verilər göstərir ki, İslam sonrası böyük Asiya və Orta Doğu tarixi türk-İslam doğrultusunda irəlilərkən, Səfəviyətlə bu bölgənin böyük qismi fars-şiə-şüubi irqçiliyi istiqamətinə sövq edilmişdir. Çünkü yalnız səfəviyətin nəfəsi toxunan indiki İran bölgəsi türklərin əlindən çıxmış farslara təslim edilmişdir. İndiki Azərbaycan cümhuriyətinin türk dilli bir dövlətə dönüşməsi də tamamən təsadüfün nəticəsidir. Tarixi qanuna uyqunluğun məhsulu deyildir. Yəni “Türkmənçay” andlaşması ilə daha sonra Azərbaycan adlanacaq olan o bölgə səfəviyətin tarixi mühitindən ayrılmasa idi, indi ora da Təbriz və digər şəhərlər kimi farsizə edilmiş olacaqdı. orada milli dövlətin təşkili səfəvi tarixi mühitindən rus gücü hesabına qopmanın nəticəsidir. Güney Azərbaycanın da qurtuluşu böylə bir qopuşla mümkün olacaqdır. Çünkü Səfəvi tarixi mühiti fars zehniyəti ilə sərtcə donatılmışdır. Yoxsa Bakının Təbrizdən nəyi artıqdır ki, Bakı öz dilində yazıb oxudu, ancaq Təbriz son yüz ildə fars milliyətçiliyinin teorilərini həm yazdı, həm də tətbiq etdi. Bu günkü fars-İran dövləti tam olaraq səfəvilərdən başlayan sürəcin ürünüdür. Hər qopuş yeni fərqli oluşum sağlar. Səfəviyətlə Azərbaycan eldəgizlər, səlcuqlular, bayındırlılar kimi möhtəşəm türk keçmişindən qoparıldığından

farslaşma məcrası içinə soxuldu. Türkmənçay andlaşması ilə Azərbaycan Cümhuriyəti Səfəvi tarixi mühitindən qopduğundan türkləşdi. Səfəvizədə mühitdə türklük şüuru doğmaz, doğamaz. O sistem fars-şüubiyə-şiə irqçiliyi ilə sərt bir şəkildə toxunulmuşdur. 1930-cu illərə qədər Azərbaycan Cümhuriyəti bölgəsində də yazışma və düşüncə dili farsca idi. Rus kolonizasionu fars dilini oradan dışlar oldu. Səfəvi fəlakətini başqa bir fəlakət ortadan qaldırdı. M. Ə. Rəsulzadə rusları xeyir verən düşmən adlandırar.[241]

## Yeni savaşlar

1502-ci ilin qışında Əlvənd bəy Bayındırın Ərzincanda düzənli bir ordu ilə Təbrizə saldırmaq istədiyi xəbəri gəldi. Şah, qızılbaş ordusunun başında Ərzincana yola düşdü. Əlvənd bəy ya qızılbaş qarşısnda dirənə bilmədi, ya da Təbrizə girmək planından dolayı Ərzincanı tərk edib Naxcıvana yollandı. Qızılbaşlar Ərzincana vardıqlarında Əlvənd bəy Naxcıvandan Təbrizə girdi. Təbriz əhalisi əski

---

[241] Rəsulzadə “Qafqaz türkləri” kitabında bu durumu farsca bu misra şeirlə nitələr:
“Ədov şəvəd səbəbi-xeyr gər xuda xahəd”- Tanrı istərsə düşmən xeyrlərə səbəb olar, ruslar kimi.

mutlu günlərə, dövlətin insanların inancına müdaxilə etmədiyi günlərə geri döndüklərini sevinclə qutladılar. Ancaq onların sevinci uzun sürməyəcəkdi. Qızılbaşlar Təbrizə geri döndülər. Əlvənd bəy Təbrizin dışında onları qarşıladı və savaş başladı. Əlvənd bəy bu dəfə də yenilib Həmədana, ordan da Bağdada qaçdı. Sonra da Diyarbəkirə və Ərzincana geri döndü və bir ildən sonra Ərzincanda öldü. Qızılbaşlar təkrar Təbrizə girdiklərində Təbriz əhalisini Əlvənd bəyi sevinclə qarşıladıqlarından dolayı sərt şəkildə cəzalandılar. Evləri yenidən atəşdə yaxdılar.

Bu zaman Şirazda bulunan Murad Bayındır ordusuyla Azərbaycana tərəf hərəkətə başlamış və Həmədanda otraq salmışdı. 1503-cü ildə Murad Bayındır İsmayılın tabelik istəməsini rədd etmişdi. İsmayıl 12 minlik qoşunla Təbrizdən savaşmaq üçün yola çıxdı. Qızılüzən çayını keçib Həmədana doğru yürüdü.[242] Muradın 70 minlik ordusuyla 1503-cü ildə savaş başladı.[243] Murad Bayındır yenilib Şiraza geri döndü. Həmədan və çevrəsi qızılbaşların kontroluna keçdi. Qızılbaşlar İsfahana doğru hərəkət etdilər. Qısa sürədə İsfahanı ələ keçirdilər. İsfahan ta səlcuqlardan bəri önəmli siyasi mərkəzlərdən biri idi və əhalisi sünni məzhəbində idi. İsfahanda sünni mədəniyət mirası nə vardısa, hamısını yox etdilər. Bu yox edilənlər Səlcuqlardan qalan miras idi. Səfəviyət bayındırlı türk dövlətini bu yerlərdən də silib fars gələcəyinə buraxdı. Təbrizdə uyqulanan aşırı şiələşdirmə politikası qanlı bir şəklidə İsfahanda da davam etdi.

[242] Əhsən-üt təvarix s. 330.
[243] Eyni qanyaq.

İsmayıl Anadoludan yenicə gəlmiş Durmuş Xan adında gənc bir qızılbaşı İsfahanın elbayı (valisi) təyin etdi. 1504-cü ildə Murad Bayındırın bütün ölkəsi qızılbaşlar tərəfindən ələ keçirildi.[244] Artıq qızılbaşların önündə heç bir əngəl qalmadığından körfəzə qədər irəlilədilər. Murad Bayındırın yenilgəsi bölgə hakimlərinin İsmayıla könüllü təslim olmalarına səbəb oldu. İsmayıla hədiyə göndərib yanında olduqlarını duyururdular. Qızılbaşların nəfəsləri toxunduğu yerdə qanlı şəkildə şiələşdirmə və ya nəticə etibarı ilə şüubiyələşdirmə davam edirdi.

Səlcuqlar dönəmindən başlayaraq bu bölgələrdə türklər məskunlaşmağa başlamışdılar. Moğolların gəlişi ilə bölgədə türk nüfusu daha da artmışdı. Bayındırlılar dönəmində türklər bu bölgənin gerçək sahibləri olmuşdu. Səfəvilərdən öncəki dövlətlərin xalqın inancı ilə heç bir işləri olmadığından türklərin bölgədəki varlıqları say baxımından üstünlük təşkil edirdi. Səfəvilərin şiələşdirməsi və şiənin də dilinin və ədəbiyatının farsca olması səbəbi ilə bu bölgələrdə yaşayan türklərin hızlı bir şəkildə farslaşmaları başladı. Tarixi sosial toxu (şəbəkə) Səfəvilərin məzhəbi əməliyyatları nəticəsində pozulmuş və türklər köklərindən qoparılaraq şüubiyənin Səfəvi saldırısı qarşısında savunmasız buraxılmışdı. 1979-cu ildə İran İslam Devrimi ilə yenidən baş qaldıran Səfəvilik bölgədə son nəfəslərini verməkdə olan türkləri tarixdən silmə qərarlığını ortaya qoymuşdur. Firuzkuh, İsfahan və çevrəsindəki

[244] Eyni qaynaq s. 331.

türklər hızlı bir şəkildə farslaşmağa təslim edildilər. Modern eyitim və teknolojik imkanları əlində bulunduran modern səfəvilik bu yoxetmə əməliyatını hızlandırmışdı.

Qızılbaşlar Şiraz və çevrəsindəki sorunu çözdükdən sonra Quma və Kaşana tərəf yola düşdülər. Qum və çevrəsində ərəblərin imperatorluqları zamanı ərəblər yerləşdirilmişdi. 8-ci əsrdən başlayaraq ərəblərin bu çevrələrdə məskunlaşması olmuşdu. Kərbəla olayından sonra sıxışdırılan ərəblər qaçaraq bu qumsal bölgədə yerləşmiş, daha sonra şiə məzhəbi qurumsallaşdıqdan sonra bu məzhəbdə bulunmuşlardı. Sürəkli sünni iqtidarlar tərəfindən aşağılanan bu qumsal bölgənin ərəbləri onlara qarşı tarixi bir kin bəsləməkdə idilər. Qızılbaşların tarixə çıxışı onlar üçün göydəndüşmə fürsət idi. Yaqut Həməvi Qumun bir ərəb şəhri olduğunu yazar. Yaqut Həməvi bir hekayədə Qumla bağlı anladar: Bir gün sünni məzhəbindən bir hakim Quma göndərdilər. Hakim, qumluların Əbubəkir, Ömər və Osman adına həssas olduqlarını duymuşdu. Orada kimsə çocuqlarına bu adları verməzmiş. Bir gün şəhərin hakimi ağsaqqalları toplayıb “mənə Əbubəkir adında bir adam gətirməlisiniz, yoxsa sizi incidəcəyəm” deyir. Onlar üç gün möhlət istəyirlər. Üç gündən sonra üstü-başı yırtıq-pırtıq, çox çirkin bir adam gətirirlər hakimin yanına. Bölgənin ən çirkin məxluqu kimi. Bu adamı da atası gətirib şəhərə buraxıb gedibmiş. Hakim sinirlənib onlara deyir ki, bunu məni ələ salmaq üçünmü gətirmişsiniz? Qumun zarafatcıl ağsaqqallarından biri deyir: “Ey əmir, bizə nə

istərsən et, ancaq bilmiş olun ki, bu bölgənin havası elədir ki, adı Əbubəkir, Ömər və Osman olanı bu günə salır.” Əmir onun bu sözü üzərinə gülməyə başlayır və əhalini rahat buraxır.[245] Qum və Kaşan əhalisi “Qüllati-şiə” (aşırı şiə) məzhəbinə aid idilər. 12 imamın peyqəmbər kimi məsum olduğuna və möcüzələr göstərmiş olduqlarına inanırdılar.[*] Səfəvi müəlliflər Qum

---

[245] Yaqut Həməvi, Mo´cəm-əl Bələdan (Ölkələr sözlüyü) 4: 397-399. یاقوت حموی، معجم البلدان 4: 397-399

[*] Peyqəmbər isə, heç bir möcüzə göstərməmişdi. “Mən də sizin kimi insanam”, “Mənim möcüzəm bu kitabdır” söyləmişdi. Çağımızda Məhəmməd Müctəhid Şəbistəri modern hermenevtik verilərindən yola çıxaraq Quran üzərinə yeni açıqlamalar gətirmişdir. Onun “Varlığın peyqəmbəranə oxunuşu” adında kitabını türk dilinə tərcümə etmişəm. Şəbistəri imamların məsumluğunu qəbul etməyərək bu sualı sorar: İmamlar məsum isə, nədən öz dualarında Tanrıdan əfv diləmişlər. Demək onların özlərinin bildikləri və kimsənin bilmədiyi, ancaq Allahın bildiyi xətaları və günahları olmuş ki, Allahdan əfv diləmişlər. Suçsuz və xətasız adam durub durduğu yerdə nədən əfv diləsin və hansı xətalarının bağılanmasını diləməlidir? Konkret suçları olduğu üçün onun əfvini Allahdan diləmişlər. Quranın 17-ci surəsinin 73, 74, 75-ci ayətlərində deyilri: “Az qala sənə vəhy olunandan səni sapdırmaq üzrə idilər. Bizə aid olmayan sözləri yanlış olaraq duyurmaq üzrə idin. Bundan sonra səninlə dost olacaqdılar. Sənə yardım etməsə idik, onlara meyl edəcəkdin. Bu xətaya düşəcək olsaydın, səni dünya və axirətdə iki qat cəzalandıracaqdıq. Bizim qarşımızda sənə yardımçı olacaq kimsəni bula bilməzdin.” Anlaşıldığı kimi burada peyğəmbər açıqca xəbərdarlıq edilmiş, uyarılmışdır. Belə olduğu təqdirdə, yəni peyğəmbərin bilə xətaya sürüklənmə

şiələrinin səkkiz yüz il təqiyə yapdıqlarını yazmaqdadırlar.[246] Böyük olasılıqla bu, Səfəvilərin uydurmalarıdır. Çünkü şiələrə qarşı daha əski dönəmlərdə dövlətlə işləri olmadıqları sürəcə toxunulmamışdı. Yalnız sorun çıxardıqlarında onlara qarşı sərt tətbiqat uyqulanmışdı. Bu tür yazmalar sünni qarşıtı duyquları alovlandırmaq üçün olmuşdu. Kaşan əhalisi də Qum kimi qüllati-şiə məzhəbinə aid idi. Asar-ul bəlad əsərində Kaşan əhalisi haqqında yazılır: Mən görmüşəm ki, Kaşan əhalisi hər gün Mehdinin zühurunu bəkləməkdədir. Bununla da yetinməyib qılıcları ilə atlara minərək şəhərdən uzaqlaşır və Mehdini qarşılamağa gedirlər. Sanki Mehdinin gəlmək üzrə olduğunu onlara xəbər vermişlər kimi davranırlar. Gün batdığında çox qəmli görüntüləri ilə geri dönüb və təəssüflə "bu gün də gəlmədi" deyirdilər.[247] Mövlana Cəlaləddin Rumi də Kaşan "Qüllati-şiə"si haqda bir hekayə anladar: Adın ömər isə, Kaşanda çörəkçidən çörək satın ala bilməzsən. Birinci çörəkçi müştərinin adının ömər olduğunu duyduğunda ikinci dükançıya həvalə edər, o da digərinə və beləcə davam edər və adam çörək ala bilməz. Ancaq adın "Əli" isə, paran olmasa da çörək verələr.[248] Səfəvi öncəsi Azərbaycanda

---

olasılığının olduğu bir durumda imamlar necə məsum ola bilər?

[246] Qumi, Xülasət-üt təvarixi, s. 80.

[247] Asar-ul bəlad, Qəzvini "Kaşan" bölümü.

[248] Mövlana Cəlaləddin Rumi "Məsnəvi" 6-ci dəftər.
Gər Ömər nami to əndər şəhre kaş
Kəs nə befruşəd be səd dangət ləvaş
..................................

insanların adının Ömər, ya da Əli olması kimsəni ilgiləndirməzdi. Səfəvilərdən sonra Azərbaycan da kaşanlaşdı. İndi də Ərdəbildə, ya da Təbrizdə adı Ömər, ya da Osman olan adam yaşaya bilməz. Girib evində öldürərlər. Dil üzərinə qorxunc uyqulama başlatıldı.

Bu tarixi psikolojini göz önündə bulunduraraq Qum və Kaşan əhlinin qızılbaşların gəlişindən sevinmələri doğal idi. Şah İsmayılın istiqbalına çıxıb sevinclə qızılbaş ordusunu qarşıladılar. Kaşanın böyük mollasının adı Qazi Məhəmməd idi. Şah İsmayıl bu adamdan o qədər xoşlandı ki, dini işlərdən sorumlu olan Şəmsəddin Lahici kimi güvənilir bir adamının olmasına baxmayaraq onu da bu qurumun başına gətirdi. Dini işlərin sorumluluğu beləliklə iki adama tapşırıldı Şəmsəddin Lahici və Məhəmməd Qazi Kaşani. Məhəmməd Kaşani o gündən etibarən, İsmayılın yanında “Təbərra” təşkilatının sorumluluğunu yürütməkdə idi. Qısa sürədə bu adam yağmalar yoluyla böyük bir feodala dönüşdü. Daha sonra Məhəmməd Kaşani rəqiblərinin tuzağına düşəcək və Şah İsmayıl tərəfindən öldürüləcəkdi.[249]

Şah İsmayıl Şirazdan ayrıldığında qızılbaşlardan bir dəstəni Simnan və Firuzkuhu

---

Vər be yek dokkan Əli qofti begir
Nan ən inca bir həvale vo bir əzhir.
گر عمر نامی تو اندر شهر کاش
کس نه بفروشد به صد دانگت لواش
....................................
ور به یک دکان علی گفتی بگیر
نان از اینجا بی حواله و بی زحیر.

[249] Əhsən-üt təvarix , s. 146, Aləm arayi Səfəvi 1363-cü il s. 305.

ələ keçirməyə göndərdi. Bu bölgənin əhalisi Deyləmiyan (Büveyhlilər) dönəmində (932-1055) müsəlman olmuşdular. Mötəzilə məzhəbinə yaxın zeydi məzhəbində idilər. Cəfəri məzhəbini və qızılbaşlığı kəsin olaraq qəbul etmirdilər. Firuzkuh və Simnanın hakimi Hüseyn Kiya Çəlavi idi. Çəlavi özünü Sasani soyuna mənsub bilirdi.[250] Çəlavi təslim olmayıb qızılbaşları məğlub etdi. Şah İsmayıl özü Çəlavini yenmək üçün Firuzkuha hərəkət etdi. "Çocuqdan yaşlıya qədər bütün insanları qılıcdan keçirdi."[251] Bölgədə zeydiyə məzhəbi tamamən yox edildi. Çəlavi "Osta qalası"na sığınıb burada qızılbaşlara qarşı dirəndi. Şah İsmayıl qalanı quşatıb Qalaya gedən suyu durdurdu. "Şah İsmayıl bir neçə gün ərzində başqa istiqamətdə arx qazdırıb, çayın suyunu oraya yönəltdi."[252] Çəlavi 45 gün dirənişdən sonra susuzluqdan təslim oldu. Şah əhalinin qətlinə fərman verdi. Həsən Rumlu yazır: Osta əhalisi bütünüylə ölüm şərbəti nuş etdilər.[253] İskəndər bəy Türkmən yazır: Bir dəstə qələm əhlindən savayı, o tayfadan heç kəs xilas olmadı.[254] Cahangüşayi xaqan kitabının müəllifi ölənlərin sayını on min olaraq yazar.[255] Kiya

[250] Tarixi-Rövzət-ül səfa, s. 16.
[251] Həbib-ül seyr 476.
[252] İskəndər bəy Türkmən "Tarixe-Aləmaraye-Abbasi", çevirən Şahin Fazil, "Şərq-Qərb" Bakı-2010, s. 87.
[253] Əhsən-üt təvarix s. 79.
[254] İskəndər bəy Türkmən "Tarixe-Aləmaraye-Abbasi", çevirən Şahin Fazil, "Şərq-Qərb" Bakı-2010, s. 87.
[255] Cahangüşayi Xaqan s. 209.

Çəlavini dəmir qəfəsə saldılar. O, qəfəsdə işkəncə altında öldürüldü. Sonra Şahın əmri üzərinə onun cəsədini içində bulunduğu taxta qəfəslə bir yerdə yaxdılar.[256] Kiya Çəlavinin çocuqlarını və qadınını diri-diri gözləri önündə yaxdılar. Kiyanı Şahın əmri üzərinə soyundurub dərisindən bəlli yerləri soydular. Sonra da yarasına şirə sürdülər. Onu bir qəfəsə həbs edib qəfəsin içini qarışqalar və böcəklərlə doldurdular. Bir neçə gün Çəlavi bu şəkildə qaldı. Sonra yaraları irənlədi. İşkəncələrdən qurtulmaq üçün başını qəfəsin sərt taxtasına vurub intihar etmək istədi. Bunu görən gözətçilər onun intihar etməsini önlədilər. Ancaq boynundan damarı qırılmış və qan fışqırırdı. Qısa sürə sonra öldü, öldükdən sonra cəsədi yaxıldı.[257] Osta qalası düşdükdən sonra burada Bayındırlı soyundan olan Murad bəy Cahanşahlu adında bir kişi var idi. Bayındırlıların iqtidar savaşı olduğunda qaçıb Çəlaviyə sığınmışdı və İsmayılla da heç bir düşmənliyi yox idi. Sadəcə sünni və bayındırlı soyundan olduğu üçün Şah İsmayıl əmr verdi ki, onu kabab etsinlər. Sonra qızılbaşlar onun ətini yedilər.[258] Murad bəy Cahanşahlu qəzəb odunda yandırıldı, intiqam alan döyüşçülər onun ətini yedilər.[259] Səfəvi

[256] İskəndər bəy Türkmən "Tarixe-Aləmaraye-Abbasi", çevirən Şahin Fazil, "Şərq-Qərb" Bakı-2010, s. 87-85 və Tarixi-Rövzət-ül səfa 16.
[257] Qumi, Xülasət-üt təvarix 224-245.
[258] Şərəf Xan Bitlisi "Şərəfnamə" 2- ci cild, Əsatir yayını Tehran -1999, s. 136.
[259] İskəndər bəy Türkmən "Tarixe-Aləmaraye-Abbasi", çevirən Şahin Fazil, "Şərq-Qərb" Bakı-2010, s. 87 və Şərəf Xan Bitlisi "Şərəfnamə" 2- ci cild,

devrinin tarixçilərinə görə bu, qızıbaşların ilk leşyemələri olmuşdur.

Şah İsmayılın əmri üzərinə **“çegin”** adında adamyeyən dəstələr təşkil edilmişdi.[260] Bu dəstələr 12 imam adına 12 nəfərdən ibarət idilər. Çeginlər sünnilərin öncə qulaqlarını, sonra burunlarını, daha sonra bədənlərinin başqa yerlərini yeyirdilər.[261] Çegin sözü “çiy yeyən”nin asan tələffüz şəklidir. Məhkumların ətlərini bişirmədən çiy yeyirmişlər.

Qızılbaşların Yəzd şəhrinə saldırısını Məhəmməd Kərrə önlədi və bir çox qızılbaş qətl edildi. Bu xəbəri duyan Şah Yəzdə yola düşdü. Savaşda Məhəmməd Kərrə yenilib yaxalandı. Onun Çəlavi kimi dərsini soyaraq bir qəfəsə quyub qarışqalara buraxdılar. Ancaq Çəlavi kimi intihar etməsin deyə çox diqqət etdilər.[262]

Şah İsmayıl Yəzddə olduğu zaman Sultan Bayqaranın elçisi Şahın hüzuruna gəlib qələbələrindən dolayı Bayqaranın təbriklərini və hədiyələrini ona sundu. Sultan Bayqara məktubunda Şah İsmayıla özüylə eşit status tanımışdı. Özünü ondan aşağı görməmiş bərabər görmüş və ona “dünya müsəlmanlarının əmiri” deyə xitab etməmişdi. Onun “Mütləq vilayəti”nə işarə etməmişdi. Batil sünni məzhəbindən təbərra etməmiş, Əbubəkirə, Ömərə, Osmana, Ayişəyə kötü sözlər yazmamışdı. Onun məktubunda “Şərqin və Qərbin xaqanı” təhrir

Əsatir yayını Tehran -1999, s.136.

260 Cənabozi, “Rövzət-üs Səfəviyə”, s. 312.

261 Dehxuda sözlüyü.

262 Əhsən-üt təvarix 84.

edilməmişdi.[263] Bu məktub Şahın xoşuna gəlməmişdi. Yəzddən Təbəsə shücum edərək şəhərə girdi.[264] Şah İsmayıl bundan dolayı sinirlənib və Sultan Bayqaranı cəzalandırmaq üçün ordunun Xorasana doğru yola çıxmasını istədi. Təbəs Bayqara ölkəsinin Qərbdəki son sınır şəhri idi. İsmayıl 1506-ci ilin qışında Təbəsə çatdı. Təbəsdə yeddi-səkkiz min adam öldürdükdən sonra böyük və cahangüşa şahın qəzəbi söndü.[265] Şəhərdə sakin olan cağatayların böyük hissəsi ölüm qılıcından keçirildi. Nəhayət, çoxlu qan töküldükdən sonra Şah İsmayılın qiyamət alovuna bənzər qəzəb odu bir az söndü.[266] Şah İsmayıl gücünü Sultan Bayqaraya göstərmək üçün Təbəs əhalisini qətl etdi. Şah İsmayıla Sultan Bayqara sayqısız bir məktub yazmamışdı. Sadəcə onu öz sultanı və müsəlmanların əmiri olaraq adlandırmamışdı. Sırf bu üzdən İsmayıl ondan intiqam almaq istəmişdi. Sultan Bayqara bu arada xəstə idi. İki ay sonra da öldü və ölkəsi Özbək Şahının nəzarətinə keçdi. İsmayıl İsfahana geri döndü. Daha öncəki İsfahana saldırısında şəhərdən qaçıb və sonra geri dönənləri şəhərin meydanında topladı. Hamısının malını yağmalayıb özlərini öldürdü. Sonra onun ordusuyla qəfəsdə daşınan Məhəmməd Kərrənin

[263] Eyni qaynaq.

[264] İskəndər bəy Türkmən “Tarixe-Aləmaraye-Abbasi”, çevirən Şahin Fazil, “Şərq-Qərb” Bakı-2010, s. 88.

[265] Cahangüşayi Xaqan 220.

[266] İskəndər bəy Türkmən “Tarixe-Aləmaraye-Abbasi”, çevirən Şahin Fazil, “Şərq-Qərb” Bakı-2010, s. 88.

gətirilməsini istədi. Şəhərin meydanında böyük bir atəş yaxdılar. Məhəmməd Kərrənin gözləri önündə bütün ailəsini diri-diri yaxdırdı. Sonra da Məhəmməd Kərrənin özünü qəfəsi ilə bir yerdə yavaş yavaş kabab etdilər.[267] Şah İsmayılın atası Heydər Təbərsəranda öldürülmüşdü. Şah İsmayıl bir tabur (batalyon) qızılbaş Təbərsərana göndərdi. Təbərsəranın əhalisi qətl edildi.[268] Təbərsəran əhalisinin Heydərin ölümündə heç bir suçları yox idi. Tək suçları sünni olmaları idi. Əmir Nəcməddin Rəştinin vəsatəti üzərinə Rəşt əhalisinə toxunulmamışdı. Çox ilginç olan budur ki, İsmayılı qoruyub səhnəyə çıxaran Karkiya ailəsindən və sülaləsindən daha xəbər olmamışdı. Bu Əmir Nəcməddin Rəşti daha sonra Səfəvi dövlətində "Vəkili nəfsi hümayun" təşkilatının başqanı olacaq və ölkədə farslaşdırma sürəci başladacaqdı. Bunun sonucu olaraq da qızılbaşlar tərəfindən teror ediləcəkdi. Şah İsmayıl dörd qızılbaş taburunu Kürdistanı almaq üçün göndərdi. Qızılbaşların dağlarda savaşacaq təcrübələri olmadıqları üçün çoxlu tələfat verdilər. Taburlardan ikisinin komutanları da öldü. Yenilərək Şah İsmayılın yanına geri döndülər.[269] Bundan sonra Şah İsmayıl heç vaxt Kürdistana saldırmadı. Bir neçə kərə məktub yazaraq onları mənsux məzhəblərindən "haq

---

[267] İskəndər bəy Türkmən "Tarixe-Aləmaraye-Abbasi", çevirən Şahin Fazil, "Şərq-Qərb" Bakı-2010, s. 89 və Həbib-ül seyr 3/480-482, Cahangüşayi Xaqan 225-226.

[268] Əhsən-ül təvarix 31 və Qumi, Xülasət-ül təvarix 88.

[269] Əhsən-üt təvarix 90.

məzhəbi!”nə dəvət etdi, buna da kürdlər önəm vermədilər. Kürdlərin şiələşməmələrinin də səbəbi bu olmuşdur. Bu gün də İranda kürdlərin farslaşmamalarının əsas səbəbi onların Səfəvi nəfəsi ilə zəhərlənməmələri olmuşdur. Sünni qalmaları onların kürd kimliklərinin qoruyucusu olmuş, öz tarixi köklərindən səfəvizə edilən türklər kimi qopmamışdılar. Ancaq qızılbaşlardan qorxmaları onları Osmanlı ilə birləşməyə sövq etdi.

Murad bəy Bayındır Şirazdan qaçıb Bağdada getmişdi. İraqın hakimi daha öncə Murad bəyə tabe olan Barıq bəy Pornak idi. Pornakı bu vəzifəyə Sultan Murad təyin etmişdi. Murad Bayındırın yenilməsindən sonra Barıq Pornak bağımsız dövlət olmaq istəmiş və bayındırlılardan qurtulmaq istəmişdi. Bu üzdən Murad bəy Bayındır Bağdada getdiyində ona etinasız qaldı. Sultan Murad Hələbə gedib Məmluklardan yardım dilədi, ancaq cavab ala bilmədi. Ordan da türk dulqədir boyundan olan Əlaəddövlə Zülqədərə sığınmışdı. Zülqədərin Osmanlı və Məmluklar arasında kiçik dövləti var idi. Burada Sultan Murad onun qızı ilə evlənmiş və Zülqədər ona yardım edəcəyini söyləmişdi.[270] Ancaq ortaya çıxan olaylar onun Murad bəy Bayındıra yardım etməsini önləmişdi. Şah İsmayıl Murad Bayındırı yaxalamaq üçün İstanbula xəbər vermədən iznsiz Osmanlı torpağına girdi. Osmanlının gücündən çəkindiyi üçün qızılbaşlardan Anadoluda yağmalama

[270] İskəndər bəy Türkmən “Tarixe-Aləmaraye-Abbasi”, çevirən Şahin Fazil, “Şərq-Qərb” Bakı-2010, s. 89.

yapmamalarını istəmişdi. Ancaq bunu anlamamışdı ki, bu qədər ordu ilə Osmanlı torpağına girməsi öz-özünə savaşa səbəbiyət verə bilər. Şah İsmayılın şansı gətirmişdi ki, bu zaman daha çox barışdan yana olan İkinci Bayəzid kimi padşah iş başında idi. Bu xəbəri duyan Bayəzid Anadoluya bir tabur ordu göndərdi və İsmayıla da elçi göndərib bunun səbəbini sormaqla yetindi. Xətasını anlamış olan İsmayıl İkinci Sultan Bayəzidə farsca çox həlim və dostca bir məktub yazdı. "Padşah mənim atam hökmündədir və mən onun ölkəsinə göz dikməmişəm."[271] İsmayılın amacının Əlaəddövləyə saldırmaq olduğunu duyan Bayəzid bu olaya göz yumdu. Orada Əlaəddövlənin ortadan qaldırılması Osmanlının da yararına idi. Əlaəddövlə, Osmanlı ərazisindən İsmayılın saldıracağını ağlına gətirməmişdi. Yenilib dağlı bölgəyə qaçdı. İsmayıl Bostana girib şəhəri yağmaladı. Maraş əhlini sünni olduqlarından dolayı qətl etdi. Daha sonra Bitlisə saldırıb oranı ələ keçirdi. Ərzincanda Səfəvi idarəsini bərqərar edib iqtidarını Xanməmməd Ustacluya buraxdı. Bu savaşın ayrıntıları Şahin Fazilin tərcümə etdiyi İskəndər bəy Türkmənin əsərində anlatılmışdır.

Şah İsmayıl 1508-ci ilin yayında Barıq bəy Pornaka qızılbaş papağı və qayışı hədiyə göndərərək onu tabe olmağa dəvət etdi.[272] Barıq

---

[271] İsmayıl Haqqıuzun 2-ci cild, s. 245 (farsca tərcümə.)

[272] İskəndər bəy Türkmən "Tarixe-Aləmaraye-Abbasi", çevirən Şahin Fazil, "Şərq-Qərb" Bakı-2010, s. 93.

bəy itaəti qəbul edib Şaha tabe oldu. Şahın göndərdiyi qızılbaş papağı başına qoyub qızılbaşlar kimi oldu. Bundan başqa çarəsi qalmamışdı. Qarşılıqlı olaraq Təbrizə bolluca hədiyələr göndərdi. Bunun üzərinə Şah onu Təbrizə dəvət etdi. Bundan üşənən (əndişələnən) Barıq Şahın onu şiə etmək istədiyini düşünüb Təbrizə getmədi və Bağdadı savunmağa hazırlandı. İsmayıl payızda İrağa saldırdı. Tam bu saldırı sırasında Barıq bəyin ordusunda qiyam baş qaldırdı. İsmayılın da saldırı xəbərini duyan barıq ailəsi ilə bir yerdə fərar edib Misir Məmluklarına sığındı. Bağdad əhalisi şiə və sünni olaraq könüllücə İsmayıla təslim oldu. Bağdad işğal edildikdən sonra Bağdadın sünnilərini qətl etməyə başladılar. Barıqın bütün soyunu qətl etdilər. İsmayılın əmri üzərinə sünni fəqihləri yaxaladılar. Sünnilikdə qalmaqda israrlı olanları öldürüb ailələrini qızılbaşlara buraxdı. Qızılbaşlar Bağdadda o qədər adam öldürdülər ki, Şah İsmayılın məddahlarının yazdığına görə Fıratın suyu qan rənginə döndü.[273]

Şah İsmayıl Əlinin və O´nun oğullarının intiqamını almaq istəmişdi. Baxalım görəlim Hz. Əli öz qatili ilə necə davranmışdır? Hz. Əli yaralandıqdan sonra, oğullarına vəsiyət edir ki, Onun qatili ilə ədalətli davranılsın. Hz. Əli yaraladıqdan sonra qaçarkən İbni-Mülcəm də yaralanıb yaxalanır. Hz. Əli oğullarına deyir ki, onu tutuqlayın. Yemək və su verin. Mən diri qalsam, istərsəm qısas alaram, istərsəm

[273] Xandəmir 499, Əhsən-ül təvarix 103, Lobb-ul təvarix 249.

bağışlaram. Əllərini və ayaqlarını zəncirləməyin. Ancaq bu zərbə ilə ölsəm, ondan qısas almaq sizin üzərinizə düşər. Onu öldürmək istərsəniz, yalnız bir tək qılıc zərbəsi vurmalısınız. Çünkü mən bir qılıc zərbəsi ilə yaralanmışam. Burnunu, qulağını və digər bədən üzvlərini kəsməyin.[274] Hz. Əliyə süt gətirdilər. İçdikdən sonra oğlu Hüseynə "Bu sütdən məni yaralayan və özü də indi yaralı olan İbni-Mülcəmə də verin içsin və onunla bir əsir kimi ədalətli davranin" dedi.[275] Şəhriyar Hz. Əliyə həsr etdiyi şeirində Əlinin ölüm anındakı ədalətini bu şəkildə övmüşdür: "Əlidən başqa kim öz oğluna deyər ki, mənim qatilim indi sənin əsirindir. Əsirlə ədalətli davran!"[276] Hz. Əli öz qatili ilə belə ədalətli davranırkən 900 ildən sonra Şah İsmayıl, Əli və Onun oğullarının intiqamını almaq üçün on minlərcə əhalini sırf sünni olduqları üçün qətl etdi.

Bağdadda bir çox sünni memarlıq abidələrini yox etdilər. Bu memarlıq abidələrindən biri də Hənəfi məzhəbinin qurucusu olan Əbuhənifənin məzarının üstündəki yapım idi. Bu məzar bir məsciddən və ona bitişik bir də mədrəsədən ibarət idi. Əbuhənifənin məzarı üstündəki mədrəsəni və məscidi Səlcuqlar yapdırmışdılar. Şah İsmayılın əmri üzərinə mədrəsə və məscidi yerləbir etdilər. Əbuhənifənin də məzarına bir dəlik açdılar. Əbuhənifənin sümüklərini çıxarıb onun

[274] "On dörd məsum tarixi", s. 325. (Farsca).
[275] Məclisi, Bəhar-ul Ənvar, 42-ci cild, s. 289.
[276] Ke be coz Əli ke quyəd be pesər ke qatele mən
Ço əsire tost əknun be əsir kon mudara.

yerinə bir köpək basdırdılar. Sonra Əbuhənifənin məzarının üstündə bir tualet düzəltdilər. Bağdadın küçələrində qızılbaşlar car çəkdilər ki, kim bu tualetə gedib hacətini bərtərəf etsə, ona 25 Təbriz dinarı veriləcəkdir.[277] Bu zaman Qumlu bir şair İsmayılın yanında idi. Bu şairin yazdığı bir beyt şeiri tualetin divarına yazdılar. Şeir bu məzmunda idi: Şiə Əbuhənifənin məzarına sıçdı, şiənin sıçdığı məzara sünni səcdə etdi. Şiənin sıçdığı yer sünninin səcdəgahı oldu.[278]

Bu zaman İsmayıl 22 yaşındadır və ölkəsinin sınırlarini gündən günə genişlətmək üzrədir. Qısa sürədəki uğurları artıq qızılbaşların təsəvvüründə onu Allahın özü kimi təsvir etmişdi. Onun yeniləcəyinə inanmırdılar. Allahın ruhu olan bu adam sünniləri tarixdən silmək və Əlinin, Hüseynin intiqamını onlardan almaq üçün göndərilmişdi. Bu şəkildə inanırdılar. “Şiə əhli qızılbaşlar Allahın adını tam olaraq unutmuş, yalnız İsmayılın adını zikr edirlər. Biri qaranlıqda atdan yıxılsa, Allahdan deyil İsmayıldan yardım diləyir. Müsəlmanlar “Lailaə illəllah, Muhəmməd rəsulullah” deyirlər. Şiə qızılbaşlar isə “Lailahə illəllah, İsmayıl vəliullah” söyləyirlər.[279] İsmayıl qızılbaşlar üçün həm Allah, həm peyqəmbər, həm də təriqət şeyxidir.[280] Qızılbaş ozanlar şeirlər yazıb Xətai adına yayımlayırdılar. Onu Əlinin qılıcı “zülfüqar” adlandırır, şeirlə İsmayıl

---

[277] Aləm arayi Səfəvi 477.

[278] اسناد و نامه های دوره صفویه، گردآوری ا. ثابتیان، ص 99/ Səfəviyə dönəmi sənədlər və məktublar, hazırlayan A. Sabityan, s. 99.

[279] Vezinlilər səfərnaməsi 386.

[280] Eyni qaynaq.

kimliyini təbliğ edirlər. Daha sonra bütün bu anonim şairlərin, xətailərin yazdığı şeirlərin hamısı Şah İsmayıl adına tarixə keçiriləcəkdi. Bu haqda irəlidə ayrıntılı bilgi veriləcək. Burada isə, qızılbaş ozanların İsmayıl kimliyini necə anladıqlarından bir örnək gətirmək istəyirəm:

Ta kəlamullahi-natiq höccəti-tənzildir
Əlləməl əsmai-hüsnün surəti-təvildir
Ləşkəri- ərvahə bu söz qüvvəyi-təhsildir
Kim Əlinin Zülfüqarı Şah İsmaildir.
*
Mətlə-i həcci imamətdən doğub xurşidi-zât
Ərsə-i nuri təcəlli oldu xəlqi-kainat
Çağırır əflaku, əcramu, cəmadatu nəbat
Kim Əlinin zülfüqarı Şah İsmaildir.
*
Getdi ərş üstündə rəhman surətin, ruh-ul əmin
Lövhi-məhfuzi ilahi oldu Qurani-mübin
Zahiri eyn-ül yəqindir, batini həqq-ül yəqin
Kim Əlinin zülfüqarı Şah İsmaildir.
*
Çün Xətaidir kəlamullahi-natiq çakəri
Oldu “Heydər” qullarının kəmtərindən kəmtəri
Pəs hidayət kim ona oldu bu ismin rəhbəri
Kim Əlinin zülfüqarı Şah İsmaildir.[281]

Şah İsmayılı Əbuhənifənin məzarına belə sayqısız davranmağa zorlayan inanc nə idi? Hənəfi Məzhəbi İslamiyətdə ən liberal məzhəbdir. Xoşgörü və dözümə dayalıdır. Əbuhənifə öyrətilərində nifrət və lənət göndərmə deyə bir qural yoxdur. Hənəfi öyrətilərində yalnız Quranda lənətlənənlərə və

[281] Şah İsmayıl Səvəfi “Külliyat” hazılayan Rəsul İsmayılzadə Əlhüda nəşriyatı Tehran 1380 (h.ş).

zalimlərə lənət göndərmək gərəklidir. Əhli-sünnət öyrətilərinə görə Yəzid-Hüseyn qarşıdurması müsəlmanların əbədiyən davam edən sorunu olmamalıdır. Hz. Hüseynin haqlılığına və Yəzidin haqsızlığına baxmayaraq bunu tarixi şərtlərinə görə dəyərləndirməkdə yarar var. Bu üzdən də Əbuhənifə öyrətilərində "Allah Yəzidə lənət eyləsin!" söyləmi keçməmişdir. İmam Məhəmməd Qəzzali "Kimya-i səadət" əsərində bu görüşü daha da geniş açıqlar. Qəzzali dilin 20 afətini sayar. Bədənin ən aktiv üzvü dil olduğundan ən çox zərərlər də dildən gələr. Qəzzali, yalan, sancma, kötü, saçma sözlər söyləmə, qiybət, qarayaxma kimi özəllikləri sayar və sonra da bu "lənət" məsələsi üzərində durar. Qəzzali "Yəzidə lənət!" söyləmənin doğru olmadığını izah edər. Çünkü gerçəkdən də biz Yəzidin suçlu olduğunu bilmirik. Onu bilən Allahdır və suçlu isə, cəzasını Allah verməlidir, "Allah Yəzidə lənət eyləsin!" deməklə Yəzid cəzalanmaz. Zâtən bizim cəzalandırma imkanımız da yoxdur. O imkan Allaha xasdır. Ayrıca, İslamda müsəlmanlardan "Allah lənət eyləsin" kimi bir söylənim istənməmişdir. Bu üzdən də "Allah Yəzidə lənət eyləsin" dəmədiyimiz üçün o dünyada yaxamızdan yapışmazlar. Çünkü belə bir istək olmamışdır. Ancaq Yəzid suçlu deyilsə və biz "Allah Yəzidə lənət eyləsin!" deyiriksə, o dünyada adamın yaxasından yapışarlar ki, nədən bilmədiyin işə burnunu soxmuşsan?[282]

[282] İmam Məhəmməd Qəzzali "Kimyai-səadət" 2-ci ild, Elmi fərhəngi intişarat şirkəti 9-cu yayım Tehran 1380 (2002)- Tehran s. 67.

Quranda lənətlənmişlərin dışında müsəlmanın kimsəyə lənət göndərmə haqqı yoxdur. Bu, Allahın işinə qarışmaqdır. Ancaq Quranda açıqca Əbuləhəb və digər zalimlər lənətlənmişlər. “Allah zalimlərə lənət eyləsin!” söyləmək doğrudur və Quran da bunu istəmişdir. Səfəvilərdən bizə miras qalan sürülər şəklində camilərdə toplaşıb mələşərək “Allah Yəzidə və onun dədə-babasına lənət eyləsin!” söyləmək olmuşdur.* Şah İsmayılın uçurub dağıtdığı

---

* Kəndimizdə kiçik bir məscid var idi. 10 gün məhərrəmlik günlərində qonşu kənddən bir molla gəlib mərsiyə söyləyib insanları ağladardı. 1-2 saat arasında Kərbəla macəralarını anladar və hər cümləsinin bitimində gözlərini onun ağzına dikmiş kənd əhalisindən yüksək səslə “Ömərə lənət!”, “Osmana lənət”, “Müaviyəyə lənət, Yəzidə lənət”, “pis Ayişəyə lənət” söyləməsini istərdi. Xor şəklində əhali bunu təkrar edərdi. Çocuqluq çağlarımızda bu, xoşumuza gələrdi. Bilmirdik ki, çocuqluq günlərimizdən bizi xəstə və nifrət dolu insanlar olaraq tərbiyə edirlər. İran İslam İnqilabı nifrət duyqularını daha da dərinləşdirdi. Kərbəla hadisəsinin siyasi tərəfini bir yana buraxıb, onu haqla-haqsızlığın savaşı kimi təqdim etdilər. Oysa ki, Kərbəla olayında hər iki tərəf müsəlman idi. Səfəviyətlə Azərbaycanı və səfəvizədə türklüyün ağlını işğal edən bu çirkinlik və nifrət duyquları verimsiz və farsizə edilmiş insanlar sürüsü oluşdurdu. Hüseyn və Yəzid hər ikisi müsəlman olmuşlar. Hətta Hüseynin oğlu Səccad Yəzidə biyət etmişdir. Ərəb tarixi-siyasi qoşullarında oluşmuş bir olay Səfəvilərdən sonra çarpıtılaraq bizim insanların gündəlik həyatını işğal etdi. Şah İsmayılın qatilliyi, adam əti yeməsi bir yana dursun, bütün bir tarixi, Səfəvi qaranlığına gömüb və İslamiyətin ilkələrindən uzaqlaşdırması böyük sorunlar oluşdurmuşdur. Bu sorunlar çözülmədikcə də toplumsal psikolojinin

Əbuhənifənin məzarını Sultan Süleyman Qanuni Bağdadı aldığında yenidən onarıb əski durumuna qovuşduracaqdı.

Şah İsmayıl İraqı aldıqdan sonra Kərbəlaya ziyarətə gedər. Kərbəlada Hüseynlə bir yerdə şəhid olmuş Hürrün məzarını açar. Görər ki, Hüseynin Hürrün yarasına təpdiyi dəsmal yerindəcə durmaqdadır! Dəsmalı çıxardığında qan axmağa başlar! Sonra dəsmalı nə qədər yerinə qoysa da, qan durmaq bilməz! İsmayıl xəta etdiyini anlayıb təxəllüsünü “Xətai” qoyar! Bütün bunlar Şah İsmayılı tanrılaşdırmaq üçün uydurulmuş yalanlardan başqa bir şey deyildir. İran-İraq savaşında xalqın gənclərini anlamsız bir savaşda dəstə-dəstə ölümə göndərən və modern səfəvilik olaraq dirilən Xomeynizm bu yalanları qullanmaqda və radiovə TV-lərdə İsmayılın bu yalan macərasını anlatmaqda idi. İnsan ağlının soru sormasını yasaqlayacaq şəkildə sunulan yalanlar. Hürr sanki, sadəcə kiçik bir bıçaqla yaralanmış ki, o yaraya da Hüseyin dəsmalını qoymuş. O savaşda insanları param-parça doğradılar. Hüseynin başını kəsdilər. Hürrü doğram-doğram doğradılar. Ayrıca, İsmayıl nədən Hürrün qəbrini açmalı idi? Buna bir yetkisi varmı idi? Bu, yalandan və uyduruqdan başqa bir şey olmamışdır. 900 ildən sonra torpağın altında qanmı qalar? Tamam çürüyüb torpağa qarışar. Anlaşılan odur ki, İsmayıl Hürrün qəbrini də açmamışdır. Çünkü

---

ulusal oyanışa yatqınlığında ciddi sorunlar oluşacaq. Aydınlanma və aydınlatma bu anlamda Şah İsmayılın qaranlığa gömdüyü türk tarixinə ışıqtutma anlamında olsa gərək.

900 ildən sonra Hürrün qəbrinin harda olduğunu necə tapmaq olardı? Ya da yenicə ölmüş birinin qəbrini Hürrün məzarıdır deyə açımışlar ki, qızılbaşlarda sünni düşmənliyini daha da dərinləşdirsinlər. Sadəcə o zaman və sonrakı modern səfəviyə dönəmində bu yalan, kütləni aldatmaq üçün gərəkli olmuşdur. Şah İsmayıla aid olub olmadığı bəlli olmayan bu yalan hekayəni anladan qəzələ baxalım:

Ey müsəlmanlar, əsir-i zülfi yarəm doğrusu,
Bir sitəmkarın əlindən biqərarəm doğrusu.
Derdim ol dilbər yanında etibarım var mənim,
Yoxladım etdim yəqin, bietibarəm doğrusu.
Şah Xətai gəştə çıxdı, açdı **Hürr**ün qəbrini,
Bar ilahi əfv qıl, kim tövbə karəm doğrusu.[283] [**]

Şah İsmayılın farsca və türkçə şeirləri qarşılaşdırıldığında önəmli bir gerçək ortaya çıxır. Farsca şeirlərdə şiə, türkçə şeirlərdə ələvi dünyagörüşü hakimdir. Türkçə şeirlərdə Anadolu ələviliyinin duyquları yansımaqda ikən, farsca şeirlərdə İran şiə zehniyəti daha ağırlıq təşkil etməkdədir. Sanki bunları eyni adam

---

[283] Şah İsmayıl Səvəfi "Külliyat" hazılayan Rəsul İsmayılzadə Əlhüda nəşriyatı Tehran 1380 (h.ş).

[**] Xətaiyə aid olunan bu şeir Bayındırılı mədəniyətinin önəmli şairlərindən biri olan **Kişvəri**nin bir qəzəlinin vəzn və biçim olaraq sanki kopiyasıdır. Kişvəri Bayındırlı dönəminin şairi olmuş. Baxalım bu qəzəlinə:

Ey pəri, sənsiz pərişan ruzigarəm doğrusu
Sən gedəndən bərlü bisəbrü qərarəm doğrusu
Yüz qəmim vardır vəli bir qəmgüsarım yuxdurur
Bidilü bidilbərü biqəmgüsarəm doğrusu
Xalq der kim, Kişvəri bir aşiqi-məhrum irər
Hər nə kim derlər bana, yüz anca varəm doğrusu.

yazmamışdır. Ayrıca, İsmayılın dil bilinci şəkilləndiyi zaman tam olaraq fars-Gîlək mühitində yaşamışdır. Eytimini farsca almış, türkçənin incəlikləri yayqın olan ortamda böyüməmişdi. O zaman bu şeirləri necə yaza bilmişdi? Türk dilinin dərinliyini bilməyən türkçə necə şeir yaza bilər? Şeirin əski çağlarda siyasətlə dərin ilişkisi olmuşdur. Petruşeviski yazır ki, Orta Çağlarda günümüz media işlərini şeir öz üzərinə götürmüşdü. İqtidarların mədhi şeirlə edilir və şeirlə şahlar xalq içində bəyəni (sempati) toplayırdılar. Bu açıdan baxdığımızda İsmayılın tanrılığını təbliğ etmək üçün ona tapınan ozanlar Anadolunun coşqulu ələvi-bəktaşilərini daha da coşdurmaq üçün Xətai adına şeir yazmış ola bilərlər. Çünkü bu şeirlər ideoloji xarakterlidir. İsmayılın timsalında qızılbaşlıq ideolojisini təbliğ etməkdədir. Ömrü savaşlarda keçən Şah İsmayılın, özəlliklə iqtidara gəldiyi ilk illərdə bu qədər şeir yaza biləcəyi mümkün deyildir. İlk illərdə yazılan şeirlərin amacı Səfəvi dövlətinin qurulmasını gerçəkləşdirmək üçün təbliğatdan başqa bir şey olmamışdı. “Xətai” ləqəbi ilə Anadoluda şeir yazan bir çox ələvi-bəktaşi ozanlar olmuşdu. İrene Məlikoff yazır: Xətai nüsxələri çox çabuq kopyalar yapıldığı üçün pozuldu. Ona aid olmayan şeirlər içinə qatıldı. Digər tərəfdən daha çox aşırı dini fikirləri daşıyan şeirləri yazmalardan çıxarıldı. Bu nədənlə Anadolu bəktaşi və ələviləri arasında şeirlərin daha çox qarışdığı görülməkdədir.[284] Fuad Köprülü yazır:

[284] İbrahim Arslanoğlu “Şah İsmail Hatayi (Divan, Dehname, Nasihatname ve Anadolu hatayileri) DER

“Xətai, bütün təzkirələrin rəvayətinə görə “Şah İsmayıl Səfəvi”nin təxəllüsüdür. Buna baxıb da bütün “Xətai” təxəllüslü əsərlərin Şah İsmayıla aid olduğu düşünülməməlidir. Klasik şairlərimiz arasında nasıl eyni təxəllüsü daşıyan müxtəlif adamlar mövcud isə, bu təkyə şairləri arasında eyni duruma təsadüf olunur. Özəlliklə Bəktaşilərdə, tarixi vəsiqələrin əksikliyindən dolayı, bu kimi məsələləri qəti surətdə həll etmək mümkün deyildir.[285] Ziya Gürəl yazır: Şah Xətai təxəllüslü bu deyişin əsil “Xətai”nin, Şah İsmayıl Xətainin olamayacağı və bu təxəllüsü bu biçimdə qullanan başqa bir kimsə bulunduğu ap-açıq ortaya çıxmış bulunmaqdadır. Bu da Xətai təxəllüsünün bir ünvan, bir sifət əkləmək yolu ilə pərvasızca örnəklərindən biri olmaqdadır.[286] Xətai divanındakı şeirlərin həpsi əruzla yazılmış. Kəndindən öncəki Azəri şairlərinin də əruzla yazdıqları diqqətə alınırsa, Şah İsmayıl Səfəvinin onları izləməsi doğru görülməlidir. Bu baxımdan qoşma tərzindəki nəfəslər istər Sultan Xətai olsun istər Şah Xətai olsun heç biri İsmayıl Xətainin olamaz. Dil və anlatım yönündən başqa Azəri şairlərinə də mal ediləməz. Bunların gerçək sahibləri 16-20-ci əsr arasında Anadolu xətailəridir. Qul Xətai, Can Xətai, Dərdmənd Xətai, Dərviş Xətai, Sultan Xətai tapşırmalı nəfəslər ən çox Toqat, Sivas, Yozqat, Çorum, Malatya, Elazığ və Tunceli yörəsində düzənlənən cönklərdə yer almaqdadır. Bu şairlərin də o çevrələrdə yaşaması icab edər. Özəllikllə Ələvi

---

YAYINLARI İstanbul-1992 s. 334.

[285] Eyni qaynaq s. 333-334.

[286] Eyni qaynaq s. 334-335.

köylərində yapılacaq araşdırmalar qonuya açıqlıq gətirəcəkdir. Şah İsmayıl Xətai həm pir, həm də bir mürşiddir. Onun başqa bir pirə xitabən şeir yazması düşünüləməz. 336 Anadolu Xətailəri bölümündə 219 heca, 23 qəzəl olmaq üzərə 242 şeir yer almaqdadır.[287]

Anlaşıldığı kimi "Xətai" adı ilə şeir yazan bir tək kişi olmamış, başqaları da olmuş və amac isə, qızılbaşlıq fikirlərini bu yolla təbliğ etmək olmuşdur. Bu şeirlərin estetik dərinliyi də olmamışdır. Hətta 19-cu əsrin Ələsgər, Alı, Şənlik kimi ozanlarının da qoşmaları şeiriyət baxımından xətailərin yazdıqlarından daha anlamlı və etkiləyici olmuşdur. Anadoluda öz tarixi yerini bulmamış ələvi kütləsini coşduraraq siyasi səfərbərliyə hazırlamaq üçün təbliğat içərikli şüarlardır. Geniş bəşəri məzmundan yoxsundur. Qapalı bir inanc sisteminin sirlərini anlatan siyasi şüarlar bütünüdür. Sırf siyasi həyəcana xidmət etdiyindən bu şeirlərin bir çox xətaiyə aid olması doğaldır. Xətailərin ortaq siyasi çalışmalarının ürünüdür. Sırf siyasi bir ideolojinin mənzum olaraq bəyanatıdır. Eyni dönəmdə yazıb yaratmış Füzuli də var. Füzuli adına şeir yazmaq mümkün olamazdı. Bunun üçün fəlsəfi dərinlik, şeirlə düşüncənin, musiqinin və varlığın sənət duyumunda bütünləşməsi gərəkir. Ancaq xətailərdə bu imkan olmamışdı. Çünkü xətailərin yazdığı şeir deyil, nəzmdir, şüardır.

Şah İsmayıla aid edilən bir şeiri incələyəlim:

Dünyadan əlin çək divanə gönlüm

---

[287] Eyni qaynaq s. 337.

Ulaş bir ustada ər ilə görüş
Mürşid nəzərini yad edərsə dil
İkilikdən geçib bir ilə görüş

Ər ətəyinə yüz sürmək dilərsən
Əslinə, zatına ərmək dilərsən
Haqqın cəmalını görmək dilərsən
Nur ilə nur olub sirr ilə görüş

Aşiqi-sadiqlər ola gəlmişdir
Ağlayanlar bir gün gülə gəlmişdir
Əl ələ, əl Haqqa bula gəlmişdir
Tanrı kəndi özün pir ilə görüş

Xətayi biçarə quldur şahına
Hünkar Hacı Bəktaş nəzərgahına
Dəli könül Haqq ol düş dərgahına
Ər olayım dersən ər ilə görüş!

Məlum olduğu kimi Xətai qızılbaşların mürşidi idi. Xətai mürid deyildi. Bu şeir isə, bir mürşidin şeiri deyil, bir müridin şeiridir. Çünkü Xətai məqam olaraq qızılbaş kültüründə Hacı Bəktaş Vəlidən ya yüksəkdir, ya da eyni düzeydədir. Necə ola bilər Xətai mürşid ola-ola özünü hacı Bəktaş Vəlinin müridi hesab etsin. Bu, mürşidlik məqamına tərsdir. Bu qoşquda ” Ulaş bir ustada ər ilə görüş” misrası Xətaiyə aid ola bilməz. Çünkü Xətai özünü mürşid saymasa idi, o qətiyyətlə müridləri üzərinə hökm edə bilməzdi. Müridlər də mürşid olmayan birinin əmrinə belə canü-könüldən bağlı olmazdılar. Bu misra isə, hələ mürşid olmamış və mürşid arayan birinin ruh halıdır. Bu qoşma başdan sona qədər mürşid arayan müridin ruh halının tərcümanıdır. Həm

də Hacı Bəktaş dönəmində yaşamış bir Xətainin ruh halının tərcümanıdır. Bu şeir Şah İsmayılın divanında keçsə də, ona aid ola bilməz. Özü mürşid olan özündən 250 il öncə yaşamış Hacı Bəktaşı övə bilməzdi. Həm də hökmdar və dövlət başçısı olan Şah İsmayıl hacı Bəktaşı özündən üstün görə bilməzdi. Bu da göstərir ki, Xətai divanındakı şeirlər bəlli olan və bəlli olmayan bütün xətailərə aiddir. Xətai özü şah ikən şahın qulu olamazdı. Bu üzdən də ” Xətayi biçarə quldur şahına” kəsinliklə ona aid ola bilməz.

Şah İsmayılın oğlu Sam Mirzə “Töhfə-i Sam” adlı əsərində atasına aid olan farsca bir beyt örnək şeir vermişdir.[*] Orta Çağlarda və indi də böyük bir imperatorluğun başında duran adam şeir yazası olsaydı, onun şeirinə onlarca təqdirlər, təşviqlər, mədhlər və yaltaqlanmalar yazılardı. Həm də imperatorun yazdığı dildə. Şah İsmayıl bu qədər türkçə şeir yazmış, ancaq çevrəsindəki məddahlar və yaltaqlar, vəzifəyə göz dikmiş olanlar, nədənsə onun yazdığı türkçə şeirləri təfsir etməmiş, haqqında onlarca deyil, yüzlərcə kitab yazmamışlar. Şah İsmayıl yazmış və çevrəsindəki təzkirə yazanlar, hətta oğlu da buna işarə etməmiş! İskəndər bəy Türkmən öz əsərində sadəcə Şah İsmayılın “Xətai” təxəllüsü ilə şeir yazdığına kiçik bir işarə edər: Şeir yazmaqda o həzrətin yüksək yetənəyi vardı. Ancaq türkçə şeir yazmağa meyli daha çoxdu. Təxəllüsü “Xətai” idi.[288] Şah İsmayılın bu şeirləri

---

[*] Bu qonu üzərinə Salman Mümtaz da deyinmişdir.

[288] İskəndər bəy Türkmən “Tarixe-Aləmaraye-Abbasi”, çevirən Şahin Fazil, “Şərq-Qərb” Bakı-2010,

əzbər söylədiyi və Anadoludan axın edən qızılbaşları coşdurmaq istədiyi ola bilər və olmuşdur. Ancaq bu, onun əzbər söylədiyi şeirlərin kəndisinə aid olduğu anlamına gəlməz. Şah İsmayıldan çox öncələr Anadoluda bu tür şeir yazmalar yayqın idi. Bu şeir türü və dünyagörüşünün Azərbaycanda kökləri olmamışdı, bütünüylə Anadolu ələvi-bəktaşilərinin dünyagörüşüdür. Bu dünyagörüşünün doğruluğu və ya yanlışlığı söz qonusu deyildir. Səfəvilik iki əsas üzərində qurulmuşdur: 1- İrançılıq. 2- Şiəçilik. Hər ikisi də fars kimliyinin təməllənməsinə xidmət etmişdir. Səfəvilikdə ələvi-bəktaşiliyin siyasi sürəkliliyi olmamışdır. Səfəviyət bir şüubiyə zehniyətidir. Bu üzdən də Azərbaycanda türk kimiliyi hər tərəfdən sıxışdırılmışdır. Kitabi-Dədə Qorqudda övülən bayındırlı türk kimliyi yox edilərək üzərinə şiə-fars kimliyi təsis edilmişdir. Azərbaycan tarixində ən milli özəlliklər daşıyan bayındırlılar dövləti olmuşdur. Kitabi-Dədə Qorqud da bayındırlı varlığının ürünüdür. Əsər “Xanlar xanı **Bayındır** xan...” ifadəsi ilə başlar. Şah İsmayıl Təbrizi işğal etdikdən sonra bütün sünni qaynaqlı kitabları yaxdı. Kitabi-Dədə Qorqud da bu kitabyaxma olayında yandırılmışdır. Şah İsmayılın törətdiyi soyqırımdan Osmanlıya qaçan sünni türk təbrizlilər Kitabi-Dədə Qorquddan bir nüsxə İstanbula aparmış olmalılar ki, ordan da Derzdenə aparılmış. Bu qorxunc kitabyaxma olayında Təbrizdə bulunan venizli tacirlər də

s. 111.

Kitabi-Dədə Qorquddan bir nüsxə İtaliyaya aparmış olmalıdırlar. Bir çox araşdırmaçılar Bayındırlı dövləti dönəmində Qurani-Kərimin türk dilinə tərcümə edildiyini[289] və daha sonra bu tərcümənin yox olduğu fikrindədirlər. Əlbəttə ki, bu tərcümə sünni yorumu içərdiyindən və Bayındırlı tərcüməsi olduğundan Şah İsmayıl tərəfindən yaxmlışdı. Təbriz camilərində bulunan bütün kitablar şiə-şüubi dünyagörüşünə uyqun gəlmədiyindən Şah İsmayıl tərəfindən yandırıldı. Qaraqoyunlu və Bayındırlı kültür uzantısının ürünü olan Həqiqi, Kişvəri, Həbibi, Füzuli kimi şairlər Səfəvilər dönəmində, daha sonrakı dönəmlərdə də yetişmədi, yetişəməzdi. Çünkü Cüneydlə sapdırılaraq siyasətə arac edilən səfəvilik Azərbaycanda soyu olmayan köksüz bir ideoloji idi. Füzuli özünü Əlişir Nəvai məktəbinin uzantısı olaraq görürdü.

[289] Tofiq Nəcəfli, Journal of Qafqaz University, “İLHAN ERDEM VƏ KAZIM PAYDAŞIN “AĞQOYUNLU DÖVLƏTİ TARİXİ. SİYASƏT- TƏŞKİLAT- KÜLTÜR” ADLI MONOQRAFİYASI HAQQINDA BƏZİ QEYDLƏR, s. 40. http://journal.qu.edu.az/article_pdf/1004_31.pdf

## Türküstan saldırıları

Soğd, Xarəzm və Gürgan Şahbəy Xan ləqəbi ilə tanınan özbək əmiri Məhəmməd Xanın əlində idi. Qızılbaşlar "Şahbəy Xan" sözünü doğruca tələffüz edə bilmədikləri üçün "Şeybək" tələffüz etmişlər. Ən önəmlisi onlar "şah" ləqəbini mürşidləri İsmayıla xas bilirdilər. Bayqaranın ölümündən sonra oğulları anlaşamadığından onun da ölkəsi Şeybək Xanın idarəsinə keçmişdi. Fərqanəni də Babürlülərdən alaraq ölkəsinin sınırlarını genişlətmişdi. O, Şah İsmayıl zülmündən qaçan alimləri öz yanına alırdı. Qızılbaşların təhdid oluşdurduqlarını hiss edib, böyük bir savaşa girmək istədi. Şah İsmayıla yazdığı bir məktubda ona savaş elan etdi, Şah İsmayıl isə, ona cavab olaraq yazdı ki, Əlinin qulu olmayan adam dünyanı tutsa, yenə də adam sayılmaz. İsmayılın elçiləri Şeybaninin (Şeybəkin) hüzuruna vardıqlarında onlardan sorduğu ilk soru bu olmuş ki, nədən İsmayıl yeni

məzhəb gətirmiş və peyqəmbərin ən yaxın yavərlərini aşağılamaqdadır? Elçilər də ona demişlər ki, O, Xorasanı Şaha təslim edərsə, Şah İsmayıl çayötəsini (Soğd və Xarəzm) Şeybək Xana buraxmağa razıdır. Ayrıca, İsmayıl, Şeybək Xana yazdığı məktubda iddia etmişdi ki, Məryəm surəsində keçən 54-cü ayət onun haqlılığına işarə etməkdədir.[***][290] Şeybək Xan elçiləri cavabsız buraxıb Şah İsmayıla sərt bir məktub yazaraq onu "İsmayıl daruğə" adlandırdı. Burada bu ifadə çətə rəisi anlamındadır. Ayrıca, Məkkə və Mədinəni ziyarət etmək istədiyini və yolda İsmayılın ona qolaylıq sağlaması gərəkdiyini də yazdı. Harda qarşılaşacaqlarını sordu.[291] İsmayıl Daruğə əmrimə tabe olmazsa, savaşa hazır olmalıdır və savaşın yerini də özü təyin etməlidir. Şah İsmayıl da qarşılaşma yerini Məşhəd olaraq yazdı. 8-ci imamın məzarını novruz bayramından sonra ziyarət etmək istədiyini bildirdi.[292] 1510-ci ildə Şah İsmayıl Simnandan keçərək Xorasan vilayətinə girdi.[293] Şeybək Xan da böyük saldırıya hazırlandı. Ancaq o, savaşa yollanmaq istərkən Qıpçaq çölünün şahı Moğol Qaim Sultan Xarəzmə saldırdı. Şeybək Xan bu təhlükəni durdurmaq üçün onunla savaşa yollandı. Şeybək Xan, Qaim Sultanla savaşarkən Orta Xorasanda Hezarə

[***] Bu ayətlərdə deyilir: Və İsmayılı xatırla. O, göndərilən peyqəmbər idi.

[290] Müntəxəb-ül təvarix, s. 412.

[291] İskəndər bəy Türkmən "Tarixe-Aləmaraye-Abbasi", çevirən Şahin Fazil, "Şərq-Qərb" Bakı-2010, s. 98.

[292] Eyni qaynaq.

[293] Eyni qaynaq.

qəbilələri qiyam etdilər.[294] Şeybək Xan ordusunun bir bölümünü də Hezarə qiyamını söndürmük üçün göndərdi. Şeybək Xan Qaim Sultanla savaşında yenilib Mərvə çəkildi və Xarəzm Moğol dövlətinə qaldı. Hezarələrin yaşadığı yer də dağlıq olduğundan Şeybək Xan çox tələfat verdi. Bu yenilgələr onun ordusunda ruh düşgünlüyü yaratmış və savaşçılıq gücünü azaltmışdı. Şeybək Xanın yenilgə xəbərlərini alan Şah İsmayıl novruz bayramından sonra bütün gücü ilə Məşhədə saldırdı. Rey, Damğan və İstərabadı ələ keçirib Məşhədə doğru irəlilədi. O zaman Məşhədin əhalisi hənəfi məzhəbində idi. 8-ci imamın orada uyuması üzündən Məşhəddə qətl olmamışdı. Şah İsmayıl Sərəxsi də alıb Mərvi quşatdı. Hezarə savaşından yorğun dönən Şeybək Xan Mərvdə möhkəmləndi. Səmərqənd və Buxaraya məmur göndərərək oradakı orduları yardıma çağırdı. Qızılbaşlar Mərv qalasında onu mühasirə etdilər. Qalanın alınmasının mümkün olmayacağını düşünən qızılbaş komutanlar hiylə işlətdilər. Onlar Şeybək Xanı qaladan çıxarıb düz yerdə savaşmaq istəyirdilər. Şah İsmayıl Şeybək xana məktub yazıb barış önərdi və dedi ki, Azərbaycanda sorunlar ortaya çıxmış geri dönməliyik. Yazmışdı ki, bizim buraya gəlişimizi sən özün istəmişdin. Biz gəldik, ancaq sən sözünü tutmadın və qalaya sığındın.[295] İsmayıl məktubuna cavab bəkləmədən zahirən Təbrizə tərəf ordusuyla yola düşdü. Mərvə yaxın olan

---

[294] Eyni qaynaq.

[295] Şərəf Xan Bitlisi "Şərəfnamə" 2- ci cild, Əsatir yayını Tehran -1999, s. 147.

Mahmudabad adında bir kənddə durdular. Bu arada 300 kişilik qızılbaşa Şah dedi ki, Mərvə yaxın yerdə bəkləyin Şeybək Xan qaladan çıxıb Sizə saldırsa, Mahmudabada tərəf qaçın. Üç gün sonra Mərvin yaxınında görünən qızılbaşlara saldırdılar. Qızılbaşlar Mahmudabada qədər qaçdılar və Mahmudabad da Şeybək Xan Şah İsmayılla qarşılaşdı. Şeybək Xanın yanında az ordusu var idi, savaşmaqdan başqa çarəsi qalmamışdı. Bütün cəsarəti ilə Şah İsmayılla savaşa başladı. Savaşın birinci mərhləsində bir çox qızılbaş öldürdülər. Şah İsmayıl adəti üzərinə savaş zamanı savaş meydanından uzaqda əylənməklə məşğul olurdu. Qızılbaşlar yenilmək üzərə ikən Şahı savaş meydanına çəkdilər. İsmayılın gəlişi ilə qızılbaşlar ruhlandılar. Qızılbaşlar göylərdən vəhy alan pirlərinin meydana girməsi ilə qələbəyə olan inancları möhkəmləndi, çünkü İsmayıl vəliullah yenilməz idi və heç bir savaşda yenilməmişdi. Savaşın ikinci mərhələsində Şeybək Xan yenildi. 500 savaşçısı ilə bir dərəyə qaçdı. Qızılbaşlar bu çıxmazda onları quşatdılar. Hamısını öldürüb, Şeybək Xanın da cəsədini bulub başını kəsərək Şaha apardılar. Şah əmr verdi ki, Şeybək Xanın cəsədini də gətirsinlər. Qızılbaşlara Şeybək Xanın ətini yemələrinə əmr verdi: Padşah kinini söndürmək üçün Şeybək Xanın cəsədinə üç zülfüqar zərbəsi vurdu. Qarnını sökdü. Əllərini kəsdi. Sonra dedi: Kim mənim başımı sevirsə, düşmənimin ətini yesin. Qızılbaşlar pirlərinin əmrini yerinə yetirmək üçün bir-biri ilə yarışırdılar. Şeybək Xanın cəsədinin ətini yemək üçün bir-birinin əlindən qapırdılar. Hətta bir-

birinə qarşı qılıc çəkməkdə idilər. Ac qurdlar leşi necə yeyərsə, Şeybək Xanın leşini o şəkildə yedilər.[296]

Şərəfxan Bitlisi bu savaşda Şeybək Xanın şiə vəziri Xacə mahmud Sağərçinin ihanət etdiyini yazmış. Bu ihanətdən sonra Sağərçi Səfəvi dövlətində böyük vəzifə tutmuşdur.[297] Şeybək Xanın başının dərisini soydurdu. Kəlləsini təmizlətdi və sarayda bu kəllə ilə şarab içərdi. Şeybək xanın bir əlini kəsib Babür şaha göndərdi. Məktubda da yazdı ki, Şeybək xan sənin əlini Səmərqənddən kəsmişdi, indi mən onun kəsik əlini sənə göndərirəm. Başqa əlini də ləndhör bir qızılbaşa verib Saridə Mazəndəran əmiri "Əmir Rüstəm Ruzəfzun"a göndərib və məktubda yazdı ki, sən mənə tabe olmayan Şeybək Xana sığındın. İndi mən onun əlini sənə göndərirəm. Şeybək Xanın başının dərisini samanla dolduraraq Orta Xorasandakı zəfərinin ayrıntılarını anladan bir məktubla Osmanlı padşahı İkinci Bayəzidə göndərdi.[298]

Mərvdən sonra sıra Herata gəlmişdi. Sultan Əbusəid Teymuri, Sultan Bayqaradan sonra Heratı özünə başkənd seçmişdi. Herat Xorasanın ən qalabalıq şəhəri idi. Şəhərin mədrəsəsində Əllamə Təftazani adında ünlü bir alim var idi. Bu mədrəsədə Osmanlıdan, Hindistandan və

[296] Cahangüşayi Xaqan 380-381, Əhsən-üt təvarix 84.
[297] Şərəf Xan Bitlisi "Şərəfnamə" 2- ci cild, Əsatir yayını Tehran -1999, s. 148.
[298] İskəndər bəy Türkmən "Tarixe-Aləmaraye-Abbasi", çevirən Şahin Fazil, "Şərq-Qərb" Bakı-2010, s. 100.

Türküstandan bir çox öyrənci təhsil alırdı. Ayrıca, şəhərdə Əlişir Nəvai adına böyük bir kitabxana mövcud idi. Bu kitabxananın on minlərcə kitabı var idi. Heratın əhalisi Hənəfi sünni məzhəbində idilər. Orucluq ayı idi. Əhalini Heratın Camisinə çağırdılar. Camidə Heratın baş yarqıcından şiə olmasını və minbərə çıxıb təbərra etməsini, Əbubəkiri, Öməri, Osmanı və Ayişəni aşağılamasını istədilər. Bunu qəbul etməyən fəqih ordaca öldürüldü. İkinci bir fəqih də qəbul etmədiyi üçün onun da başını kəsdilər. Daha sonra camidə olan bütün əhalini sünni olduqları üçün qətl etdilər. Bir neçə şəhər böyüklərini də Şahın özünün qərar verməsi üçün öldürməyib saxladılar.[299] Əllamə Təftazani o zaman İslam dünyasının ən böyük və ən ünlü alimi idi. Onun dədəsi Sə´dəddin Təftazani də İslam Dünyasının böyük alimlərindən olmuş və Əmir Teymur tərəfindən böyük hörmətlər görmüşdü. Təftazani 70 yaşın üzərində idi. “Təftazani 30 il Heratın baş öyrətmənliyini etmişdi.”[300] O zaman Herat alimlərinin yazmış olduqları və Heratın dışında yayımlanmış olan kitablar günümüzdə də islamşünaslıq elminin ana qaynaqlarından sayılmaqdadır. İsmayılın əmri üzərinə “haqq məzhəbi”ni qəbul etmədiyi üçün Təftazanini öldürüb param-parça etdilər. Təftazani oruc idi. Onu Şahın yanına gətirdilər. Ismayıl ondan “batil məzhəb”dən vaz keçməsini istədi. O isə, qəbul etmədi. Təftazaninin başını

[299] Aləm Arayi Səfəvi 346, Cahangüşayi Xaqan 389, Əmir Xandəmir 72-73.
[300] Əhsən-üt təvarix 124.

kəsib, cəsədini yaxdılar.[301] Bu arada içkili qızılbaşların nə kimi xəta etdikləri olmuşsa, ya da yağmalanmış qənimətlər üzərinə anlaşamamışlarsa, Şah Heratda içki içməyi durdurur. Hətta bir neçə qızılbaşı qılıca taxıb öldürür.[302] Şah İsmayıl dörd ay Heratda qaldı. Heratda tanınmış adamlardan, yalnız ikisi diri qaldı. Biri rəssam **Behzad** idi, digəri də Təftazaninin öyrəncisi və Hənəfi fiqhindən dərs verən Mirqiyasəddin idi. Mirqiyasəddin and içdi ki, şiə idi və sadəcə təqiyə edib həyatını davam etmişdir. Şeybək Xanın kəlləsini Heratın zərgərlərinə tapşırıb yaxşı qədəh düzəltmələrini istədi. Herat və Mərvin valiliyini Hüseyn bəy Lələyə, Bəlx və Doğu Xorasanı Bayram bəy Qaramana buraxıb ordan ayrıldı. Mirqiyasəddini də Xorasanda dini işlərdən sorumlu etdi.[303] 1501-ci ildə Şah İsmayıl Təbrizi işğal edib Səfəvi dövlətini qurduğunda Əlişir Nəvai vəfat etmişdi. Anlaşılan budur ki, Əlişir Nəvai də həyatda olsaymış Təftazani kimi Heratda öldürüləcəkmiş. Əmir Teymurun türk dilinə verdiyi önəm dolayısıyla Türküstanda türkçə yazma gələnəyi güclənmiş və davamında türkçənin düşüncə dili olma imkanlarını açıqlayan Əlişir Nəvai kimi dil bilimcilər yetişmişdi. Şah İsmayılın Xorasanı və Türküstanı işğalından sonra türkçə yazma gələnəyi də söndürüldü. Bir çox əsərlər yaxılıb yox edildi.

---

301 Bəhram Çubinə, “İranda şiə və siyasət” 2-ci cild, s. 35.
302 Əmir Mahmud Xandəmir 72.
303 Əhsən-üt təvarix 125.

Şeybək Xanın ölümündən sonra Kabilda yerləşmiş olan Zəhirəddin Babür Soğda saldırıb Səmərqəndi işğal etdi. Babür Teymurun nəvələrindən idi. Babür şair idi. Əlişir Nəvai "Məcalis-un nəfayis" (nəfslərin məclisi) adlı təzkirə əsərində onun şeirlərindən örnəklər vermişdir. Şeybək Xan öldükdən sonra ortaya çıxmış boşluqdan yararlanaraq Səmərqəndə və Fərqanəyə saldırdı. Özbəklərin yardımı ilə Şeybək Xanın qardaşı oğlu Ubeydullah taxta çıxdı. O, Babürə qarşı savaş açdı. Babürlə Şah İsmayılın münasibətləri yaxşı idi. Bu da türküstanlıların onu sevməməsinə səbəb olmuşdu, çünkü Şah İsmayılın törətdiyi cinayətlər bu tezlikdə unudula bilməzdi. Babür, Ubeydullah ilə savaşda yenilib Bəlxin yanında "Hisar şadman" adlı qalaya çəkildi. Orada qızılbaşlardan yardım diləyində bulundu. İsmayıl, Əmir Nəcm-Sani komutanlığında bir ordu göndərdi və Hüseyn bəy Lələ ilə Bayram bəy Qaramana bu orduya qatılmalarına əmr verdi. Qızılbaşlar Babürlə bir yerdə Buxaranın yanında olan Xəraz qalasını quşatdılar. Babürün yardımına getsələr də siyasi əxlaqı ayaq altına ataraq, Babürə sormadan təslim olan Xəraz hakimini sırf sünni olduğundan dolayı öldürdülər. Bütün ona tabe olanları qılıcdan keçirdilər. Əmir Nəcm, Xəraz əhlinin qətlinə fətva verdi. Xərazda 15 min nəfər adam öldürdülər. Çoluq-çocuğunu götürüb camilərə sığnanlar var idi. Bütün camiləri içindəkilərlə bir yerdə yaxdılar.[304] Camiyə yığışanlar "seyyid"

---

[304] Aləm Arayi Səfəvi 371-372, Cahangüşayi Xaqan 430-432, Əhsən-üt təvarix 131.

olduqlarını iddia edirdilər. Ancaq Nəcmi-Sani sünnidən seyyid olmaz deyə qətldə israr edirdi. Babürşah qətllərə etiraz edirdi. Onun etirazı qəbul edilmədiyi üçün aralarında ədavət başladı.[305] Babür Şah qızılbaşlardan istədiyi yardımdan dolayı peşman olmuşdu. Bu üzdən qızılbaşların Soğdda irəliləmələrini durdurmaq istədi. Babür Nəcmi-Saninin Ğəcdvana doğru saldırmasını durdurmaq istədi. Ancaq Səmərqəndə gedib oranın da əhalisini qətl edəcəyini söyləyən Nəcmi-Sani Babür Şahın uyarısını dinləməz oldu. Ğəcdvan qalasını quşatdı. Ğəcdvan qızılbaşların saldırısı qarşısında dirəndi və Ubeydullah Xandan da yardım istədilər. Ubeydullah Xan Ğəcdvana saldırmaq üçün Babür Şahla anlaşdı. Qızılbaşların cinayətlərindən bezmiş olan Babür şah Nəcmi-Sanini buraxıb getdi. Mirqiyasəddin də qızılbaşların Xəraz və Qərşidə seyyid qətl etmələrini qəbul etmədi və qızılbaşları buraxıb Babür Şaha qatıldı. 1512-ci ildə baş verən savaşda Qızılbaşlar yenildilər. Hüseyn bəy Lələ əldə qalan ordusuyla Herata fərar etdi, Bayram bəy öldürüldü. Nəcmi-Sani yaxalandı. Ubeydullahın əmri üzərinə Nəcmi-Saninin başını kəsdilər.[306] Bu qələbə üzərinə Ubeydullah Bəlxə və bütün Xorasana hakim oldu. Heratı ələ keçirmək üçün özbəkləri birləşdirdi. Özbək orduları Herata girmədən Hüseyn bəy Lələ fərar edib İsfahanda yenilgə xəbərini Şaha çatdırdı.

---

[305] İskəndər bəy Türkmən “Tarixe-Aləmaraye-Abbasi”, çevirən Şahin Fazil, “Şərq-Qərb” Bakı-2010, s 104.
[306] Eni qaynaq s. 104-105.

Herat əhalisi şəhərdə bulunan təbərrayan təşkilatının mənsublarını yaxalayıb öldürdülər. Bu zəfər üzündən Ubeydullah Xan Məşhədə gəlib 8-ci imamın qəbrini ziyarət etdi. Qış keçdikdən sonra Şah İsmayıl yenidən Xorasana saldırıya keçdi. Ancaq öncə novruz qutlamalarına qatıldı. Ubeydullah Məşhədi başkəndi olaraq seçmişdi. Ordusunun böyük bölümü Herat və Mərvdə olduğundan qızılbaşlar Məşhədə girdiklərində o, Mavəraünnəhrə getdi. Məşhəd əhli Ubeydullaha dəstək verdiklərindən dolayı qətl edildilər. Şah İsmayıl Özbəkləri yenib Herata girdi. Təbərrayanın qanının intiqamını almaq üçün şəhərdə qadın-kişi, çocuq-yaşlı demədən hər kəsi qətl etdi. Minlərcə evi və tarlaları yaxdı. Heratdan sonra Bağisə girdi. orada da Təbərrayan qətl edilmişdi. Buna qarşılıq olaraq minlərcə insan Bağdisdə qətl edildi. İçində alovlanan nifrətini bu qətllərlə söndürdükdən sonra Herat və Mərvi, Zeynal bəy Şamlunun valiliyinə buraxıb geri döndü.[307] Bu savaşdan sonra Soğd, Fərqanə və Gürgan Ubeydullahın əlində qaldı. Qızılbaşların əlindən canlarını qaçaraq qurtarmış olan bir çox sünni bilim adamları və dindarlar Ubeydullahın ölkəsinə sığındılar. Bunların ən ünlülərindən biri Fəzlullah Ruzbehan Xonci olmuşdur. Xonci “Süluk-ul Müluk” və “Mehmannamə-i Buxara” adlı əsərlərini yazıb Ubeydullaha həsr etmişdi. Xonci, Bayındırlı dövlətinin tarixinə həsr etdiyi ”Tarixi-aləm arayi-əmini” adlı əsərin də

[307] Eni qaynaq s. 105.

müəllifidir. “Əmin” ləqəbi ilə tanınırdı. Buxarada vəfat etmişdi.

Şah İsmayılın törətdiyi bütün bu cinayətlər Türküstan və Azərbaycan arasında izləri silinməyəcək nifrət və kin toxumu əkirdi. Azərbaycan Türküstanın və Anadolunun ortaq tarixi mədəniyyətindən qoparılıb dar bir tarixi məkana sıxışdırılaraq fars dili, fars kimiliyi qarşısında savunmasız buraxılırdı. Şah İsmayılın tətbiqatının mərkəzi Azərbaycan olduğundan, Azərbaycan ölkəsi ıldırım sürəti ilə öz soyundan, dilindən, kimliyindən və ortaq türk-İslam tarixindən ayrılıb şüubiyənin görəvli məmuru olan Şah İsmayılın təxribatına meydan olurdu. Daha sonra şüubi Şah İsmayıl təxribatının nəticələrini yozlaşaraq farscalaşan və türkçələrdən bağlarını qoparan dilimizin yazqısında görməkdəyik. Ölkəmizdə əski mədəniyyəti, memarlıq abidələrini məhv edən şüubi Şah İsmayıldan bir tək mədəni miras qalmamışdır. Şüubi Səfəvilərlə eyni zamanda Azərbaycan türklüyü tarixin qaranlığına gömüldü. Ölkə doldu imamzadalarla. İslamın kitabı, peyqəmbəri bir yana buraxılıb imamzadalara tapınıldı. Hər kənddə, hər şəhərdə onlarca imamzada məzarları təsis edilib ziyarətə açıldı. Təbrizin tarixi pozisionu dəyişdi. Türk mədəniyyətinin beşiyi olan Təbrizin çevrəsini imamzada məzarları ilə doldurdular. Təbrizə bitişik təpələrin adlarını dəyişdirib Əvnəli (xalq ağzında Eyin-Əli (Eynalı) və Zeni-Əli (Zeynalı) qoydular. Qurani-Kərimin təkasür (102) surəsində qəbirlərin ziyarəti ilə oyalanma anlamsızlığı açıqlanmışdır. “İslamın ilk yüz ilində

qəbirlərin ziyarəti ilə ilgili heç bir bilgi mövcud deyildir."[308] Bu doğrultuda mövcud olan hədisləri doğru olaraq qəbul etsək qəbirlərin ziyarəti peyqəmbər tərəfindən yasaqlanmışdır. "Hz. Peyqəmbər buyurmuşdur ki, qəbirləri ziyarət edənlər bizdən deyillər."[309] Əski çağlardan qalma qəbir var idi. Yalan ya da gerçək bu qəbirlərin əski peyqəmbərlərə aid olduğu söylənirdi. Hz. Peyqəmbər bu qəbirlərin heç birini ziyarət etməmişdir. Peyqəmbərin öz xanımı Hz. Xədicənin və oğlunun məzarını ziyarət etməsi qonusunda da heç bir bilgi mövcud deyildir.[310] Hətta peyqəmbərin şəhid əmisi Həmzənin də məzarı ziyarət edilməmişdir.[311] Peyqəmbərlərdən yalnız üçünün qəbri bəllidir: 1- Yəməndə qumsal bir təpənin başında olan Hud peyqəmbərin qəbri. 2- İsmayılın Kəbəyə yaxın olan qəbri. 3- Hz. Məhəmmədin Mədinədəki qəbri. Bu qəbirlərin ziyarəti ilə ilgili olaraq İslamda heç bir bilgi yoxdur. Peyqəmbərlərin məzarının ziyarəti ilə ilgili olaraq heç bir bilgi olmazkən nədən imam və imamzadaların məzarları ziyarət edilməli, nəzirlər verilməlidir?[312] Peyqəmbərin qızı Hz. Fatiməni Hz. Əli gizlincə dəfn etdi, məzarının harada olduğu bilə bəlli deyil. Qəbir ziyarəti gərəkli olsaydı Hz. Fatimənin qəbri ziyarətgah

---

[308] Heydərəli Qələmdaran, "Qəbirlərin ziyarəti doğrular və xurafələr" (زيارت قبور بين حقيقت و خرافات), 1385-ci il (h.ş) s. 18.
[309] Eyni qaynaq, s. 19.
[310] Eyni qaynaq, s. 21.
[311] Eyni qaynaq, s. 22.
[312] Eyni qaynaq, s. 25.

kimi olardı, həm də peyqəmbərin qızı idi.[313] İslamda qəbirlərin ziyarəti ilə bağlı olaraq heç bir sifariş olmazkən Səfəvilərdən sonra İslam öz təməl qaynaqlarından sapdırılaraq imamzada ziyarəti səviyəsizliyinə düşürüldü. Peyqəmbərin qızı ilə ilgili heç bir məzar qalmazkən Qumda Məsumə adında möhtəşəm imamzada ziyarətgahı təsis edildi.

Quma yaxınlaşdığımda hər yanda kiçik məscidlər və üstü yaxşıca yapılmış qəbirlər görürdüm. Bu qəbirlər Əlinin törəmələrinin məzarlarıdır. Iranlılar bunlara imamzada deyirlər. İsanın həvariləri kimi. İranın (Səfəvilərdən öncə Azərbaycan adlanırdı) hər tərəfində imamzadalar var. Onların hamısına müqəddəs məzarlar kimi baxırlar. Qum və çevrəsində 400-dən artıq imamzada var.[314] Sadəcə xalqı qılıcdan keçirməmiş, iqtidar uğruna öz ailələrini də qılıcdan keçirən Səfəvi soylarının da məzarları İsmayıldan Şah Abbasa qədər imamzadalar cərgəsinə qatıldı. Çünkü özlərini imam soyundan bilməkdə idilər. Ancaq nədənsə Şeyx Heydərin oğlu İbrahimdən və İsmayılın digər dörd qardaşından xəbər çıxmamışdır. Onların başına nələr gəldi?

Təbrizdə Eynalı və Zeynalı imamzadələri: Bu məzar Sorxabın ən yüksək yerindədir. Bu məzarlardakılar Əli oğulları Əvnəli və Zeynəli olaraq bilinir. Belə inanılır. Ancaq mötəbər qaynaqlar Əlinin bu adda oğullarının olmadığını

---

313 Eyni qaynaq, s. 26.

314 İqbal Yəğmayi, “Səfərnamə şardon”, s. 519 (Nasir Purpirarın “Səfəvilər” kitabından alıntı.)

yazır. Böyük olasılıqla bunların heç birisinin gerçək aləmdə varlıqları olamışdır.[315]

Şüubi Səfəvilərin "mənəvi" mirası Azərbaycan üçün bunlar olmuşdur. Türk dilinin farsca qarşısında savunmasız buraxılma əməliyatı səfəvilərlə başlamışdır. Humbolt dillərdəki gəlişməni üç bölümə ayərar: 1- Dillərin orqanik yapısının (strukturunun) ilk, ancaq tam olaraq oluşması, biçimlənməsi. 2- Dillərin yenidən durağan duruma keçməsi üçün yabancı qarışımlarla dəyişmələri. 3- Dillərin başqa dillərə qarşı dışdan sınırları bəlli edildikdən və yapıları bir bütün olaraq dəyişməz bir biçimdə yerləşdikdən sonra içdən və incədən incəyə gəlişmələr.[316] Səfəvi dövləti Azərbaycanda yerləşdikdən sonra türk dilinin yabancı dillərə qarşı yüzillər boyunca oluşdurduğu sınırı ortadan qaldırıldı. Fars dili türk dilinin mərkəzi nöqtəsini hədəf aldı. Yüz illər boyunca millətin başına döydürərək şaxsey-vaxsey mərasimlərində farscanın dil bilgisinə görə hazırlanmış ədəbiyatla dilin özəyini sökdülər. Fars dilindən türkçəyə devrik cümlələr və "mi" sual əki olmayan sual sorma şəkli keçdi. Səfəvi saldırısı qarşısında dilin sınırları ortadan qaldırıldığından dolayı türkçənin doğal quruluşu dəyişdi. Səfəvi tətbiqatı nəticəsində farsizə olmuş bir türkçə ortaya çıxdı. Fars dilindəki danışıq və cümlə şəkli türkçəyə tətbiq edildi.

---

[315] İran İslam Tarixində Binaların Ensiklopediyası, Məzar binalar, s. 197. دایره المعارف بناهای تاریخی در دوره اسلامی، بناهای آرامگاهی، ص 197

[316] Bedia Akarsu "Dil-kültür bağlantısı" İnkılap yayınları 3-cü yayın 1998- İstanbul, s. 70.

Səfəvi nəfəsi toxunan yerlərdə bayındırlı Dədə Qorqud dilinin yerinə devrik bir dil yerləşdirildi. Türkçənin qurtuluş yolu səfəvilik bəlasından qurtularaq Dədə Qorqud dünyasına dönməsindədir.

## Çaldıran Savaşına doğru

Şüubiyə planları üzərinə iqtidarı ələ keçirən və Azərbaycanda bayındırlı türk uyqarlığının kökünü qazan Şah İsmayılın zəfərləri Anadolu qızılbaşlarını coşdurmaqda idi. Uzun illər məhrumiyətdə yaşamış, köçəri həyatdan yerləşik həyata keçməmiş olan türkmənlər şüubi İsmayılın əlində Azərbaycan türklərini tarixdən silmək üçün bir fürsət idi. Dini baxımdan aydınlanmamış, şüubiyənin gizlin planlarından xəbərsiz olaraq qızılbaşlaşan Anadolu ələvi türkmənləri səfəviliyin yüksəlişi ilə daha da coşmuşdu. Bu dəfə Osmanlıya qarşı başqaldırma cəsarətini hiss etməyə başlamışdılar. Osmanlının quruluşundan bəri ələvi-bəktaşi inanclı türklər tam özgürcə yaşamış, insanlar inancından dolayı öldürülməmişdi. Ələvilər sərbəstcə yaşamışdılar. Osmanlının və Türküstan dövlətlərinin xalqların inancları ilə işləri olmamışdı. Şüubiyə-Səfəvi dövlətinin quruluşuna qədər Osmanlıda ələvilərə toxunulmamışdı. Z**â**tən Osmanlı dövlətinin quruluşunda onların da etkisi olmuşdur. Qızılbaşlıq toplumun tarixi toxusunu dəyişdirməyə başlamışdı. Qızılbaşlıq ideolojisi Şeyx Heydər tərəfindən sapdırılmış, siyasətə

arac edilmiş ələvilik-bəktaşilik idi. Daha sonra da başkənd İsfahana daşındıqdan sonra Anadoludan gəlmiş qızılbaş türkmənlər dağlara, kəndlərə yerləşdirilərək öncə şahsevənləşdirildilər, sonra da tarixdən silinib yox oldular. Ancaq fars-şüubi dövlətini qurub sonra yox oldular. Varsaqlar kimi bir qismi də kor-peşman geri döndülər. Ancaq Azərbaycanda və digər bölgələrdə yaşayan türklərin belini qırıb səfəviyətə təslim edərək geri döndülər.

Səfəvilər öncəsi Anadoludakı baş qaldırılar tamam başqa mehvərdə idi. İqtidar uğruna savaşlar bütün tarixi dönəmlərdə olmuşdur. Şüubiyə-Səfəvi sonrası Anadoludakı qızılbaşların təxribatı, əslində şüubiyənin Osmanlını da devirib oranı da Sasani xəyallarına qatmaq istəməsi idi. Şüubiyə məmuru Şah İsmayılın amacı türkləri sadəcə Azərbaycanda deyil, Anadoluda da fars kimliyinə, fars düşüncə tərzinə tabe etmək olmuşdu. İrançılıq—şiəlik üzərində qurulan Səfəvi dövlətinin təməl amacı bu olmuşdur. Sonrakı tarixi sürəc bu gerçəyi açıqlamışdır. Şiəliyi qəbul etməyən qızılbaşlar şiəliyin qurumsallaşması yolunda savaşdılar. Yalnız Səfəvi dövlətinin quruluşundan sonra türk dili öz mehvərindən qaymışdır. Dilin cümlə quruluşu, söz tərkibi və genəl yapısı hızlı bir şəkildə farslaşmaya üz tutmuşdur. Türk dilində nəsr təcrübəsi olmamış, şeirdə də növhə və mərsiyə yuvalanmışdır. Bu da dilin öz tarixi xatirələrindən qopuşunun əsasını qoymuş, toplumun zehni anıları sapdırılmışdır. Azərbaycanda bayındırlı türk uyqarlığının ürünü

olan Kitabi-Dədə Qorqud və onun oluşdurduğu mədəniyyət və dünyagörüşü Səfəviyə tərəfindən tam olaraq sökülüb atılmışdır. **Adların qaynağı Dədə Qorqud kitabı olmaqdan çıxıb Şahnamə qaynaqlı olmağa qaydırılmışdır.**

Əli donunda, Hacı Bəktaş donunda Şah İsmayılın ortaya çıxarılışı ələvi-bəktaşiləri çox etkilədi. Qızılbaşlıq toplumsal bilinci Şah İsmayılla birlikdə siyasi bilincə dönüşdürülmüşdü.[317] Şah İsmayılın və´d etdiyi xəyallarla qızılbaşlıq qanlı siyasi hərəkətin öncüllüyünü üstlənəcək, ancaq bu sürəc içində Azərbaycan tarixi sürəkliliyindən qoparılacaqdı. Şah İsmayılın Xorasan və Azərbaycan zəfərləri üzündən moral bulan Anadolu qızılbaşları Osmanlıya qarşı başqaldırı yollarını aramaqdaydılar. Güclü bir təhlükəni hiss edən Osmanlı önləm almaq zorunda qalmışdı. Çünkü Təbrizdə, Ərdəbildə, Şirvanda öldürülən sünni müsələman türklərin xəbəri Osmanlıya ulaşır və istər-istəməz özlərini İslam Dünyasının öndər dövləti hiss etdiklərindən öldürülən müsəlman türklərlə bağlı sorumluluq duyqusu daşımaqdaydılar. Şübhəsiz ki, onlardakı sorumluluq duyqusu öldürülənlərin türk olduqları üzündən deyil, sünni müsələman olduqları üzündən idi. Çünkü Osmanlıda türklük bilinci doğmamışdı. Səfəvi dövlətinin quruluşu və Anadoluda qızılbaşların coşması ilə Osmanlının da qızılbaşlara qarşı önləm alması başlayır. “1502-ci ildə Balkanlardan Anadoluya

[317] Ankara Hüseyin Gazi Derneği, İsmail Kaygusuz “Aleviliğin kızılbaş siyasi hareketi ve Şah İsmail”, YOL dergisi, sayı 19 Ankara.

sürgün edilən Ələvilərin üzlərinə dağ çəkmişlər, damğalamışdılar."[318] Osmanlı dövləti Anadoluda qızılbaş ayaqlanmalarına qarşı cəza düzənəkləri gəlişdirsə də, Şah İsmayılın Ərdəbildə, Şirvanda, Şəkidə, Təbrizdə gerçəkləşdirdiyi toplu soyqırım hadisəsinə əl atmamışdı.

Sultan Məhəmməd Fatehin ölümündən sonra 1481-ci ildə İkinci Bayəzid taxta çıxmışdı. Qardaşı Cəmlə arasında olan səltənət savaşını ortadan qaldırıb dövlətin başına keçmişdi. Şeirdə "Ədni" təxəllüsünü qullanırdı. Arif təbiətli bir hökmdar idi. Onun zamanında bir çox önəmli kitab ariflər və alimlər tərəfindən yazılmışdır. Əllamə Dəvani "Vacib-ul vücudun isbatı" və Əbdulrəhman Cami "Silsilət-ül zəhəb" kitabını Onun dəstəyi ilə yazmışlar. Bayəzidin İsmayıl tərəfindən öldürülən Təftazani ilə də yazışmaları olmuşdu. Osmanlı sarayında bir çox fəqihlər Təftazaninin mədrəsəsində dərs almışdılar. İsmayıl Haqqı uzun "Osmanlı tarixi" kitabında Venizli səyyahların Bayəzid haqqında yazdığı xatirələrə yer vermiş. "Kəsinliklə şarab içməz. Az yemək yeyər. Dini vacibatı unutmaz. Çoxlu sədəqə verər. Fəlsəfədən anladığı üçün qürurlu görünür. Həddindən artıq nücum (kosmos) elmi ilə maraqlanır."[319]

Qızılbaşlar sünniləri və sünni alimləri qətl etdiklərində bir çox alim Bayəzidə uğrayıb yardım tələbində bulundular. Şah İsmayılın

---

[318] Ankara Hüseyin Gazi Derneği, İsmail Kaygusuz "Aleviliğin kızılbaş siyasi hareketi ve Şah İsmail", YOL dergisi, sayı 19 Ankara.

[319] İsmayıl Haqqıuzun 2-ci cild s. 264. (Farsca tərcümə).

törətdiyi qətllərdən üzgün olan Misir Məməluk sultanı da Bayəzidi önləm almağa təşviq etdi. Bu mövzu ilə ilgili Məmluk sultanı ilə Bayəzid arasındakı yazışmalar “Münşəat-üs səlatin”də (Sultanların məktubları) verilmişdir. Bu məktubların birində Misir sultanı yazır ki, Şah İsmayılın törətdiyi fitnəni ortadan qaldırmaq üçün hər bir müsəlman sorumluluq daşımalıdır. Bayəzid cavab məktubda yazır ki, biz hər namaz qıldığımızda bəlaları İslam Dünyasından uzaqlaşdırması üçün Allaha yalvarırıq. İlahi iradənin gerçəkləşməsi yolunda Tanrının bizlərə yardımçı olmasını diləyirik.[320] Bayəzid dostca yazışmalarla İsmayılı bu əməllərindən saqındırmaq istədi. Məktublarında onu nəsihət edərək “Dəyərli evlad” deyə xitab edər və əhalini qətl etməkdən, şəhərləri yağmalayıb yaxmaqdan vaz keçməsini istər. Ancaq Bayəzidin bu məktubları etkili olmadı. İsmayıl yazdığı cavab məktublarda əldə etdiyi qələbələrdən danışır və bu qələbələrindən dolayı Bayəziddən təbrik bəklədiyini söyləyirdi.[321] Bayəzidin bu girişimləri sonucsuz qaldı. Bir dəfə Bayəzidin elçiləri İsmayıla məktub gətirdiyində Şah İsfahanda idi. İsfahanda şəhərin sünni məzhəbli tutuqlularının meydana gətirilməsini istədi. Osmanlı heyətinin gözləri önündə Şah tanrısal qüdrətini göstərmək üçün onları bütün ailə üzvləri və çocuqları ilə bir yerdə atəşdə yaxdırdı. Osmanlı heyəti qorxu

---

320 Feridun bəy, Münşəat-üs səlatin 361-364. منشأت السلاطین فریدون بگ 361-364

321 Bayəzid və İsmayılın qarşılıqlı məktubları Feridun bəy, “Münşəat-üs səlatin”

içində öz ölkələrinə geri döndü.[322] Şah İsmayıl Osmanlı ilə nəzakətli siyasi münasibət qurmaq yerinə Anadoluya müridlərini göndərir və oradakı ələviləri həm dövlətə qarşı təhrik edir, həm də əsgər toplayırdı. Şah İsmayılın səltənətə çıxışından 1512-ci ilə qədər on minlərcə ailə Azərbaycana köçmüş, evladlarını qızılbaş ordusuna vermişdilər. Şah İsmayılın Azərbaycanda güvənəcəyi xalq olmadığı üçün Anadoludan daha çox insanların gəlməsini istəyirdi. Anadolunun bozqırlarından gələn köçəri ailələr həm Azərbaycanın tarixi-toplumsal toxusunu dəyişdirirlər, həm də bayındırlı sünni-türk mədəniyətinin tamamən yıxılmasına yardımçı olurdular. Səfəvilər üzündən bayındırlı mədəniyətindən Azərbaycanda iz qalmadı. Bayəzid Anadolu əhalisinin Azərbaycana axışını durdurmaq istədi. Bir çox ələvi ailələr Doğu Avropaya və Yunanistana sürgün edildi. Bunu duyan İsmayıl Bayəzidə bir məktub yazaraq bu işindən vaz keçməsini istədi. Anadolunun Azərbaycanla geniş bozqır və dağlıq sınır bölgəsi var idi. Bayəzid bu yolların kontrol ediləməyəcəyini görürdü. Bu üzdən də Azərbaycana olan qızılbaş axınının durdurlmasının mümkün olmayacağını sezdiyində Şah İsmayıla cavab məktubunda Doğu Avropaya daşıdıqları ələvilərin Osmanlı ordusunda xidmətə alınacaqlarını yazdı. Bayəzid İsmayılla yaxın diplomatik ilişki qurmaq istəsə də, İsmayıl onu dinsiz sünni adlandırıb önəmsəmirdi. Onun Şeybək Xan üzərinə

[322] Qiyasəddin Xandəmir 481, Cahangüşayi xaqan 226.

qələbəsi Osmanlı ilə ilişkilərini gərdi. Şeybək Xandan sonra Osmanlının sırasıdır xəyalına qapılmışdı. Gücünü Bayəzidə göstərmək üçün Şeybək Xanın başının dərisinə saman təpərək İstanbula göndərmiş və yazmışdı: Duydum ki, sənin məclisində Şeybək Xanın başının çox havalı olduğu söyləntiləri dolaşırmış. İndi onun başındakı havalar boşaldılıb və içi samanla doldurularaq xidmətinizə göndərilməkdədir.[323] Bayəzid böyük bir dövlətin başında durmasına və böyük ordularına rəğmən çox nəzakətlə davranırdı. İsmayıl isə, dövlətin, ədəb və tərbiyənin nə olduğunu bilməyən ipiqırıq əclaf kimi davranırdı. Ancaq İsmayılın kəsik başı ona göndərməsi Bayəzidi çilədən çıxardı. İçi samanla dolmuş kəsik başı gətirənlər Anadolu insanları idi. Onları öz yurddaşları olub və yabancı ilə işbirliyi etdiklərindən dolayı tutuqladıb zindana atdırdı. İsmayıla öyüd dolu bir məktub yazdı. O, İsmayılı dövlət işlərində təcrübəsiz davranmaqla uyarmış və öldürdükləri suçsuz müsəlmanlardan dolayı Allahın cəzasından qorxmasını istəmiş və yerinin cəhənnəmin əbədi atəşi olacağını yazmışdı. Bu düşüncəsini də Qurandan bir ayətə dayandırmışdı ki, “Bir mömini öldürənin yeri cəhənnəmdir və əbədiyən orada qalacaqdır.”[324] İsrar və öyüdlə İsmayıldan qətl törətməkdən vaz keçməsini istəmişdi. Xorasan zəfərindən sərxoş olan İsmayıl Osmanlının varlığına dözəməz olmuşdu. Anadoludakı xəlifələrinin daha aktiv olmalarını istədi. Özəlliklə xəlifəsi Şahquludan Osmanlını devirməsi üçün saldırıya keçməsini

[323] Cahangüşayi Xaqan 380.
[324] 4-cü surə, ayət-93.

istədi. Şahqulu Anadolu bəktaşilərinin önəmli adlarından biri idi. O, Anadoludakı on minlərcə müridləri hesabına Osmanlını devirəcəyini sanmışdı. Osmanlını devirib, orada da qətllər törədərək “haq məzhəb”ini Anadoluda da Azərbaycanda olduğu kimi yayqınlaşdırmaq istəyirdilər. Sünnilərin qətl edilməsi vacib idi. Çünkü şiə-şüubiyə inancında Mehdi gəldiyində saysız sünni öldürəcəyi vurqulanmaqda idi. İsmayıl özünü Mehdi hesab etdiyindən Osmanlını da devirib ordakı sünniləri qətl etməyi ilahi görəv olaraq görürdü. Osmanlı dövləti ordusunun böyük bir bölümü bəktaşilərdən oluşmaqda idi. İsmayıl Anadoludakı və Osmanlı ordusundakı casusları vasitəsi ilə Osmanlı ordusundakı vurucu güc üzərinə hesablamalar etmişdi. Orduda nə qədər şiə və bəktaşi olduğu ilə bağlı bilgilər əldə etmişdi. Bu bilgilərinə güvənərək Osmanlını yenəcəyinə əmin idi. Bütün dünya sünnilərinin məhvolma zamanının gəldiyini düşləyirdi. Bu iş üçün göylərin ona yardım etdiyinə inanırdı.

Bayəzidin Səkkiz oğlundan dördü həyatda idi. Oğulları Anadolunun müxtəlif yerlərində hökumət edirdilər. Böyük oğlu “Şahənşah” Konya hakimi idi. İkinci oğlu Əhməd Amasiya hakimi idi. Qorqud Manisa hakimi idi. Ən kiçik oğlu Səlim isə, Trabzon hakimi idi. Bayəzidin kiçik oğlu Səlimdə daha ciddi dövlət adamlığı xarakteri var idi və daha çox babası Sultan Fatehə bənzəməkdə idi. Bayəzid, oğlu Əhmədi canişin seçmək fikrində idi. Qorqudun hakim olduğu Manisa İstanbula yaxın olduğundan Bayəzid onu qardaşı Əhməd səltənətə

çıxdığında başkəndə saldırmasın deyə daha uzaq yerə, Antalyaya hakim göndərdi. Bundan üzgün olan Qorqud həcc ziyarətini bəhanə edərək bir gəmi ilə Misirə getdi. Neçə aydan sonra Bayəzid oğlu Qorqudun könlünü ələ alaraq qısa sürə sonra onu Manisaya geri gətirmək şərti ilə Antaliyaya göndərdi. Bayəzid baş vəzirin də razılığını əldə edərək rəsmən oğlu Əhmədi vəliəhd olaraq duyurdu. Bundan rahatsız olan Səlim ordusuyla İstanbula tərəf hərəkət etdi. Bu sırada "Şahənşah" xəstələnib öldü. Qorqud Manisaya geri döndü. Əhməd də vəliəhdlik hökmünü atasından almaq üçün Amasiyadan İstanbula yola düşdü. Əhməd İstanbula varmadan Bayəzid böyük bir ordunun başında Səlimi durdurmaq üçün yola düşüb onunla müzakirəyə başladı. Müzakirə belə sonuclandı ki, Bayəzid yaşadığı sürəcə kimsəni vəliəhd duyurmasın. Səlim bu anlaşmaya güvənmədi. Əhmədin də İstanbula doğru hərəkət etdiyi xəbərini duyduğundan geri dönmədi. Bayəzid Ədirnəyə getdi və Əhməd İstanbula çatar-çatmaz vəliəhdlik hökmünü ona göndərdi. Bunu duyan Səlim ordusuyla atasına saldırmaq üçün yola düşdü. Bayəzid də ordusyla oğlu Səlimə qarşı savaşa girdi. Savaşda Səlim yenilib geri çəkildi.[325] İstanbulda ordu komutanları Əhmədə qarşı ayaqlandılar. Yeniçəri komutanlar Səlimdən yanaydılar. Qarqaşa bir sürə bu şəkildə davam etdi və sonunda Bayəzid ordunun istəyinə təslim olaraq Osmanlı hökmranlığını Səlimə buraxdı. 1512-ci ilin nisan ayında Səlim

[325] Şərəf Xan Bitlisi "Şərəfnamə" 2-ci cild s. 150.

taxta çıxdı. Səlim taxta çıxdığında 45 yaşında idi. Bayəzid isə, xəstəlikdən ölmüşdü.[326] Bəzi tarixçilər Səlimin öz atasına zəhər içirdib öldürtdüyünü yazarlar. Ancaq bu söyləntinin doğru olmama ehtimalı daha yüksəkdir, çünkü zâtən Bayəzid xəstə idi ölmək üzrə idi və Səlim də artıq taxta çıxmışdı.

Bayəzid dönəmindən başlayaraq İsmayılın xəlifələri Anadoluda təxribatla məşğul idilər. Qızılbaşların Azərbaycana köçmələri üçün imkanlar sağlayır və dövlətə qarşı baş qaldırılar düzənləyirdilər. İsmayılın xəlifələrindən biri və Ərzincan hakimi olan Nurəli bu hərəkətlərə rəhbərlik edirdi. Ərzincan Trabzonla sınır idi və Nurəlinin bu təxribatı Trabzon hakimi Səlimi sinirləndirmişdi. Səlim Ərzincana saldırdı. Nurəli fərar etdi və bölgə qızılbaşlarının təşkilatları dağıldı. Ancaq Bayəzid böyük savaş çıxmasın deyə, Səlimin geri çəkilməsini istəmişdi.[327] Səlim hələ Trabzonda ikən Nurəlini yenməsi üzündən Nurəli Səlimə qarşı dərin nifrət bəsləyirdi.

Həsən Xəlifə adlı bir başqası Antalyada bir kənddə bəktaşı xanigahının şeyxi idi, özünü Şeyx Heydərin və İsmayıl vəliullahın müridi sayırdı. Kəndin yanında bir mağarada sufilər törəni keçirərdilər. Bu mağara sirr evi və İsmayıl müridlərinin toplantı yeri sayılırdı. Buraya toplanan müridlər Anadolu bəktaşilərinin Azərbaycana axışlarını örgütləndirirdilər. Həsən Xəlifənin zahiri zahidliyi Bayəzidin diqqətini çəkmiş və Bayəzid ona dövlət budcəsindən

[326] İsmayıl Haqqıuzun Osmanlı tarixi 2-ci cild, Səlimin taxta çıxışı, farsca tərcüməsi s. 151.
[327] Eyni qaynaq s. 279.

yardım edilməsini qərarlaşdırmışdı. Həsən Xəlifənin Qarabıyıq adında bir oğlu var idi. Atası onu Şah İsmayılın qulu olaraq görmüş və ona "Şahqulu" ləqəbini taxmışdı. Həsən Xəlifənin ölümündən sonra xanigahın başına Şahqulu keçdi. Anadolu bəktaşilərinin rəhbəri oldu. Şahqulu, Bayəzid oğulları arasında iqtidar savaşından yararlanaraq Osmanlı dövlətinə qarşı qiyam etdi. Camiləri yaxıb sünni qətlinə başladılar. Antalyadan Manisaya aparılmaqda olan Qorqudun xəzinəsini ələ keçirib müridlərinə payladı. Daha sonra Kütahiyaya saldırdı. Bir osmanlı taburu onun önünü kəsmək istədi. Şahqulu Osmanlı ordusunu yenib komutanları ilə bir yerdə hamısını qətl etdi. Kütahiyanı quşatıb xalqdan təslim olmalarını istəsə də, xalq təslim olmadı. Kütahiyanı işğal edə bilməyəcəyini görüncə Bursaya yönəlmək istəmişdi. Şahqulu qiyamı Osmanlı dövləti üçün çox ciddi təhlükəyə dönüşdüyündən ölkənin başbaxanı ordunun başına keçərək Şahquluya saldırdı. Şahqulu geri çəkilərək Qaramana getdi. Onun üstünə gələn Konya hakimini yenib öldürdü və şəhəri yağmaladı. Vardığı yerləri təxrib edərək Sivasa yönəldi. Başbaxanın komutanlığındakı ordu Qeysəri və Sivas arasında Şahqulunu sıxışdırdı. Böyük savaş başladı. Osmanlı ordusundan çox sayıda əsgər ölsə də, Şahqulu yenilib öldürüldü. Qızılbaşlar fərar edib Azərbaycana girdilər. Ərzincan yaxınlığında Təbrizdən Anadoluya gedən bir ticarət karvanını yağmalayıb tacirləri öldürdülər.

Bu zaman Şah İsmayıl Xorasanda idi. Fərari qızılbaşlar Şah İsmayılın yanına getmək

istəyirdilər. Bir sürə Azərbaycanda bəklədilər. Şah Xorasandan geri dönərkən yenik qızılbaşlar Reydə Şahın hüzuruna vardılar. Şah İsmayıl xəlifələrinin Osmanlını yenəcəklərini düşünmüşdü. Onların yenilmişliyinə çox sinirlənmişdi. “Sünni”lərin qarşısında onların yenildiklərini duyduğunda qəzəbləndi. Fərari qızılbaşların öncülərini öldürdü və qalanlarını da əmirləri arasında payladı.

Şahqulunun yenilgəsindən sonra Şah İsmayıl Ərzincandakı xəlifəsi Nurəliyə ayaqlanması üçün xəbər göndərdi. Səlimin qardaşı ilə iqtidar savaşının zirvəsində olduğu bir zamanda bu qiyam gerçəkləşdi. Anadolu qızılbaş boylarında əfşar, varsaq, qaraman, təkəli, həmidli, bozoxlu və torqut boyları bu geniş miqyaslı qiyama qatılmışdılar. Bu sırada Səlim taxta çıxdı. Qardaşı Əhməd iki oğlu Murad və Qasımı Azərbaycana göndərib iqtidarı Səlimdən geri almaq üçün İsmayıldan yardım istədi. Bunun üzərinə İsmayıl Nurəlidən Muradı savunmasını istədi. Sultan Muradın Osmanlı sultanı olaraq rəsmiyətə tanınmasını söylədi. Şah İsmayılın dəstəyini qazanmış olan Murad Anadoluya döndükdən sonra özünü sultan elan etdi. İsa Xəlifə, Şah İsmayılın əmri üzərinə Murada qatıldı. İsmayıl Haqqıuzun bir Topqapı bəlgəsinə dayanaraq yazır ki, bu zaman on mindən çox adam İsa Xəlifənin ətrafına toplaşdı. Murad başına tac qoyub qızılbaşları öz ordusuna daxil etdi. Amasiyada qısa sürdə 20 min sufi toplaşdı. Çorum başyarqıcını öldürüb şəhəri

yağmaladılar.[328] Şah İsmayıl xəlifələrinin uğur qazanacağına əmin olduğundan Sultan Səlim taxta çıxdığında ona nə təbrik göndərdi, nə də səltənətini rəsmiyətə tanıdı. Onun Yerinə Osmanlı Sultanı kimi Muradı rəsmiyətə tanıdı. Anadolunun doğusu doqquz ay Muradın hakimiyətində oldu. Sultan Səlim Diyarbəkir və Ərzincan valiləri Xan Məhəmməd Ustaclu və Nurəli Xəlifənin yardımları olmadan Muradın ayaqda dura bilməyəcəyini bildiyindən onlardan dəstəklərini çəkmələrini istədi. Osmanlı ərazisində fitnə salmamaları doğrultusunda onları uyardı. Onlar isə, Sultan Səlimə aşağılayıcı məktublar yazıb onu savaşa dəvət etdilər. Hətta bir kərə onu aşağılamaq üçün qadın paltarı göndərdilər. Qısa zamanda onu taxtdan endirəcəklərini yazdılar.[329] Ardından Nurəli Xəlifə Toqatı işğal edib Şah İsmayıl adına xütbə oxutdurdu. Bu, açıqca Osmanlı torpaqlarını işğal etmək anlamında idi. Toqat xalqı ayaqlanıb qızılbaşları məğlub edərək uzaqlaşdırdılar. Nurəli Xəlifə bu kəz daha böyük bir ordu ilə Toqata saldırdı. Toqatı savunmağa gələn Osmanlı ordusunu yenib yüzlərcəsini öldürdü. Toqatı işğal etdikdən sonra dirənənləri qılıcdan keçirib, şəhəri yağmalayıb Ərzincana geri döndülər. Daha sonra dörd min bəktaşi süvarini ailələri ilə bir yerdə Azərbaycana göndərdilər.[330] Sultan Səlim Nurəli Xəlifənin Anadoludakı əməliyatlarını Şah İsmayılın

[328] İsmayıl Haqqıuzun 2/267, 6-ci ətək yazı.
[329] Əhsən-üt təvarix, 139 və 142-143.
[330] Əhsən-üt təvarix 134-135, Cahangüşayi Xaqan 475.

Osmanlıya savaş açması kimi dəyərləndirirdi. Toqatın viran edilməsi Şah İsmayılın Sultan Səlimi rəsmən savaşa çağırması idi.

Qızılbaşların anadoludakı baş qaldırıları Osmanlı dövlətini önləm almağa zorlayırdı. Onlar Osmanlı uyruğu olmalarına baxmayaraq, başqa bir ölkə sultanının əmrləri üzərinə davranırdılar. Osmanlı dövlətinin tarixdə qalması qızılbaşları yenməklə mümkün olacaqdı, yoxsa Osmanlını zəiflədən bu saldırlar arxasınca Şah İsmayılla Avropa güclərinin Osmanlıya qarşı ortaq saldırılarına gətirib çıxara bilərdi. Səlimin qardaşları hələ iqtidar sevdasından vaz keçməmiş və sorun çıxarırdılar. Bu üzdən Səlim onları zərərsizləşdirməklə məşğul idi. Qardaşı Qorqudu Manisada yendi. Bir mağarada gizlənmiş olan Qorqudu tapıb öldürdülər. Əhməd və oğullarını da sorun olaraq ortadan qaldırmaq üçün planlar hazırladı. Ordu komutanlarından bəzilərinə dedi ki, özünüzü Əhmədin yanlısı kimi göstərib onu Bursaya dəvət edin. Onlar bu şəkildə davranıb və Əhmədə göndərgədə bulundular ki, İstanbulun alınmasında ona yardım edəcəklər. Əhməd onlara inanıb Malatiyadan ordusuyla bir yerdə Bursaya yollandı. Yolda ona saldırıb yaxalayıb öldürdülər. Arxasınca Osmanlı ordusu Amasiyaya axın etdi. Qasım Misirə və Murad İsmayıla sığındı.

Bu olaylar Şah İsmayıl, Nəcmi-Sanini Ubeydullahla savaşa göndərdiyində olmuşdu. Bu savaşda Nəcmi- Sani yenilib öldürülmüşdü. Bu üzdən Səlim, Murad və Qasım qardaşlarına saldırdığında İsmayıl onlara yardım göndərə biləcək durumda deyildi. Murad İrana fərar

etdiyində İsmayıl, Nəcmi-Saninin intiqamını almaq üçün yenidən Xorasana saldırı ərəfəsində idi. İsmayıl Murada söz verdi ki, itirdiyi mülk qarşılığında onu parsın valisi edəcək. Öylə də etdi. Ancaq ondan xoşlanmayan qızılbaşlar İsfahan yaxınlğında Muradı boğub öldürdülər.

Sultan Səlim qızılbaşların fitnələrini bir dəfəlik olaraq söndürmək istəmişdi. O, öz başqanlığında bir araşdırma kommissionu qurdu. Kommission bölgədə yaşayan qızılbaşların statistikasını dəqiqləşdirməli idi. Bölgə hökmdarlarından bu kommissionla əməkdaşlıq etmələrini istədi. Bu kommision bölgədəki 7-70 yaş arasındakı qızılbaşların adlarını dəftərə yazmalı idi. Statistika bəlirləmə sürəcində təqribən 40 min qızılbaş yaxalandı. Dirənən aktiv qızılbaş öldürüldü. Çox önəmli bölümü Osmanlının Avropa tərəfinə köçürüldü. Bölgənin Şah İsmayılın nüfuzundan boşaldılması qərarlaşdırılmışdı.[331] Özəlliklə İranpərəst tarixçilər Səlimi qatil göstərmək üçün bu 40 min adamın öldürüldüyünü yazarlar. Ancaq 40 min qızılbaşın qətl edilməsi ilə ilgili heç bir bəlgə mövcud deyildir.

İranda və Azərbaycan cümhuriyətində yersiz olaraq Sultan Səlimlə Şah İsmayılı bir-biri ilə müqayisə edərlər. Sultan Səlimin şiə düşməni olduğu kimi Şah İsmayılın da sünni düşməni olduğunu yazarlar. Ancaq tarixi gerçəklər göz önündə bulundurulduğunda bunun doğru olmadığı görünməməkdədir. Çünkü Sultan Səlim və Səlimdən öncə olanlar da şiə-ələvi düşməni

[331] İsmayıl Haqqıuzun 2/277.

olmamışlar. Onların ordularının əsas gücü ələvi ikən necə ələvi düşməni ola bilərdilər? Sultan Səlim tərəfindən yaxalanıb öldürülən, sürgün edilənlər dövlətin güvənliyini təhdid edirdilər. Ancaq Şah İsmayılın fəlsəfəsi sünni düşmənliyi üzərinə idi. Xorasanda, Təbrizdə və digər yerlərdə dövlətin güvənliyini təhdid etməyən sünnilər ailələri ilə bir yerdə dəstə-dəstə təbərrayan tərəfindən qətl edilirdi. Osmanlıda bir tək çocuq öldürülməzkən, Şah İsmayıl sünni çocuqları da qətl edirdi. Anadoluda sünni-ələvi düşmənliyini Şah İsmayıl dərinləşdirmişdi. Sultan Səlimin istəyi üzərinə sünni şeyx-ul islamlar qızılbaşlığın rəddi doğrultusunda fətva çıxardılar. Bu, dövlətin güvənliyini qorumaq amacı ilə dini imkanlardan yararlanmaq üçün idi. Qızılbaşların Azərbaycanda on minlərcə sünni qətletmə xəbərlərini alan İstanbul dini qurumları əndişəli idilər. Osmanlıda öldürülən ələvilər “ələvi düşmənliyi” məntiqinə görə öldürülməmişdilər. Osmanlı uyruğunun yabancı bir dövlətlə əməkdaşlıq edib dövlətə qarşı savaşması söz qonusu idi. Bayındırlı Azərbaycan dövlətçiliyi Şah İsmayıl tərəfindən devrilmiş və İran dövləti qurulmuşdu. Dövlətin dərin qatlarında yuvalanan fars ünsürünün əlinə türkləri bir-birinə qırdırmaq üçün bəhanə düşmüşdü. İnancı və dünyagörüşü etibarı ilə şüubiyə-fars təcrübəsindən su içən Şah İsmayıl bu arada tarixi fürsət axtaran İrani kimlik tərəfindən qullanılmaqda idi. Əqli bütünlüyü yerində olmayan İsmayıl adında bir çocuğa imamların ruhu kimi baxan qızılbaşlar kəndiləri də bilincində olmadan irani kimliyin savaşçı

kölələri halına gətirilmişdilər. Tarixi olayların nəticəsi tarixi sürəc içində ortaya çıxar. Qızılbaşların hesabına qurulan İran dövləti daha sonra onların özünü də iqtidardan tam olaraq uzaqlaşdırıb dövləti fars irqinə buraxacaqdı. Şüubiyə-şiə-fars ünsürü tərəfindən qızılbaşlığın qullanım sürəsi dolduqdan və sasaniliyin yenidən dirilişi sağlandıqdan sonra qızılbaşları aşağılayaraq bir qismini saxlularda (qarnizonlarda) savaş alətləri kimi saxlayacaq və qalan qismini də, hətta şəhərlərə buraxmayaraq dağlarda, dərələrdə şahsevənləşdirəcəkdilər.

Sultan Səlimin tətbiqatına uymaq istəməyən ələvilər dağlara səpələndilər. İsmayılın Xəlifələri də susdurulmuşdu. Nurəli İsmayıldan aldığı əmr üzərinə on minlərcə ələvini dağ-daşdan toparlayıb İrana köçmələrinə yardım etdi.

## Çaldıran Savaşı

Şah İsmayılın Osmanlının iç işlərinə qarışması durmaq bilmirdi. Sultan Səlim bunu durdurmaq üçün savaşdan başqa bir seçənək görmürdü. O, Anadoluda qızılbaş təmizləmə işini İsmayıla bildirmək üçün tutuqlu olan Şah İsmayılın xəlifələrindən birini sərbəst buraxıb bir məktubla Şah İsmayılın yanına göndərdi və “Get gördüklərini İsmayıla anlat!”[332] dedi. Səlim İsmayılın bu mesajı aldıqdan sonra onunla savaşa girəcəyini düşünmüşdü. 1514-cü il qışın sonlarına doğru Ədirnədə ordu komutanları ilə bir toplantı düzənlədi. Bu toplantıda uzunca qonuşub Şah İsmayılın təhdid olduğunu anladaraq Təbrizdə və digər şəhərlərdə müsəlmanları qətl etdiyini bildirdi. Ordu komutanlarının razılıqlarını savaşmaq üçün aldı və şeyx-ül islamlardan da cihad fətvası çıxarmalarını istədi. Ayrıca, Ubeydullaha bir məktub yazaraq birlikdə Şah İsmayıl təhlükəsini ortadan qaldırmağı önərdi.[333] Ancaq Ubeydullah bu zaman Xarəzmdə və Doğu Xorasandakı qiyamları basdırmaqla məşğul idi. Qızılbaşlara saldırmağa imkanı olmadığı üçün Sultan Səlimin məktubuna olumlu cavab verə bilmədi. Səlim Ədirnə toplantısından üç gün sonra İstanbula yola düşdü. Bir neçə gün sonra Təbrizə tərəf böyük ordusuyla yollandı. Şah İsmayılın başqa

[332] Eyni qaynaq.
[333] Feridun bəy, “Münşəat-üs səlatin” 1-ci cild.

tutuqlu xəlifələrindən biri olan Qılıç Xəlifəyə bir məktub verib İsmayıla göndərdi. Bu məktubda açıqca savaş elan edirdi. Yazırdı ki, İslam Dünyasının böyük fəqihləri sənin və müridlərinin mürtədliyi haqda fətva vermişlər və qətliniz vacibdir. Təbrizə doğru hərəkətdə və fitnə atəşini söndürməkdə qərarlı olduğunu yazırdı.[334] İsmayıl İsfahanda ovçuluqla məşğulkən Səlimin məktubunu aldı. O, Səlimin savaş elan etməsinə inanmadı. Məktubu gətirən Qılıç Xəlifənin də sünnilərə əsir düşdüyündən və ona savaş elan edən məktub gətirdiyindən dolayı başını kəsdi. Məktuba təpki göstərməyib aldırış etmədən əylənməsinə davam etdi. Şah İsmayıl savaşdan qorxan biri deyildi. Ancaq Səlimin məktubuna təpki göstərməməsinin səbəbi bəlli deyil.

Səlim Anadoluya girdikdən sonra 20 min kişilik ordu Sivasa göndərdi və Şah İsmayıla ikinci sərt məktubunu yazdı. Bu məktubda özünü “kafir öldürən” adlandırmışdı. Şah İsmayılı bütün kötülüklərin qaynağı olaraq görmüş və edam olunması gərəkdiyini yazmışdı.[335] Şah İsmayıl bu məktubu da ciddiyə almayaraq öz əyləncəsinə davam etmişdi. Ancaq bu məktuba cavab yazdı və Sultan Səlimin saldıracağına inanmadığını bildirdi. Bu məktubda Əli soyundan olduğunu yazır və Əli soyu ilə tərs düşənin qurtuluşu olmayacağını bir beyt şeirlə yazırdı. Bu bir şeiri də Hafiz Şirazidən

---

[334] İsmayıl Haqqıuzu “Osmanlı tarixi” 2-cild, s. 280.

[335] Sultan Səlimin Şah İsmayıla iki məktubun tam mətni, Parsadust s. 812-823.

çalaraq öz adına çıxdığı görünməkdədir.*[336] Sultan Səlim 140 min ordusuyla Sivasa çatmışdı. Sivasda ordunu iki qismə ayırdı. 40 minlik ordunu Doğu Anadoluya göndərdi. İsmayılın Kürdüstan tərəfindən saldırma olasılığına qarşı orada bir savunma xətti oluşdurdu. 100 minlik ordu və 300 savaş topuyla Təbrizə tərəf yürüyüşünə davam etdi. Sultan Səlimə qadın paltarı göndərən Nurəli Xəlifə və Xanməhəmməd Ustaclu savaşa girişmədən bölgəni tərk edib Azərbaycana qaçdılar. İsmayılın yanına varıb Ərzincanın düşdüyünü söylədilər. Şah İsmayıldan yenə də xəbər çıxmadığı üçün Səlim bu kəz daha sərt bir məktub yazıb onu savaşa dəvət etdi: Ölkə, sultanlar üçün onların namusu kimi bir şeydir. Hər sultan namusunu qorumaqla görəvlidir. Mənim əsgərlərim sənin ölkəndə irəliləməkdə ikən səndən bir xəbər yoxdur. Sənin kimi namussuz birinin mərdlikdən danışma haqqı yoxdur. Sənin kimi birisi şahlıq tacını atıb başına leçək örtməlidir.[337] Səlimin orduları Azərbaycanda irəliləsə də, İsmayıldan xəbər yox

---

* Şeirin Farscası bu beytdir:
Bəs təcrübə kərdim dər in deyre mükafat
Ba ale Əli hər ke dər oftad bər oftad.
بس تجربه کردیم در این دیر مکافات
با آل علی هر که در افتاد بر افتاد.
Hafiz şeiri də belədir:
Bəs təcrobə kərdim dər in deyre mükafat
Ba dordkeşan hər ke dər oftad, bər oftad.

[336] Sultan Səlimin Şah İsmayıla iki məktubun tam mətni, Parsadust s. 825-826.

[337] İsmayıl Haqqıuzun "Osmanlı tarixi" 2-cild, s. 281-282.

idi. İsmayılın savaşa belə duyarsız və laqeyd yanaşması Səlimi daha da qəzəbləndirirdi. Səlim İsmayılı savaşa çəkmək üçün bir plan düşündü. Bayındırlılardan qalan Şeyx Əhməd adında biri var idi. Şeyx Əhmədi aldadıcı bir mesajla İsmayılın yanına göndərdi. Şeyx Əhməd Təbrizin düşüşündə Ucanda** Şah İsmayıla təslim olmuşdu. Qızılbaşların Təbrizdəki cinayətlərini gördükdən sonra Osmanlıya qaçıb sığınmışdı. Şah İsmayıl onu tanıyırdı. Osmanlıya sığındığını bilmirdi. Şeyx Əhməd Həmədanın yaxınlığında İsmayıla vardı və ona dedi ki, Səlimin ordusunda bulunan şiə əmirlərin çoxu Səlimə ihanət edib Şah İsmayıla qatılmaq istəyirlər. Ordunun əsas komutanlarının bu xəbəri Şaha çatdırmaq üçün onu görəvləndirdiklərini söylədi. Savaş başlayacağı durumda ordu komutanlarının Şahın tərəfinə keçəcəkləri xəbərini İsmayıla çatdırdı. Sultan Səlimin Şah İsmayılı savaş meydanına çəkməsi üçün planı baş tutmuşdu. İsmayıl həmən Azərbaycana tərəf hərəkət əmri verdi. 12 minlik ordusuyla yola düşdü. Digər orduların da ona qatılması üçün Xoyda bəklədi.[338] Uğur qazanacağına o qədər inanırdı ki, qadınlarını və cəvahiratını da yanında gətirmişdi. Xanməhəmməd Ustacluya Diyarbəkirə və Azərbaycanda bulunan ordularının da savaş meydanına tərəf hərəkət etmələri əmrini göndərdi.[339] Şeyx Əhmədə də Sultan Səlimin ordusundakı şiə komutanlara savaşın Çaldıranda

** Ucan´ın adını Pəhləvilər zamanında dəyişdirib Bostanabad qoymuşlar.

[338] Aləm arayi Səfəvi. 477.

[339] Lobb-ul təvarix 225-256.

olacağını söyləməsini istədi. Və dedi: Rum qeysəri (sultanı) mərd isə, gəlsin də onunla öyləsinə savaşım ki, dünya durduqca haqqında danışsınlar.[340] Bütün qızılbaş orduları Xoyda Şah İsmayıla qatıldılar. Bir yerdə Çaldırana yürüyüb Sultan Səlimi bəklədilər. 20 min nəfərlik ordu Çaldıranda savaşa hazır idi.[341] 23 avqust 1514-cü ildə Çaldıran savaşı başladı. Öncə qızılbaşlar saldırdılar. Osmanlı ordusunun tam ortasına böyük cəsarətlə saldırıya keçdilər. Səlimin ordusundan çoxunu öldürüb ordunun düzənini qarışdırdılar. Osmanlı ordusunun tüfəngçiləri onları geri püskürdüb çoxunu öldürdü. Qızılbaş əmirlər bunun üzərinə Şah İsmayılın savaş meydanına girib qızılbaşlara moral verməsini istədilər. Savaş gedərkən Şah İsmayıl arxada bildirçin ovlamaqda idi.[342] Savaş qızışdıqdan sonra Şah İsmayıl meydana girdi və Osmanlının ən güclü savaşçılarından biri olan Malqoçoğlu ilə qarşılaşdı. Xeyli vuruşmalardan sonra Şah İsmayıl Malqoçoğlunu öldürdü.[343] Savaşın ilk başlanqıcında qızılbaşlar üstünlüyü ələ keçirmişdilər. Osmanlı ordusunun ortasına şığıyıb onlardan öldürərək yenidən geri dönürdülər. Şah İsmayılın bu savaşda göstərdiyi qəhrəmanlıqları bir çox kitablarda yazmışlar. O cümlədən o bir neçə dəfə toplara saldırıb və topların zincirlərini qılıcının sərt vuruşu ilə

---

340 Aləm arayi Səfəvi. 477.

341 İskəndər bəy Türkmən "Tarixe-Aləmaraye-Abbasi", çevirən Şahin Fazil, "Şərq-Qərb" Bakı-2010, s. 106.

342 Eyni qaynaq.

343 Eyni qaynaq.

qırmışdı. Ordular bir-birinə çox yaxınlaşmışdı. Artıq top atışları ilə qızılbaşları vurmaq mümkün idi. Top atışları bir neçə dəqiqə içində qızılbaşların düzənini dağıtdı, yüzlərcəsini öldürdü. Çaldıran savaşı bir neçə saat davam etmişdi. Səhər vaxtından günbatana qalmış savaş sürmüşdü. Şah İsmayıl və qızılbaşlar inanılmaz qəhrəmanlıq göstərsələr də, Sultan Səlimin odlu silahlarla donatılmış ordusunu yenə bilmədilər. Qızılbaş əmirlər qanlarına qəltan oldular. Ölümünü kəsin olaraq hiss edən İsmayıl bir çuxurda gizlənərək özünü ölmüşlüyə vurdu ki, kimsə onu görməsin. Diri qalan qızılbaşlar fərar edib dağlara qaçdılar. Şah İsmayılın ordusu talandı və qadınlarından biri də əsir düşdü. Bu zaman Əfşar boyuna mənsub Şah İsmayıla bənzəyən bir qızılbaş, Şahın paltarına bənzər paltar geyinmişdi. Osmanlılar onu Şah İsmayıl sanıb yaxalayaraq Sultan Səlimə apardılar. Şah İsmayılı yaxından görmədiyi üçün Sultan Səlim də onun Şah olduğunu sanıb atəşkəs əmri verdi. Bu qızılbaş əbədi cənnətə qovuşmaq üçün canını mürşidi-kamilinin yolunda fəda etdi. Şah İsmayıl gecəyarısına qədər özünü çuxurda ölmüşlüyə vurmuşdu. Sultan Səlim də yaxalanan saxta Şah İsmayılın soruşdurulmasına əmr verdi. Ortalıq sakitləşdikdən sonra Şah İsmayıl çuxurdan çıxıb bir neçə qızılbaşla bir yerdə atlarını Həmədana tərəf çapdılar. Sultan Səlimdən öyləsinə qorxmuşdu ki, heç bir yerdə duraxsamadan atlarını sürüb getdilər. Təbrizə dönməyə belə cürət edə bilmədi. Səlimin gəlib Təbrizdə onu yaxalayacağından qorxmuşdu. Başkəndini də

sahibsiz buraxıb Səlimin tapa bilməyəcəyi bir yerdə gizləndi.

İtaliyan tarixçi Sagredo “Osmanlı imperatorluğunun tarixi” adlı kitabında yazır: “Çaldıranda ölənlərin arasında qadın cəsədləri də tapıldı. Qadınlar kişi paltarları geyinərək qızılbaş ərlərinin yanında savaşa girmişdilər. Sultan Səlim qadınların cəsarətinə “afərin!” söyləyərək onların hərbi törənlə basdırılmalarına əmr verdi.”[344]

Şah İsmayılın bu savaşda iki qadını da əsir olaraq yaxalandı. Biri Taclı xanım idi, digəri də Behruzə xanım. Taclı xanım bərk lə´ldən oluşan sırığasını onu əsir olaraq yaxalayan Məsih paşaya rüşvət verərək kişi paltarı geyinib atına minərək aradan çıxdı. Ancaq İsmayılın ən çox sevdiyi Behruzə xanım Osmanlıların əsiri olaraq qaldı.[345]

Ayrıca, Təbriz əhalisi ondan intiqam almaq üçün fürsət axtarırdı. Təbrizə dönsəydi, yenilmiş İsmayılı xalq param-parça edərdi. Azərbaycanın yerli əhalisi içində İsmayılın sevənləri yox idi, tək yavərləri Anadoludan gələn qızılbaşlar idi. Fərari qızılbaşlardan da kimsə Təbrizlilərin qorxusundan başkəndə geri dönmədi. Bəlkə də tarixdə ilk kərə idi ki, bir Şah yenildikdən sonra

---

[344] Nəsrullah Fəlsəfi, Şah İsmayıl və Çaldıran savaşı (Şah İsmail və cənge çaldıran), Tehran 1342 (h.ş), s. 23.

[345] Nəsrullah Fəlsəfi, “Bir neçə tarixi və ədəbi məqalə” (Çənd məqaleye tarixi və ədəbi, 1342- Tehran, s. 17, Səfəvi qaynaqları olan “Aləm arayi-şah İsmayıl, Səhaif-ul əxbar, Tarixi-cahan ara” kitabları əsasında yazılmışdır.

başkəndini savunmaq yerinə çöllərdə gizlənməyə qaçırdı.
Şah İsmayılın tarixə girməsinə imkan sağlayan Hüseyn bəy Lələ və Xanməhəmməd Ustaclu kimi cəsur savaşçılar Çaldıranda öldülər.[346]

Azərbaycanda Bayındırlı dövlətini yenidən qurmaq istəyən Murad bəy Bayındır Zülqədərə sığınmışdı. Çaldıran savaşında İsmayılın yenilgəsi üzərinə Bayındırlı dövlətini yenidən Təbrizdə qurmaq fikrinə düşdü. Diyarbəkirdə qızılbaşlara saldırıb ordan Təbrizə keçmək istədi. Ancaq bu savaşda öldü. Bəlkə diri qalsaydı Sultan Səlim onu yenidən bayındırlı dövlətinin başına gətirib geri dönər və Səfəvilik də tarixdən silinə bilərdi. Ancaq Muradın ölməsi şüubiyənin Azərbaycanda daha sonrakı tətbiqatı üçün meydanı boş buraxdı. Sultan Səlimin böylə bir amacı var idi. Bu üzdən Murad Bayındara bir məktub yazıb Təbrizə gəlməsini istədi. Ancaq Murad bəy Bayındırın ölümü bu planı suya düşürdü. Bu arada Loristan əhalisi hələ şiələşməmiş, sünni məzhəbində qalmışdılar. Loristanın hakimi olan Məlik Rüstəm şiələşəcəyi üçün Şah İsmayıla söz versə də, sünnilikdən dönməmişdi. Səlimlə gizlicə ilişkiləri var idi. Çaldıran zəfərindən sonra Səlim Loristan hakimi Məlik Rüstəmə məktub yazaraq ondan, qaçan qızılbaşlara oralarda yerləşmələri üçün izn verməməsini istədi. Rastlandıqları qızılbaşları gördükləri yerdəcə öldürmələrini istədi. Çünkü onların başçıları savaşda ölmüş və möminlər üçün qızılbaş öldürmək vacib olmuşdur.[347]

[346] Eyni qaynaq s. 109.
[347] Feridun bəy, "Münşəat-üs səlatin" s. 393.

Qızılbaşların yenilgəsini və Şah İsmayılın öldürülmə xəbərini duyan Təbriz əhalisi sevinc çığlıqları atmağa başlayaq bayram etdilər. Təbriz gəncləri direniş qrupları təşkil edərək gecələr Təbərrayan dəstələrinin evinə saldırıb onları qətl etdilər. Səfəvi tarixçisi yazır: Çaldıran savaşında Şah İsmayılın yenilməsinin xəbəri Təbrizə çatdığında Təbriz quldurları gecələr qızılbaşların evinə saldırmağa və onları qətl edib evlərini yaxmağa başladılar.[348] Səlim, başbaxan Hərsəkzadə komutanlığında bir taburu Təbrizə göndərdi. Qızılbaşların bir qismi Təbrizlilər tərəfindən öldürülmüş, digər qismi də Təbriz saxlusunda (qarnizonda) savunma durumunda idi. Təbriz əhalisi tərəfindən quşatılmışdılar. Təbriz əhalisi sevinclə Hərsəkzadənin istiqbalına qoşdu. Saxluda barınan qızılbaşlar Şah İsmayılın ölüm xəbərindən ümidsizliyə düşüb, Hərsəkzadəyə təslim oldular. Bütün bu qızılbaşlar Anadoludan gələn Osmanlı uyruqluları idi. Hərsəkzadə onları iki bölüm şəklində Sultan Səlimə göndərdi. Sultan Səlim vətənə ihanət üzündən hamısının boynunu vurdu. Çaldıran savaşından iki həftə sonra Səlim Təbrizə uğradı. Təbriz əhalisi yollara xalça döşəyərək Sultan Səlimi qarşıladı. O, Bayındırlıdan miras qalan cənnət saraya daxil oldu. Sabahısı cümə günü idi. Cümə namazını qılmaq üçün Cami məscidinə getdi. Şah İsmayıl Təbrizi işğal etdikdən sonra bu məscid sünni mirası olduğundan tövləyə dönüşdürülmüşdü. Hərsəkzadə iki həfətə içində oranı yenidən

[348] Cahangüşadan alıntı, Parsadust 596.

namaz qılınır hala gətirmişdi. Bu məscidin bir qismi indi də Təbrizdə qalır və Göyməscid olaraq bilinir. Səlim Təbrizdə uçurulmuş digər camilərin də onarılmasına əmr verdi. Təbrizlilər Səfəvi öncəsi əski mutlu günlərin geri döndüyünü sanmışdılar. Səlimin Bayındırlı dövlətini yenidən tarixə gətirmə istəyi baş tutmadı, çünkü Murad Bayındırlıdan xəbər çıxmadı. “Sultan Səlim fəxrlə Təbriz şəhərinə gəldisə də, altı gündən artıq qalmadı”[349] Səlim Şah İsmayılın bütün xəzinəsini özüylə İstanbula apardı.

Çaldıran savaşı bölgə tarixinin dönüm nöqtəsi oldu. Çaldıran savaşındakı Osmanlının zəfəri və tarixi sürəcin uzantısı Türkiyə Cümhuriyəti kimi milli türk dövləti doğrudu. Səfəvilərin mirası isə, milli fars dövləti oldu. Çaldıranda Sultan Səlim deyil, Şah İsmayıl uğur qazansaydı şübhəsiz ki, tarixin axışı və günümüzdəki nəticələr fərqli olacaqdı. Yenilmiş sünni Osmanlını tarixdən silmək üçün Şah İsmayıl bütün cinayətlərə əl atacaq, vardığı şəhərlərdə Təbrizdə olduğu kimi təbərrayan sünni-türk soyqırımına başlayacaqdı. Ayrıca, Şah İsmayıla dəstək verən Batı gücləri də Osmanlıya saldıracaq və türkləri Anadoludan söküb ataraq İstanbulu yenidən ələ keçirəcəkdilər. İki tərəfdən türk soyqırımı başlayacaqdı. Doğudan Şah İsmayıl sünni-türk soyqırımı yapacaq, Batıdan da Batı gücləri İstanbul yenilgəsinin intiqamını alacaqdı. Tarixin nəticəsi isə, günümüzdə olduğu kimi olmayacaqdı.

[349] İskəndər bəy Türkmən “Tarixe-Aləmaraye-Abbasi”, çevirən Şahin Fazil, “Şərq-Qərb” Bakı-2010, s. 109.

Anadolunun dərinliklərinə qədər fars-İran dövləti olacaqdı. İsmayılı ortaya atan şüubiyənin də amacı bu idi. Batı tərəflərə də Qərb ölkələri sahib çıxacaq, Trabzonu, İstanbulu türklərdən geri alacaqdılar. Bu baxımdan və türk millətinin yazqısı açısından Sultan Səlimin qələbəsi və Şah İsmayılın yenilməsi türk millətinin tarixdə qalmasını təmin etmişdir. Şah İsmayıl təhlükəsi türk tarixindən tam olaraq qaldırılmasa da, qismən qaldırılmışdır. Çünkü Şah İsmayılın təsis etdiyi dövlət daha sonrakı dönəmlərdə şiələşdirdiyi türkləri camilərdə sürülər şəklində aşura törənlərində ağladaraq farslaşdıracaq, tarixi hafizəsini siləcək, yeni irani kimlik ortaya qoyacaqdı.

Şah İsmayıl türk asimilasionunun təməlini qoydu. Fars dilinin cümlə quruluşuna və söz tərkibinə görə yazılan mərsiyə və növhə ədəbiyatı mətnlərində türk dili ilə savaş başladı. Türk dilinin cümlə quruluşu və söz tərkibi farslaşdırıldı. Səfəvilərdən öncə türk ədəbiyatında yayqın olan, ancaq fars dilində qarşılığı olmayan bütün sözlər qətl edilərək dildən çıxarıldı. Şah İsmayıl sadəcə insanları qətl etmədi, türk dilinin də tarixi sürəc içində qətl edilməsinə meydan açdı. Türk dilinə girmiş olan bütün ərəb sözləri istisnasız olaraq şiələşdikdən sonra fars dilinin fonetikasına görə tələffüz edilməyə başladı. O zamana qədər dilimizdə Həbibi, Kişvəri, Füzuli, Nəsimi kimi şairlərin yaradıcılığında sıxca qullanılan “ərdəm”, “şu”, “kəndi”, “nitəlik”, “ulaşmaq”, “onarmaq”, “ərmək”, “ərişmək”, “əsənlik” kimi yüzlərcə söz fars dilində qarşılığı olmadığından türk dilindən

dışlandı. Səfəvilərə qədər birinci şəxs zəmir "bən" olaraq yazılmaqda və söylənməkdədir. Çünkü türk dilində zəmir çoxluq halına dönüşdüyündə kök hərf dəyişməz. "Bən" zəmirindəki "b" hərfi "biz" zəmirində də bulunmaqdadır. Necə ki, "sən" zəmirindəki "s" və "o" zəmirindəki "o" kök hərflər "siz" və "onlar" zəmirlərində də qorunmaqdadır. "Mən" farsca və "bən" türkçədir. "Mən" türkçə olsaydı, onun çoxluq bildirən halı "biz" deyil, "miz" olmalı idi. Dünya dilləri üç qismə bölünür: 1- Ayrışqan dillər (Çin dili kimi). 2- Büklümlü dillər (latın kökənli və ərəb dili kimi). 3- Bitişimli dillər (türk dili kimi). Bitişimli dillərdə genəldə kök söz və özəlliklə kök hərf varlığını yeni söz düzəlimində itirməz. Səfəvi dövləti qurulduğu ana qədər bu sözlər Həbibi, Kişvəri, Füzuli yaradıcılığında sıxca qullanılmış. Ancaq sanki qara külək əsib və köklü anlamı olan bu sözləri süpürüb aparmış. Bunlar 500 il təpəsinə dövərək ağlaşan xalqın fars dilinə uyum sağlamasının ürünüdür. Şiələşdirilmiş türklərdə türk dili üzərində farslaşdırma operasionu yapıldı. Fars dilində bir tək məsdər əlaməti olduğu üçün, özəlliklə Təbrizdəki Səfəvi operasionu nəticəsində "mək" məsdər əlaməti dildən tamamən çıxarıldı. Sadəcə "maq" qaldı. Bu, fars dilinə uyum sağlama sürəci idi. Bəzi qaynaqlarda Quranın bayındırlılar dönəmində türk dilinə tərcümə edildiyini yazmışlar. Ancaq sünni tərcüməsi olduğundan əsər yox edilmiş. Səfəvilər dönəmində Quranın bir cüzünün sünnilər tərəfindən oğurlandığına inanılırdı. İndi də bu inanc var. Bu operasion Şah İsmayıldan

başlayaraq günümüzə qədər davam etmişdir. Öylə oldu ki, bu 500 illik zaman dilimində türk dili kor edildi. Türk dili mənsur yazıda düşüncə dili olma şansını itirdi. Bu da türk dilinin Türküstandan və Anadoludan təcrid edilərək farscanın qarşısında savunmasız buraxılmasına nədən oldu. Şiələşən bölglərdə türk dili fars dilinin kölgəsi altında qaldı.

Anadoluda Osmanlı ərəb zehniyətinin basqısı altında qalan türkmənlər böyük ümidlərlə Səfəvi dövlətinin quruluşuna qatqıda bulundular. Osmanlıdakı aşağılanmalardan bezmişdilər. "Osmanlıda türklərin dikey anlamda sosial statuslarını dəyişdirmə imkanları yox idi."[350] Devşirmə modeli istər-istəməz türk olmayanlar üçün önəmli haq və özgürlüklərin gündəmə gəlməsinə yol açmışdı.[351] Osmanlı devşirmə tarixçilərindən biri olan Əli Mustafaya (1541-1600) görə türklərdən birinin toplumda yüksəlməsi, üst vəzifələri əlinə keçirməsi doğası gərəyi mümkün deyildi. Əli Mustafaya görə Osmanlıda yüksək əsgəri vəzifələrə qatılmanın üç yolu vardı: 1- Müsəlman doğmamış olmağı gərəkdirən devşirmə yolu. 2- Əsgəri sinifdən birinin çocuğu olma. 3- İslami eyitim sürəci.[352] Dikey olaraq toplumsal status dəyişdirmə türklərin əlindən alınmışdı.[353] Aşıq Paşazadyə görə yeniçərilərin türklərə baxış açısı aşağılayıcı

[350] Orhan Türkdoğan "Türk toplum yapısı", Türk Dünyası Araştırmaları vakfı sayı 141.
[351] Eyni qaynaq.
[352] Eyni qaynaq.
[353] Eyni qaynaq.

nitəlikdə idi.[354] Tarixçı Əli Mustafa “nüsxət-üs səlatin” əsərində Osmanlı ilə türklük arasında heç bir bağ qurmaz. Osmanlılar “türk” kəlməsini uyqarlaşmayan insan tipi kimi anlayırdılar.[355] Hər toplumda, özəlliklə ərəblərdə və farslarda qövm əsəbiyəsi son dərəcə yüksəkdir. Osmanlı nə yazıq ki, qövm əsəbiyəsini geri plana etmiş, köləvari bir yönətim biçimini ölkənin başına bəla etmişdi.[356]

İştə Osmanlıda bu biçim basqılar altında inləyən türkmənlər bir qurtuluş aramaqda idi. Səfəvi dövlətinin quruluşunu qurtuluş olaraq sanmışdılar.

## Çaldıran savaşı sonrasında

Sultan Səlimin dönüşündən sonra ölkə artıq sahibsiz qalmışdı. Bayındırlı kökənli önəmli bir dövlət adamı olsaydı, Səfəvilərin həyatına son verilə bilərdi. Qızılbaşlar Azərbaycan türklərindən öyləsinə qorxurdular ki, hər yerdə özlərini təqib altında hiss edirdilər. Səlimin dönüşündən sonra səltənət iddiasında bulunan olmadı. Şah İsmayıl Həmədanın Dərgəzin mağarasında gizlənmişdi. Müridlərindən birini xəbər gətirmək üçün Təbrizə göndərdi. Sultan Səlimin geri döndüyü xəbərini alar-almaz ölmədiyi, yaşadığı ilə bağlı xəbər yaydırdı. Dağlara-dərələrə səpələnmiş qızılbaşlardan geri dönmələrini istədi. Qızılbaşlar öncə bu xəbərə

[354] Eyni qaynaq.
[355] Eyni qaynaq, s. 37.
[356] Eyni qaynaq, s. 13.

inanmadılar, onlar Şahın öldüyünə inanmışdılar. Şah İsmayıl Sultan Səlimin Azərbaycana geri dönməyəcəyindən əmin olduqdan sonra gizləndiyi mağaradan çıxıb ətrafındakı müridləri ilə gizlincə Təbrizə gəldi. Yolda minlərcə qızılbaş onlara qatıldı. Təbriz əhalisi ümidsizliyə uğramışdı. Onlar İsmayılın öldüyünü sanıb sevinmişdilər. Qızılbaşların şəhəri tərk etdiyi müddətdə Təbriz əhli əski məzhəblərinə geri dönmüşdülər. Bu da İsmayıla görə "mürtədlik" idi. İsmayıl sünniləşmiş olan Təbriz əhalisindən yenidən intiqam almaq fikrinə düşmüşdü. Şah İsmayılın diri olduğu xəbəri doğrulandıqdan sonra qızılbaşlar təkrar Təbrizə axın etdilər. Çaldıran savaşı sonrasında Şah İsmayıl fələkzədə, çarəsiz və ümidsiz duruma düşmüşdü. O, içində imamların ruhunu daşıdığına və yenilməz olduğuna inanırdı. Bu yenilgə İsmayılın inancının batil və yanlış olduğunu ifşa etdi. Bu üzdən də İsmayılın özünə güvəni qırılıdığından həyatını əyyaşlığa, oğlanbazlığa və içkiyə adayacaqdı. Bu dönəmdən sonra İsmayıl tam olaraq dövləti farslaşdırma politikasını izləmişdi. Şahın bütün görəvlərini üstlənmiş olan "vəkili-nəfsi hümayun" (əskidən lalalıq qurulu idi) İsfahan farsından olan Mirzəşah Hüseyn adlı birinə verildi. Mirzəşah çaldıran savaşında şahın qadınlarından birini qaçırıb bir yerdə saxlamış, Şah İsmayıl ortaya çıxdıqdan sonra qadını İsmayıla gətirmişdi. Bu üzdən də Şahın mütləq güvənini qazanmışdı. Lalalıq qurulunun ortadan qaldırılıb yerinə "vəkili-nəfsi hümayun" qurulu yerləşdirildiyi gündən etibarən Azərbaycanda

dövləti farslara buraxma əməliyatı başlamışdı. Dövlətin qurucusu olan qızılbaşlar bilə, bu qurumun başında duran farslar tərəfindən aşağılanırdı. Fars soylu Mirzəşah Hüseyn İsfahani dövlətin bütün yetkilərini əlində mərkəzləşdirməkdə idi. İstədiyi fars kökənliləri dövlətin önəmli qurumlarında yerləşdirirdi. "O, qərarvermədə yetkili olan tək şəxs idi. Hər kəs ona tabe olmaq zorunda idi. Mirzəşah Hüseyn İsfahaninin xəbəri olmadan kimsə dövlət işlərində sərbəst davrana bilməzdi."[357]

Şah İsmayıl Çaldıran savaşından sonra şəxsiyət dəyişikliyinə uğramışdı. Çaldıran öncəsi şəxsiyəti ilə ziddiyətdə olan bir şəxsiyətə dönüşmüşdü. Özünün yenilməzliyinə olan inancının tam olaraq sarsılması şəxsiyətini tamam dəyişdirmişdi. Çaldıran savaşında Sultan Səlim ona göstərdi ki, o, nə Allahdır, nə peyqəmbər, nə imam, nə də vəliullah. Canının qorxusundan bir çuxurda gizlənib özünü ölmüşlüyə vuraraq ordusunu başsız buraxan, can qorxusunda olan və başkəndini buraxıb ortalıqlarda görünməz olan zavallının biridir. Sultan Səlimin zərbəsi onu öyləsinə sarsıtmışdı ki, təkrar onun geri dönməsindən qorxurdu. Çaldıran məğlubiyəti onun gerçək üzünü ortaya çıxardı. İnsanların cövhəri zəfər zamanları deyil, məğlubiyət zamanları ortaya çıxar. Qələbənin doğurduğu sərxoşluqlar var. Könüllü qızılbaşların Şah İsmayılın yoluna baş qoymaları və ard-arda zəfər qazanması onun ağlını başından çıxarmışdı. Çaldıran zərbəsi ağlını

[357] Həbib-ül seyr 549.

başına gətirdi. Özəlliklə qızılbaşların da ona olan güvəni sarsılmışdı. Çünkü qızılbaşlar Şah İsmayılın yenilməz olduğuna iman gətirmişdilər. Bu yenilgəyə onlar öz inanclarında cavab verə bilmirdilər. "Şah İsmayıl nədən yenildi?" sorusu dolaşırdı ortalıqda. Çaldıranda Sultan Səlimin zəfəri onu yürüyən bir meyidə dönüşdürdü. Artıq o, gerçək bir ölü idi. Öz kölgəsindən qorxar duruma gəlmişdi. Bu üzdən də Sultan Səlimə acizanə bir məktub yazdı.

Əski düşmənliklərin unudulmasını və dostca ilişkilərin qurulmasını rica etdi.[358] Səlim bu məktuba cavab yazmadı. Sadəcə məktubu gətirən qızılbaş əski Osmanlı uyruğu olduğundan ölkəyə ihanət adı ilə tutuqladıb həbs etdirdi.

İsmayıl, Ərzincanda Nurəli Xəlifənin ölüm xəbərini duyduğunda Səhəndin ətəklərində əyləncə ilə məşğul idi. Bu xəbəri çox da önəmsəmədi.[359] Daha öncəki savaşlarda Şah İsmayıl zəfərdən zəfər qoşduğunda özünün yenilməzliyinə və imamların qutsal ruhunu daşıdığına inanmışdı. Bu inancına görə Sultan Səlimi də yenəcəyini düşünürdü. Çaldıran yenilgəsi onun inancının tamamən batil olduğunu isbatladı. İnancının batil olduğu ifşa edildikdən sonra yenik və səfil bir duruma düşdü. Əski fatehlik duyqularından əsər qalmamışdı. Xəlifələrinin Anadoluda qiyam etmələri artıq onun üçün məsxərə görünürdü. Onların ölüm xəbərini də önəmsəmirdi. O

[358] İsmayıl Haqqıuzun "Osmanlı tarixi" 2-ci cild, s. 290.
[359] Qiyasəddin Xandəmir 550.

duyğular Çaldıran məğlubiyəti ilə tamamən sönüb küllənmişdi. Artıq qızılbaşlara zəfər nəğməsi söyləyən Tanrı ruhu olduğunu dilə gətirməz olmuşdu. Bu məğlubiyət onun ruhunu güvənsizliyə gömmüşdü. Sultan Səlim Təbrizə girdikdən sonra namaz qıldığı və dəyər verdiyi hər yer qorunma altına alındı. Sultan Səlimin təkrar geri dönməsindən çəkinən Şah İsmayıl artıq Göyməscidin yenidən tövləyə dönməsinə izn vermədi. Sultan Səlimdən çəkinməsi bunu önlədi. Osmanlının yenidən Təbrizə girməsindən qorxduğu üçün Sultan Səlimin ayaqlarının toxunub qutsadığı yerə önəm vermək zorunda qaldı. Savaş çıxaracaq bütün bəhanələri ortadan qaldırmağa çalışdı. Yeni bir savaş çıxacağı təqdirdə qaçacağı yer qalmamışdı. Bütün Orta Doğu və Türküstan ona düşmən idi, onun törətdiyi soyqırımlardan bizmişdilər. Təbrizdə Göyməscidin ayaqda qalmasının səbəbi bu oldu. Çünkü Sultan Səlim orada namaz qılmışdı.

## Sultan Səlimin Misiri fəth etməsi

Sultan Səlim İstanbula döndükdən sonra Şeyx İdris Bitlisi başqanlığında Kürd əmirlər Osmanlı sultanının hüzuruna varıb yardım diləyində bulundular. Qızılbaşlardan qorunmaq üçün Osmanlı yönətiminə keçməyi rica etdilər. Bu xəbəri duyan Şah İsmayıl Qarabəy Ustaclu və Durmuş Xan adlı komutanlarını müzakirə üçün Kürd bəylərinin yanına göndərdi. Kürdlər Osmanlı ordusunun yardımı ilə savaşa girdilər. Qarabəy öldürüldü. Durmuşxan fərar etdi. Şah İsmayıl bu xəbəri duyduğunda qorxuya düşdü. Sultan Səlimin təkrar bu savaşı bəhanə edib geri dönməsindən çəkinirdi. Çünkü İsmayılın savaşacaq gücü və ruh halı qalmamışdı. İsmayılın karizmasını Çaldıran yenilgəsi yerləbir etmişdi. Böyük bir savaşa qatılacaq inancı qalmamışdı. Əskisindən fərqli olaraq Səlimə sayqı dolu bir məktub yazıb böyük hədiyələrlə göndərdi. Məktubunda Sultan Səlimi "Dinin bayraqdarı, müsəlmanların qoruyucusu, Tanrının dostu" olaraq xitab və barış əlini uzatmasını rica edirdi.[360] Qızılbaş dövlətini rəsmiyətə tanımaq istəməyən Sultan Səlim daha öncəki elçilər kimi İsmayılın bu dəfəki elçilərini də tutuqladıb həbs etdirdi. Ancaq Batıya doğru fəthlər fikrində olduğundan qızılbaşlara qarşı yenidən savaş açmaq fikrində deyildi. Şah İsmayılın yönətimində olan Diyarbəkir və Ərzincanı Yavuz

[360] "İsmayıl- Səlim yazışmaları" Parsadust 832-835.

Səlim öz torpaqlarına qataraq orada qızılbaşlara qarşı savunma xətti oluşdurdu.

Şah İsmayıl yalnız başına Osmanlıya bir şey edə bilməyəcəyini gördükdən sonra Avropadan yardım umma fikrinə düşdü. Xristian ölkələri ilə birləşib Osmanlıya qarşı müttəfiq cəbhə oluşdurma niyyətini yazdıqları və aldıqları məktublarda açıqca görmək mümkündür. Şah İsmayıl onlara, onlar da Şah İsmayıla Osmanlıya birlikdə saldırmağı təklif edirdilər.[361] Tacir adına bir çox venizli, qızılbaş ölkəsində Osmanlıya qarşı casusluq edirdi. Nədən Qərb tarixçilərinin Şah İsmayılı və qızılbaşları bu qədər öymüş, hətta Səfəvi dövlətinin quruluşunu "milli İran dövlətinin təşkili" kimi adlandırmışlar? Avropa Osmanlının Qərbə doğru yürüşünü önləmək üçün Şah İsmayılı göydəndüşmə fürsət kimi görürdü. O zamankı Avropanın durumunu göz önündə bulunduracaq olursaq, Çaldıran savaşında Osmanlı bu qədər itki verib məşğul olmasaydı, daha sonra Osmanlı sürəkli olaraq arxasında Səfəvi dövlətini bir təhdid olaraq görməsəydi, dünya tarixi tamam başqa və türklərin istəyi doğrultusunda yürüyəcəkdi.

Sultan Səlim Şah İsmayılı cəzalandırdıqdan sonra Şam və Misirə yönəldi. Başkəndi Qahirə olan Misiri Məmluklar yönətməkdə idi. Məmluklar dövləti indiki Sudan, Misir, Fələstin, İsrail, Suriyə, Ürdün və Livanı içərirdi. Çaldıran Savaşından qısa sürə sonraya qədər Osmanlı-Məmluklar ilişkiləri yaxşı idi. Səlim və Məmluk Sultanı bir-birinə hörmətli məktublar yazır, bir-

---

[361] Nəsrullah Fəlsəfi "Səfəvi devrində İranın dış politikası" s. 288-293.

birlərini İslamın qoruyucuları olaraq adlandırırdı. Məmluk sultanı məktubunda İstanbuldan ona gəmi düzəldən ustalar göndərməsini rica etdi. Səlim onun bu istəyinə olumlu cavab vermədi. Xristianlarla savaşa hazır olduğundan bu ustaların gəmi düzəltmə işində özünə lazım olacağını bildirdi.[362] İsmayılın Səlimlə barış girişimləri nəticəsiz qalınca Məmluklar sultanından barışa aracıolma istəyində bulundu. Şah İsmayılın məktubunu alan Məmluk sultanı Səlimə bir məktub yazaraq İsmayılla barışmasını rica etdi.[363] Səlim, Məmluk Sultanına yazdı ki, İsmayılla barışmaq fikri yoxdur. Sayqı dolu məktubunda yazdı ki, Sultan mənim atam qonumundadır. Mənim ondan xeyir dualar bəkləntilərim var. Ancaq Şah İsmayıl və mənim aramda aracılıq etməzsəniz, çox minnətdar olaram.[364]

Bu zaman ortalıqda nifaq çıxaran işlər dolaşırdı. İki sultan arasında savaş çıxarmaq istəyənlər var idi. Səlim Güney Avropaya saldırı hazırlıqlarında idi. İstanbulda Məmluk Sultanının Şah İsmayılla birləşib Osmanlıya saldırmaq istədiyi xəbəri dolaşırdı. Qahirədə də xəbər yayıldı ki, Hələb əmiri “Xeyir bəy” Surəyəni Misirdən ayırmaq üçün Səlimlə anlaşmışdır. Məmluk sultanı Xeyir bəyi Hələb əmirliyindən almaq istədi. Xeyir bəy Sultan Səlimdən Məmluk sultanını bu işindən vaz keçirməsini rica etdi. Bu olay Məmluklarla-Osmanlı ilişkilərini gərməyə başladı. Sultan Səlim başbaxan Sinan paşa

[362] Münşəat-üs səlatın 419-423.
[363] Eyni qaynaq 423-424.
[364] İsmayıl Haqqıuzun 2-cild, s. 301.

komutanlğında 40 minlik bir ordu Doğu Anadoluya yolladı və yenidən Şah İsmayıla saldırmaq istədiyini duyurdu. Qahirədə Məmluk sultanına bu ordunun Xeyir bəyə yardıma getdiyini anlatdılar. Bu zaman Anadoluda bir neçə Məmluk casusu yaxalandı. Onlar Məmluk sultanı ilə Şah İsmayılın Osmanlıya qarşı birlik cəbhəsi oluşdurduqlarını söylədilər. Bu şəkildə iki sünni dövlət qarşı-qarşıya gəlirdi. Səlimin 40 minlik ordusuna qarşılıq Məmluk sultanı 50 minlik ordu ilə Qahirədən Şama hərəkət etdi.[365] Məmluk sultanı Səlimə məktub yazaraq bu ordunu Osmanlı-Səfəvi arasında olası savaşı durdurmaq üçün göndərdiyini bildirdi. Bu zaman Səlim, Məmluk sultanına cavab yazmaq yerinə dövlətin güvənlik qurulunu toplayıb Məmluk-Səfəvi birliyinin təhlükələrini anlatdı. Osmanlı fəqihlərindən Misirə qarşı savaşmaq üçün izn aldı. Xeyir bəyə məktub yazaraq onun yardımına gələcəyini bildirdi. Səlim savaş elan edən məktublarını genəldə türkçə yazardı. Məmluk sultanına sərt bir məktub yazaraq onun casuslarının Anadoludakı təxribatlarını anlatdı və Məmlukla savaşacağını bildirdi.[366] 24 avqust 1516-cı ildə savaş başladı və Məmluk sultanı Qansu Qavri yenilərək fərar edərkən yolda öldü. Məmluk sultanının qardaşı oğlunun Qahirəni savunması da uğursuz oldu. Bu savaşda Sinan paşa öldürülsə də, Sultan Səlim 4 fevral 1517-ci

[365] Şahiner, Atilla (2008). “Sultan (I.) Selim (Yavuz)”, *Osmanlı Tarihi*, 107, Lacivert Yayıncılık.
[366] Rəhimzadə Səfəvi “Şah İsmayılın yaşamı və savaşları” s. 391-392.

ildə Qahirəyə girdi.[367] Səlim səkkiz ay Qahirədə qaldı. Daha sonra Misirin hakimliyini Xeyir bəyə buraxıb Qahirənin xəzinələrini və kitablarını götürüb İstanbula yola düşdü. Bu dönüşdə yüzlərcə sənətçi və bilim adamlarını da özüylə İstanbula gətirdi. Abbasilərin son xəlifəsi olaraq Misirdə bulunan Əlmütəvəkkili də İstanbula apardı. “Xilafət xələti”, “peyqəmbərin saqqalı”, “Xəttaboğlu Ömərin” qılıcı da gətirdiklərinin içində idi. Əlmütəvəkkil xilafəti Səlimə devr etdi. O gündən sonra Səlim “xəlifə” oldu. Ondan sonra gələn Osmanlı sultanları da xəlifə adlandılar. Sultan Səlim Batıya saldırı fikrindən vaz keçib Şah İsmayılı ortadan qaldıraraq İslam ölkələrini bir tək xilafət çatısı altında birləşdirmək istəyirdi. Ədirnədə bir toplantı düzənləmək üçün yola düşdü. Ancaq yolda xəstələnib 22 sentyabr 1520-ci ildə vəfat etdi. Çaldıran savaşından sonra Şah İsmayıl da artıq ölü kimi bir həyat yaşamış, əski həyəcanları və cahangüşalıq duyquları sönmüşdü. Ölkənin yönətimini Mirzəşah Hüseyn İsfahaniyə tapşırmış, özü də ruhdan düşmüş halını şarab içərək unutmağa çalışırdı. Şah Təhmasib sarayının tarixçısı Budaq Qəzvini yazır: Çaldıran savaşından sonra din xosrovu ölkənin önəmli sorunlarından xəbərsiz qalmış, ölkə işlərini vəkillərə və vəzirlərə buraxmışdı.[368] Əhməd Qumi yazır: Mirzəşah Hüseyn İsfahani Şah İsmayılı daha çox içki içməyə və sərxoşluqla gün

---

[367] Sakaoğlu, N. (1999), *Bu Mülkün Sultanları*. İstanbul, Oğlak Yayınları s.123.

[368] Budaq Qəzvini “Cəvahir-ul əxbar”dan nəqlən Parsadust s. 617.

keçirməyə təşviq edirdi. Öylə ki, ömrünün son on ilini bu şəkildə keçirdi. Cahangüşalıq, ölkələr fəth etmə xəyallarını əziz xatirindən uzaqlaşdırmışdı.[369] Çaldıran yenilgəsi Şah İsmayılı öyləsinə çökərtmişdi ki, qanlı düşməni olan öldürdüyü Şirvanşahın oğlu Şeyxşahla da dostluq ilişkiləri qurmaq istədi. Çünkü Şirvan Osmanlının himayəsi altında idi. Şirvan hakimi ilə dostluq ilişkiləri qurmaq üçün baş vəkili Mirzəşah Hüseyn İsfahani ilə dini işlərindən sorumlu Mircəmaləddin Məhəmmədi böyük hədiyələrlə Şirvan Şahın hüzuruna göndərdi. "Şeyxşahın xatirini Şahın əhd-peymanına inandırdılar."[370] Ayrıca, Şah İsmayıl öz qızını da onun oğlu ilə evləndirməyi təklif etmişdi. Çaldıran savaşına qədər sünni adı eşitdiyində ölümünü zəruri sayan Şah İsmayıl indi xanidan düşməni olan Şirvanşaha qızını göndərmək istəmişdi. Nədən əcəba? Çünkü Səlimin bir daha saldırması qarşısında Şirvanda sığınacaq bir yer aramağı düşünmüş olamalı idi. Sultan Səlim Misiri fəth etdikdən sonra zəfərlərini içərən geniş bir məktub Şirvanşaha yazmışdı. Məktubunda geri dönər-dönməz Şah İsmayılın işini bitirəcəyini də anlatmışdı. Bu gəlişmələri izləyən Şah İsmayıl təvazökaranə bir məktub yazıb Sultan Səlimin hüzuruna göndərdi. Məktubunda Sultan Səlimi övmüş və "Sizin istəyiniz nə olsa, mən onu yerinə yetirməyə hazıram"[371] söyləmişdi. Şah İsmayılın özünü Sultan Səlim qarşısında bu qədər aşağılamasına

[369] Əhməd Qumi "Xülasət-üt təvarix" 154.
[370] Qiyasəddin Xandəmir s. 557.
[371] İsmayıl Hakkıuzun 2-ci cild, 316.

baxmayaraq Sultan Səlim onun məktublarına cavab vermir, onu saymırdı. Səlimlə barışmaq üçün hər yolu denəməyə çalışan İsmayıl, hətta onun anasına da bir məktub yazdığı bilinməkdədir. Səlimin ölümündən və oğlu Süleymanın taxta çıxmasından sonra da Osmanlı qorxusu Şah İsmayılı tərk etməmişdi. Şah İsmayıl Çaldıran savaşından sonra Osmanlının təkrar saldırısından qorunmaq üçün özünə tələm-tələsik müttəfiq axtarmağa başladı. Ona görə də Hormuz limanını qarşılıqsız olaraq Portuqaliyaya buraxdı. Portuqaliya Səfəvi ordusunu modernizə etməli idi.[372] Gün keçdikçə daha çox içkiyə meyllənərək Şeybək Xanın başında şarab içməyə davam edirdi. "Çox şarab içib az yemək yemə böyük şahın iştahasını pozmuş və yemək qoxusu artıq onu əziyət etməyə başlamışdı."[373] Gündən günə zəifləşən şah İsmayıl 1524-cü ildə öldü. "1524-cü ildə qəddar rüzgarın ən qədim adətlərindən birinə tabe olaraq, o xosrovun və zəmanə keyqubadının həyatı sona yetdi."[374]

## Şah Təhmasib

---

[372] Ettelaate Siyasi- Eqtesadi, sayı 286, il- 1390 (2011) qış, s. 130.

[373] Əmir Xandəmir 120.

[374] Iskəndərbəy Türkmən "tarixi-Aləmaraye- Abbasi", təcümə edən Şahin Fazil, Şərq-Qərb Bakı 2010 s. 110.

23 may 1524-cü ildə Təhmasib taxta çıxdı.[375] Təhmasib dönəmi şüubiyənin Azərbaycanı tam olaraq işğaletmə sürəcidir. Şah İsmayıl zamanından əksik qalanları oğlu Təhmasib Lübnandan şiə şeyxlərini Təbrizə dolduraraq Azərbaycanın öz kimliyindən qopuşu yolunda yeni imkanlar ortaya qoydu. Bu dəfə təbərra təşkilatını Lübnandan gələn mollalar sürüsü yönətəcəkdilər. Təhmasibin şiələşdirmə politikası aşırı şəkildə davam etdikcə Azərbaycan bilim adamlarından boşalırdı. Onlar Osmanlıya və Türküstanda Übeydullah Xana sığınırdılar. 12 imam adına xalqa hər tür zülm edirdilər. Kimin bir az zəngin olduğunu bilsəydilər zənginliyini əlindən almaq üçün imamların saxta hədislərinə sığınırdılar. İmamlardan biri hansısa təbərra təşkilatının rəisinin yuxusuna girib və kimlərin zəngin olduğunu söyləyirdi. Bu, o demək idi ki, o adam ya qətl ediləcək, ya da varını yoxunu onlara buraxacaqdı.

Şah Təhmasibin ilk illəri zəfərlərlə keçdi. Özəlliklə Ubeydullah xananın Xorasana saldırılarını önləyə bildi. Təhmasib Xorasanda özbəkləri yenib uzaqlaşdırdı.[376] Sonra da Vana saldırıb oranı işğal etmək istədi. Tam bu sırada İraqdan xəbər gəldi ki, qardaşı Sam Mirzə ona qarşı baş qaldırmış. Van quşatmasını buraxıb

[375] Iskəndərbəy Türkmən “tarixi-Aləmaraye- Abbasi”, təcümə edən Şahin Fazil, Şərq-Qərb Bakı- 2010 s. 112.

[376] Şərəf Xan Bitlisi “Şərəfnamə” 2-ci cild, s. 176, Əsatir yayınları Tehran 1377 (h.ş).

qardaşını susdurmaq üçün geri döndü.[377] Sam Mirzə olayı yatışdırıldı. Sam Mirzə Şahın yanında xəcalətindən başını aşağı salıb gözlərindən peşmanlıq yaşı axıtmağa başladı.[378] Şah İsmayılın dörd oğlu olmuşdu: Təhmasib, Bəhram, Əlqas, Sam.[379] Evladlarının adı biri istisna olmaqla Şahnamədən çıxarılmış adlar idi. Təhmasib Firdovsinin "Şahnamə" əsərində xəyali İranın xəyali şahlarından biridir. Bəhram yenə də eyni əsərdə Sasani şahıdır. Sam da Şahnamədə Rüstəmin babasıdır. İsmayıl gələcəkdə Osmanlıdan intiqam almaq üçün oğlunun birinin adını qısas alan anlamında Əlqas qoymuşdu. Təhmasib Şirvanşah dövlətini tarixdən sildikdən sonra qardaşı Əlqası oranın hakimi təyin etdi. Əlqas qardaşına qarşı baş qaldırdı. Qanlı savaşlardan sonra yenildi. Bu qarşıdurmaların ayrıntılarını burda anlatmağa gərək duymuram. Bununla yetinirəm ki, Əlqas döyüşdə yaralandı. Kiçik dəstə ilə dağlarda gizlənə bildi. Özünü Şamxalın ölkəsinə çatdırdı. Ordan da İstanbula yola düşdü.[380] Əlqas Təhmasibi devirib özü şah olmaq üçün Osmanlıya sığınmışdı.

Səlimin ölümü ilə taxta çıxan Sultan Süleyman, Şah İsmayılla ilişkiləri normallaşdırıb Batıya uzanmaq istədi. Bu üzdən atası

---

[377] Eyni qaynaq 185.

[378] Iskəndərbəy Türkmən "tarixi-Aləmaraye- Abbasi", təcümə edən Şahin Fazil, Şərq-Qərb Bakı- 2010 s. 147.

[379] Eyni qaynaq s. 111.

[380] Oqtay Əfəndiyev "Azərbaycan Səfəvilər Dövləti" "Şərq-Qərb" yayını Bakı- 2007, s. 92.

zamanında tutuqlu olan Şah İsmayıl elçilərini sərbəst buraxdı. İsmayılın ölümündən sonra da Sultan Süleyman diqqətini Avropaya yönəltmişdi. Ancaq 1529-cu ildə Sultan Süleyman Viyananı quşatdığında Təhmasib arxadan Osmanlıya zərbə vurdu.

Sultan Sülyeman Avustriya səfərində ikən Şah Təhmasib Naxcıvanı və Vanı ələ keçirdi. Ayrıca, qatı uyqulamalarla şiə hakimiyətini də güclü bir şəkildə təsis etmiş, bölgəyə "xəlifə" adlı casuslar göndərmişdi.[381] Şirvan yenilgəsindən sonra İstanbula qaçmış olan Əlqas Mirzə, Osmanlı sultanına təlqin edirdi ki, Sultan Süleyman Təbrizi ələ keçirsə, qızılbaşlar Osmanlı tərəfinə keçər. Bu üzdən Sültan Süleyman Təbrizə doğru saldırı planladı. Ancaq Təbrizə girdiyində qızılbaşlar onu qarşılamadılar.[382] Digər tərəfdən bu zamanlar Beşinci Şarl Osmanlıya qarşı birlik cəbhəsi oluşdurmaq üçün neçə kərə Təhmasiblə müzakirəyə girdi.[383] Əlqas Mirzə sıx-sıx padşahı təhrik etdi. 1533-cü ildə İstanbulda anlaşma yapıldlığından dolayı Batıda durumu rahat görən Süleyman Azərbaycan üzərinə ikinci səfərinə çıxdı. Bu əsnada Bosna valisi olan Üləma Xan, İran xalqının durumunu yaxşı bildiyi üçün Ərzurum bəylərbəyiliyinə gətirilərək Əlqasa lala təyin edildi. Əlqas və Süleymanın orduları

---

[381] Eravcı, Mustafa (2002). Safevî Hanedanı. Yeni Türkiye Yayıncılık.

[382] Şərəf Xan Bitlisi "Şərəfnamə" 2-ci cild, s. 198, Əsatir yayınları Tehran 1377 (h.ş).

[383] Will Durant "Mədəniyət tarixi" 6-ci cild, s. 566 Farsca tərcüməsindən.

İstanbuldan hərəkət etdi. Bu gəlişmələrdən xəbərdar olan Təhmasib də ordusunu toparladı.[384] Öncə Vanı istəyən Süleyman Təbrizə girdi. 15 Avqustda Vana gələn Süleyman 24 Avqust 1548-ci ildə Vanı ələ keçirdi.[385]

Təhmasib Qars qalasını ələ keçirər və Ərzincana qədər irəlilər. Bu xəbəri Diyarbəkirdə duyan Sultan Süleyman vəzir Əhməd Paşanı böyük bir ordu ilə Təhmasibin üzərinə göndərdi. Əlqas Mirzəni də öz istəyi üzərinə İsfahana saldırmağa yolladı. Təhmasib geri çəkilərək Qarabağa getdi.[386] Bu savaşlar May 1555 Amasiya andlaşması ilə nəticələndi.[387] Osmanlının Bəsrə körfəzinə ulaşmasını sağlayan bu andlaşma 25 il barış üçün imkan sağladı. Sonrakı illərdə İngilis casuslarının yardımı ilə güclənən Şah Abbas Təbrizi, Həmədanı və Gürcüstanı geri alacaqdı. Bəluçistan bölgəsi yoxsul əyalət olduğu üçün qızılbaşlar oraya önəm vermədiklərindən sünni qaldılar.

Bütün bu tarixi dönəm incələndiyində Osmanlının və Səfəvilərin öz soylarına önəm vermədiklərinə tanıq oluruq. Nə Osmanlıdan, nə də Səfəvidən türk dilində bir tək kitab miras qalmamışdır. Sanki bu geniş ərazidə nə Osmanlı dövləti olmuş, nə də Səfəvi! Bütün tarix kitabları farsca yazılmış. Osmanlı və Səfəvi, sanki özlərini

---

[384] Sümer, Faruk (1992). Safevi Devletinin Kuruluşu ve Gelişmesinde Anadolu Türklerinin Rolü. TTK Yayıncılık.

[385] Oqtay Əfəndiyev "Azərbaycan Səfəvilər Dövləti" "Şərq-Qərb" yayını Bakı- 2007, s. 95.

[386] Eyni qaynaq.

[387] Eyni qaynaq s. 106.

fars dilli göstərmək üçün yarışmışlar. Bir tək fars olmayan İstanbulun göbəyində fars dili öyləsinə öyrənilirdi ki, Osmanlı sultanları bu dildə divan yazırdılar. Ana dilləri türkçə olan iki dövlət arasındakı andlaşmalar da fars dilində yazılıb imzalanmış. 35 illik Əmir Teymur dönəmi qədər Səfəvi və Osmanlı tarixindən türkçə mənəvi və dilsəl miras qalmamışdır. Əmir Teymurun türkçəyə verdiyi önəm dolayısıyla türkçəni övən Əlişir Nəvailər yetişdi. Osmanlı-Səfəvi tarixi tam bir çöllük. Sanki burada türkçə qonuşan millət yaşamamış. Dövlətdən asılı olmayan xalq folkloru olmasaydı, burada türklükdən əsər-əlamət qalardımı, əcəba? Hər iki tərəf milli qürurdan yoxsun, Tanrı yolundan sapmış. Quranda dillərin Tanrı iradəsinin ürünü olduğu bəlirtilir. Bu necə müsəlmanlıq? “600 illik Osmanlı dönəmində 2200 şairin adı ədəbiyat tarixində yer almışdır. İçlərində 12 sultanın və bir çox sultanzadələrin, o cümlədən Şahzadə Cəmin də adı keçər. Bunların əsas yazdıqları ədəbiyat fars dilində meydana gəlmişdir.”[388] Böylə qaranlıq bir tarixin ürünü olaraq günümüzdə də keçmişlə zehnlər arası ilişkilər qura bilməyən toplum gerçəkliyi ortaya çıxmışdır. Millət, yalnızca yaşayanları ilə var olan bir varlıq deyildir. Ölüləri ilə bir yerdə təşəkkül edər. Ancaq ölmüş olanların beyin ürünləri ana dildə mətnləşərək gələcəyə intiqal etmirsə, əski ilə beyinlər arası ilişkilər necə qurula bilər? Qurula bilməz. Asiyanın sahibi olan

[388] Will Dutant “Mədəniyət tarixi” (The Story of Civilization) 6-cı cild (Dini Reformlar), s. 801. (Farsca tərcünəsi).

türklər başqa dillər aracılığı ilə əski tarixləri ilə zehnlər arası ilişkilər qurmaq zorundadır. Bölgənin ən azınlıq millətlərinin dilləri olan erməniсə, gürcücə və farsca dolayısıyla özkeçmişini incələmək zorundadır. Almancanı, erməniсəni, gürcücəni onların klisələri yüksəltdi. Ərəbcə və farscanı da camilər qoruyub gəlişdirdi. Osmanlıda sünni və Səfəvidə şiə camilər türkçənin önünü tıxadı. Camirlər türkçənin qətl edildiyi məkanlara dönüşdü. Camiyə toplaşan adamlar şeyxlərin minbərdə nələr söylər olduqlarını anlamaz oldular. Anlamadıqları üçün onlara “idraksız türklər” deyildi. Adam ana dilində olmayanı necə anlaya bilər? Fars milliyətçiliyi 9-cu əsrdən oyanış sürəci yaşadığı üçün indiki İran, Tacikistan və Əfqanistan coğrafiyasında camilər farscanı yaşatdı, farscanı zənginləşdirdi və İslamiyətin irfanı ilə tanışdırdı. Türk dili çöllük qaldı, İslam irfanı ilə də tanışmadı. Dili Ərəbcələşdirmək, Osmanlıcalaşdırmaq İslam İrfanı ilə tanışmaq deyildir, bu, dili tarixdən silmə planı idi. Özəlliklə Səfəvi dövləti ilə fars dili imperatorluq dilinə dönüşdü. Fars dili Səfəviyəni öyləsinə əsir aldı ki, qısa sürədə şiənin dili farscaya dönüşdü. Minillik türk-İslam tarixindən bir tək fiqh kitabı, bilgi kitabı, tarix və fəlsəfə kitabı türk dilində miras qalmaz oldu. Osmanlı və Səfəviyədə bir tək Kaşqarlı, Yusif Xas Hacib, Əlişir Nəvai kimi şəxsiyət yetişmədi. Bu düşünsəl yenilgənin sonucu olaraq Əfqanistanda, Tacikistanda, özəlliklə də İranda türklər fars şüubiyə tarixinin xam materialı kimi qullanıldı. Modern dönəmdə bütün imkanlar türklərin əlindən çıxdı. Səfəviyə

coğrafiyasında türk dilinin içi tamamən boşaldıldı. Bayındırlı dönəminin ürünü olan Dədə Qorquddakı ərmişlik, ərənlik, alplıq, alpərənlik qavramları dilimizdən çıxarıldı. Bu qavramların dilimizdən dışlanışı ilə türk bireyləri kimliyini də itirərək fars dünyagörüşünün sürüngənlərinə dönüşdü. Türklük, sadəcə Səfəviyə və Osmanlı tərəfindən xam mal kimi savaşlarda qullanılmadı, Xomeyni kimi fars şiə irqçisi də türkləri bu şəkildə qullandı.

Osmanlılar Təbrizə girdikdən sonra başkənd Təhmasib zamanında Qəzvinə daşındı. Qəzvinin də dini yapısını dəyişdirməliydilər. Təbərra mollaları Qəzvində açıqca qətllərə və sünniləri aşağılamağa başladılar. Molla Heyrani Qumi təbərra dəstələrinin başında duran önəmli adlardan biri idi. Təhmasib zamanında o, Qəzvini şiələşdirməklə yükümlü idi. Bir çox şeirlər təbərra təşkilatını təhrik etmək üçün yazmışdı. Bu dördlük ona aiddir.[389]

Sünnilər qoyundur, qurddur şiələr
Taciklər və türklər fikrimi bilər.
Qəzvin sünnisinə min kərə nifrin
İstər yoxsul olsun, istərsə zəngin[390]

[389] Xülasət- üt təvarix s. 375.
[390] Eyni qaynaq: Çeviri Güntay.

## Mollalıq qurumunun ortaya çıxması

İslamın özündə “mollalıq” və ya “ruhaniyət” deyə bir qurum yoxdur, böylə bir anlayış da olmamışdır. İslamın təməl qaynaqlarında bu qavram bir qurumun təmsilçisi kimi mövcud olmamışdır. Mollalıq və ruhaniyət qurumları Səfəvilər dönəminin ürünüdür. Mollalıq Səfəvilər sonrası özünəməxsus inkişaf sürəcini yaşamışdır. İslam qaynaqlarında “ruhani” ruh dünyasına aidiyət anlamında olmuşdur. “Molla” isə, ərəbcə “dolu” deməkdir. Səfəvilər dönəmindən başlayaraq “ruhani” və daha sonra “molla” dini kitablar oxuyan adama söyləndi. Ruhani sırf şiəyə məxsusdur. Başqa heç bir İslam məzhəblərində olmamışdır. Səfəvilrin quruluşundan başlayaraq inkişaf sürəsincə Lübnandan axın edib gələn şiə uzmanları “ayətullah”lıq qurumunu da gəlişdirəcəkdilər. “Ayətullah”, yəni Allahın ayəti və nişanı. İslam fəlsəfəsində bütün varlıq üzvləri Allahın ayəti deməkdir. Ayət, yəni fenomen. Hər bir insan bir Allah ayətidir. Günəş, yer, ay, bütün var olanlar Allah ayətidir, hər biri bir fenomendir. Bütün bu fenomenlərin arxasında da tövhid durmaqdadır, yəni Allahın birliyi. Var olanlar bir olanın ayətləridir. Ancaq “ayətullahlıq” qurumu İslamiyəti öz inhisarına keçirərək, yalnız özünü Allahın ayəti olaraq göstərdi və qalanlar onlardan təqlid etməlidirlər. “Təqlid” də şiəyə məxsusdur, İslamda təqlid deyə bir şey

olmamışdır və yoxdur. Təqlid İslamiyətin ana ilkələri ilə tam olaraq ziddiyətdə olan bir durumdur. “Allah hər kəsə öz miqdarınca imkanlar vermişdir.”[391] Kimsə başqasının ağlını yönləndirməməlidir. Daha sonra iqtidarı paylaşan “ayətullahlıq” qurumu dönəmlərin siyasi iqtidarları ilə birləşib bir yerdə xalqı yağmalayacaqdılar. Bütün İslam tarixində, yalnız bir kişiyə “höccət-ül İslam” ləqəbi taxılmışdır. Bu ləqəb də heç bir rəsmi qurumu təmsil etməmişdir. Səlcuqlar dönəmində “Nizamiyə” mədrəsələrinin öyrətməni olan Qəzzaliyə bu ləqəb verilmişdi. Höccöt-ül İslam, yəni İslamın höccəti və dəlili. Qəzzalı İslam dünyasında yeni bir axım oluşdurduğundan dolayı bu fəxri ləqəb ona taxılmışdı. Peyqəmbərə belə,”ayətullah” deyilməmişdir. Hətta dörd sünni məzhəbinin qurucuları olan böyük şəxsiyətlər (Hənbəli, Hənəfi, Maliki, Şafei) də özlərinə belə ləqəbin taxılmasına izn verməmişlər. Səfəvilərdən sonra bu qurum əlində böyük sərmayələr barındırraraq öz kadrlarını, yəni “ayətullahları” təlim edib millətin başına dərd edəcək, insan düşüncəsinin önündə əngəl olacaqdı. Ayətullahlıq qurumu Səfəvilərdən sonra bir sinif halına gəldi. Bütün devrimlərə və dəyişimlərə rəğmən bu sinif özünü tarixi sürəc içində o qədər gücləndirib əlində sərmayə bulundurdu ki, dəyişmək bir yana dursun, hər gün bir az daha gücləndilər. Sünni alimlərinin bir çoxu bunu Allaha şərik qoşmaq anlamında açıqlarlar. Şah İsmayılın zamanından Lübnan şiəsi Azərbaycana axın

[391] 23-cü surə, 62-ci ayət.

etməyə başlamışdı. Azərbaycan yabancı və İslamiyətlə ilişkisi olmayan inanc tərəfindən işğal edildikcə, bayındırlı İslam mədəniyətinin də kökünü kəsirdilər. Ancaq Təhmasib dönəmində bu axın daha da gücləndi. Lübnandan gələn şiə “alim”lər öz ölkələrində dəyərsiz insanlar idilər. Onlar fiqh kitabı olmayan ələviləri şiə teorisi ilə tarixdən siləcək və ələvi-qızılbaşların qurduğu dövlətin fiqh kitabını yazaraq həm ələvi türkləri Səfəvi dövlətindən uzaqlaşdırcaq, həm də Səfəvi dövləti üçün şiənin siyasi fiqhini oluşduraraq dövləti ələ keçirəcəkdilər. Ələvi-bəktaşi təriqətinin fiqh kitabları olamamışdı. İlk dəfə olaraq siyasi təcrübə yaşamaqdaydı. Əskidən də dövlət yönətimi ilə bağlı fiqh kitabları yazmamışdılar. Fiqh, yəni İslam hüquq sistemi. Sünni fiqhinin dörd məzhəbi qaynağı olmuşdur. Şiə fiqhi isə, İslamı daha fərqli alqılamışdır. Şiə fiqhinin oluşumunda şüubiyənin böyük rolu olmuşdur. Öylə ki, Səfəvi dönəmində yazılan fiqh kitabları farsları qutsar, ulular biçimdə yazılmışdır. Lübnandan gələn şiə axını fiqh görüşlərini teorizə etdikcə Səfəvi dövləti onun hızına görə farslaşmaqda idi. O qədər hızla irəlilədilər ki, qısa sürədə qızılbaşlıq da ibtal edildi. Qızılbaşlar aşağılanaraq şahsevənləşdirildilər. İsfahan fiqh məktəbi, sünni məktəbinə qarşı olqunlaşma sürəcini bitirdiyində artıq qızılbaşlardan əsər-əlamət qalmamışdı. Dövlətin qurucularının əlindən dövlət çıxarılmış və qızılbaşlar kəndlərdə çobanlıqla məşğul olmağa məhkum edilmişdilər. Daha sonrakı sürəcdə erməni-fars birliyi İsfahanda iqtidarı ələ keçirəcək və Azərbaycan

şəhərlərində Səfəvilərdən bir tək mədəni miras qalmazkən fars şəhərləri başda başkənd İsfahan olmaq üzrə hızla abadlaşdırılacaqdı. Sünni və şiə fiqhi üzərinə irəlidə bilgi veriləcəkdir.

Lübnanın dağlıq bölgələri günümüzdə olduğu kimi əski çağlarda da "qüllati-şiə", yəni şiə ifratçılarının yuvası idi. Ancaq onlar imperatorluğa yüksəlmə fürsətlərini heç bir zaman ələ keçirməmişdilər. Qızılbaş imperatorluğu qurular-qurulmaz Təbrizə, daha sonra Qəzvinə və İsfahana axın etdilər. Şam, hənbəli** məzhəbinin fiqhi ilə yönətilmişdi. Hənbəli məzhəbi sünniliyin ən aşırı ucunda ikən Hənəfilik ılımlı ucundadır. Lübnan aşırı şiə tərəfdarları da Hənbəli yönətiminin altında olmuşlar. Səlib yürüşlərində "qüllati-şiə" xristianlarla işbirliyi yapmaqla suçlanıb basqı və işkəncə altına alındılar. Bir çox tutuqluları edam edildi. Hənbəli fəqihlər işraq fəlsəfəsinin qurucusu Şəhabəddin Söhrəvərdini şiə ilə işbirliyi yapmaqla suçlayıb ölümə məhkum etdilər. Ancaq Söhrəvərdi nə şiə idi, nə də

** Hənbəli məzhəbinin qurucusu Hənbəl olmuşdur. Onun Saleh adında bir oğlu olmuş. Saleh İsfahanda bir il yarqıc olaraq çalışmış. Bir gün İmam Hənbəlin evində çörək bişirmişdilər. İmam Hənbəl "Bu çörəyi hardan gətirmişsiniz?" deyə sormuş. Ona "İsfahanda yarqıc olaraq çalışan oğlun Saleh göndərmiş" cavabını vermişlər. İmam Hənbəl "O çörək məzlumların istismarından əldə edilmişdir, halal deyildir, onu mənim evimdən uzaqlaşdırın!" söyləyir. Çörəyi uzaqlaşdırırlar. İmam Hənbəl "Nə etdiniz, çörəyi hara atdınız?" sorduğunda ona "çörəyi Diclə çayına atdıq" cavabını verirlər. İmam Hənbəl ömrünün sonuna qədər Diclə çayının balıqlarından yemir.

hənbəli. Özünəməxsus İslam alqılayışı var idi. Ona görə qaranlığın ışığa qarşı sevgisi vardır. Qaranlıq ışığa yaxınlaşdıqca qaranlıqlığı azalar, ışığa qovuşduğunda qaranlıq yox olar. Bu qonuda işraqiyə filosofu Quranı dəlil olaraq göstərmişdir. Söhrəvərdidə işraq, əqli ışıqların parlaması və axışı anlamındadır. Söhrəvərdinin iki ünlü əsəri olmuşdur: "Hikmət-ül işraq" (Işıq hikməti) və "Həyakil-un nur" (Işıq heykəlləri). Əşəri məzhəbinə görə Allah o dünyada möminlərin gözünə görünə bilər. Mötəzilə məzhəbinə görə Allah nə o dünyada, nə də bu dünyada görünər. Söhrəvərdi deyirdi ki, mənəvi təmizlənmə ilə bu dünyada da Allahı görmək mümkündür. Ancaq bu görüş maddi deyil, mənəvi yolla mümkün olur. Söhrəvərdi gerçəyi ışıq və qaranlıq tiplərinə görə böylə bulmuşdur:

- Əgər ışıq öz-özünə varsa, bu nur cövhəridir.
- Əgər ışıq cismani olmayan ışıqsa, soyut (mücərrəd) nur adını alır.
- Əgər ışıq öz varlığının dışında başqa bir varlıqdan asılı isə, ərəzidir.
- Zülmət (ışığın yoxluğu) öz-özünə varsa, buna qaranlıq deyilər.
- Zülmət öz varlığının dışında başqasına bağlı isə, buna form deyilər.

Söhrəvərdiyə görə bir varlıq ya özü haqda xəbərdardır, ya da deyildir. Əgər özü haqda bilgi sahibi isə, qeyri-cismani ışıqdır, Allahdır, ideyadır və insan ruhudur. Bir şey öz-özünə vaqif olmaq üçün özündən başqa bir şeyə möhtac isə, ərəzi ışıqdır. İşraq fəlsəfəsinin böyük düşünürü Söhrəvərdiyə görə kəşf və sezgi yolu

ilə ilahi gerçəklərə ərişmək tək yoldur. Kəşf və sezgi ilə gerçəklərə ulaşanlar isə, ancaq nəfslərini və könüllərini yaxşıca təmizləmiş seçkin kimsələrdir. İşraq fəlsəfəsinə görə zaman hərəkətin miqdarıdır. Zamanın başlanqıcı və sonu yoxdur. Çünkü zaman üçün başlanqıc düşündüyümüzdə bu başlanqıcdan öncə içində zaman olmayan bir zamanın varlığını qəbul etmək gərəkir. Bu düşüncə isə,, ziddiyətlidir. Çünkü öncəlik zamanla ilgilidir. O halda zaman həm əzəlidir, həm də əbədidir. İndiki ana görə, öncəlik və sonralıq etibaridir. Bədənin arzuları ilahi gerçəklərə ulaşmağı əngəllər. İnsan bədən qaranlığından qurtulmalıdır. Bunun üçün bir yandan riyazətə, digər yandan ibadətə önəm verilməlidir. Allahda baqi olmaq istəyənlər oruclarına və namazlarına diqqət etməlidirlər. Mənəvi yola girənlər az yeyər, az qonuşar, az yatar. Söhrəvərdi vəhdəti-vücuda qarşı idi. Çünkü ona görə birləşmə və ayrılma cism özəlliyidir və Tanrı cism deyil. Fəna halı mənəvi zövq olsa da ittihad (birləşmə) sayılmaz. Hərəkətin qaynağı ışıqdır. Varlıqlarına işraqların gəlməsi ilə fələklərin hərəkəti davam edər. Təhriklər işraqları hazırlar. İşraqlar da hərəkətə səbəb olar. Söhrəvərdi nə bir kəlamcı, nə də bir fəqihdir. O, Yunan və Şərq düşüncəsini işraqilikdə birləşdirən bir filosofdur. Onun fəlsəfəsində islamiyətin və İslam təsəvvüfünün geniş etkisi vardır. Təsəlsül, hər səbəb üçün sonsuz dərəcədə səbəblər aramaqdırsa, bu, bizi çıxmaza soxar. Nəticə olaraq Tanrının, vacib-ul vücudun varlığını qəbul etmək gərəkir. Əhatə edən cisimlə əhatə edilən cismin təmas etdikləri

içüzey (iç səth) məkandır. Böyləcə məkan varlığın özünü açıqladığı yer kimi ortaya çıxar.[392] İşraq fəlsəfəsinin qurucusu əski Yunan fələsəfəsinə çox dəyər verirdi. Həm Farabi, həm İbni-Sina, həm Söhrəvərdi, əslində Mötəzilə məzhəbinin ussallaşdırma (rasionalizə etmə) sürəcində ərəbcəyə tərcümə etdikləri Yunan fəlsəfəsinin təsiri nəticəsində yetişmişdilər. Azərbaycanın Zəngan şəhərində dünyaya gəlib Marağada təhsil alan Söhrəvərdi ölümə məhkum edildiyində ölüm şəklinin seçməsini özünə buraxırlar. Söhrəvərdi rica edir ki, onu aclıqdan öldürsünlər. Mə´dəsi tam boşaldığında içinin Tanrı ışığı ilə dolacağına inanırdı. Söhrəvərdinin dünyagörüşü sezgiçilik üzərində idi.

Hənbəli məzhəbinə mənsub olan Səlahəddin Əyyubi qüllati-şiəni çox basqı altında tutduğundan, şiə əhli Səlahəddin Əyyubiyə **şeytan** deyirdilər. Moğolların Şama saldırısında hənbəli fəqihlər xalqı Moğollara qarşı təşkilatlandırırkən şiəyə qarşı yenə də basqı uyquladılar. Şiənin Moğollarla işbirliyi yapmasından çəkinirdilər. Şiə üzərinə Hənbəli fəqihlərin basqısı üzündən şiələr Lübnanın dağlarında yaşamaq zorunda qalmışdılar.

Məmluklar dönəmində də şiə-sünni qarşıdurmaları davam etmişdi. Siyasi iqtidar hənbəlilərdən yana olduğundan şiələri incidib öldürmələri üçün imkanları var idi. Təbərra fikrini açıqca söyləyən şiə dərhal öldürülür, bir

[392] Prof. Dr. İbrahim Agah Çubukçu “Türk-İslam Düçüncesi Hakkında Araştırmalar” Kültür bakanlığı yayınları, s 176-177.

çox hallarda da yaxılırdı.[393] Məmluklar Maliki olduğundan kimsə ilə aşırı davranmazdılar, ancaq hənbəlilər başqa inanışlara aşırı dərəcədə sərt davranardılar. Məmluklar dönəmində Lübnanın dağlarına sığınmış şiələr öz teorilərini üzdə olmasa da, arxada oluşdurmağa çalışmış və sünni qarşıtı teorilərinin həyata keçməsi üçün uyqun tarixi ortam axtarırdılar. Şam ölkəsi Osmanlı tərəfindən işğal edildikdən sonra da şiə qüllatının qorxuları ortadan qalxmadı. Səfəvi dövlətinin quruluşu və dövlətin kəndisinin onları İrana dəvət etməsi üzərinə şiə qüllatı üçün göydəndüşəmə fürsət ortaya çıxdı. Səfəvi öncəsi Azərbaycanda şiə fiqhinə rast gəlmirik. Səfəvilər öncəsi tarixə baxdığımızda şiə fəqihlərin içində bir tək türk adına rast gəlmirik. Qum şəhərindəki şiə isə, Yəmən ölkəsinin Ərəb qəbilələri idi. Səlcuq-türk imperatorluğu dönəmində "Nizamiyə" mədrəsəsi sünni görüşünə görə kadr yetişdirirdi. Farabi, İbni-Sina kimi türk kökənli İslam alimləri şiə inanış şəklini qəbul etməmişlər. Həsən Rumlu Səfəvi dövlətinin təşkili zamanı şiənin təlif etdiyi bir tək kitabın bilə, olmadığını söyləyir. Ölkədə şiə ədəbiyatı ilə tanış olan xalq yox idi.

O zaman "haq məzhəbi!" olan şiə məzhəbi ilə bağlı toplumun bilgisi yox idi. Çünkü imamiyə kitabları haqqında heç bir bilgi mövcud deyildi. Ancaq gün keçdikcə şiə məzhəbinin günəşi parlar oldu və isna-əşəri məzhəbinə keçildi.[394] Bunun anlamı budur ki, əsası Anadoluda

---

[393] İbni- Kesir, Əlbidayət və əlnəhayət, 7-ci cild 676 və 740-741.

[394] Həsən Rumlu "Əhsən-üt təvarix" 12-ci cild, s. 61.

Bədrəddin tərəfindən qoyulmuş olan bu məzhəb həm Qaraqoyunlu, həm də Bayındırlı dönəmində Azərbaycanda tanınmış bir cərəyan olmamışdı. Lübnandan Təhmasib dönəmində Azərbaycana axın edən şiə qüllatının ideoloqları inanılmaz yüksək gəlirləri ilə şiə məzhəbini teorizə etmək üçün qızılbaşlar arasında yerləşdiriləərək, onları həm iqtidardan uzaqlaşdıracaq, həm də türk qızılbaşlığı tarixdən silərək fars-şüubi məzhəbinin əsaslarını sərt bir şəklildə toplumun tarixinə mıxlayaraq, Azərbaycanı İrançı şiə kimliyinin içində yox edərək, Bayındırlı mədəniyətinin izini tarixdən tam olaraq siləcəkdilər. Türklərdən alınan xums, sədəqə, nəzir və zəkat kimi şiə üsulu vergiləndirmə yolu ilə tarixdə ruhani-molla adında feodal bir sinif doğdu. Bu sinifin gücü ilə siyasi iqtidarlar da hesablaşmaq zorunda qaldı. Bu feodal molla-ruhani sinifinin əsas gəliri yoxsul millətdən təmin olunurdu. Təbərra qılıclıları qoyun sürüsü kimi xalqı camilərə doldururdu. Minbərdəki molla Kərbəla əhvalatını anladıb xalqı ağlamağa zorlayırdı. Xalqı ağladaraq cebini boşaldırdılar. Bu baxımdan indiki Azərbaycanla 500 il öncəki Azərbaycanda heç bir gəlişmə olmamışdır. Sadəcə sürüləşən xalq daha çox ruhanilərin zülmünə məruz qalmışdır. 500 illik zaman içində hər il özəl diqqətlə düzənlənən məhərrəmlik törənləri sırasında aqressivləşən kütlə tarixi gerçəklərin bilincəində olmadan özünə qarşı da sərt şəkildə davranmağa başladı. İslamiyətlə ilgisi olmayan başyarmaq, sinə və zincir vuramaq kimi törənləri Səfəviyə xalqın tarixinə miras buraxdı. Zaman keçdikcə təcrübə

qazanan ağladıcı “din” adamları əllərindəki inanılmaz sərmayəyə güvənərək “mollalıq” qurumunu təşkil etdilər. Şəhərlərdə molla yetişdirmə qurumları, kursları təsis edildi. Zəhmət çəkmədən xalqa yalanlar və mərsiyələr söyləyərək sərmayə qazanma qurumu idi bu. Ədalətdən yana olan Hz. Məhəmmədin dini bir ovuç əyyaş, feodal molla əlində oyuncağa döndü. Din, sadəcə camilərdə qoyun sürüsü kimi toplaşıb ağlama səviyəsinə endirgəndi. Məscidddə ağlamaq, mərsiyə və yas şüubiyə şirkidir. Məscid səcdə yeridir yalnız və bir də peyqəmbərin dönəmindəki kimi ortaq düşüncəyə varma məkanıdır. Sinə və zincir vurma kimi şüubiyə şirki Hz. peyqəmbərin dönəmində olmamışdır. Lübnandan gələn mollalar görüşlərini qurumsallaşdırmaq üçün ilk vaxtlarda qızılbaşların qılıclarına ehtiyacları var idi. Onların fətvalarını qızılbaş qılıcı həyata keçirirdi. Ölkə başqa inanclardan tam olaraq bu fətvalar üzərinə qızılbaş qılıcı ilə təmizlənməli idi. Təmizlik tamamlandıqdan sonra sıra qızılbaşların özünə gəldi. Dövlətin qurucusu olan qızılbaşlar “türk” adlandırılaraq tam olaraq iqtidardan uzaqlaşdırıldılar. Yalnız savaş zamanı qızılbaşların könlünü oxşayıb savaşa, “İslam” yolunda cihada göndərib öldürdürdülər.

Lübnandan gələn dəstənin başında ən ünlülərindən biri Şeyx **Kərəki** idi. Kərəkini Şah İsmayıl özü Təbrizə gətirtdi. Şah İsmayılın ölümündən sonra Təhmasibin yanında böyük sayqısı olan Kərəki ölkənin dini işlərdən sorumlu olan qurumun başına keçdi. Bir sözlə ölkənin gerçək padşahı o oldu. Bütün molla rəqiblərini

amansızca ortadan qaldıran Kərəki özünə "xatəm-ul müctəhidin" ləqəbini taxdı. Yəni müctəhidlərin sonu. Xatəm-ul ənbiya peyqəmbərliyin sonu olduğu kimi o da müctəhidliyin son bulduğunu duyurdu. Səfəvi dövlətinin dini qurumunun başına keçmək üçün bu yabancı mollalar bir-birinə tuzaq qurur, bir-birini sıradan çxarıb ya ölümə, ya da sürgünə göndərirdilər. Bunu İskəndər bəy Türkmənin kitabından anladalım:

Əmir Qəvaməddin Hüseynin vəfatından sonra üləmalar əllaməsi Əmir Qiyasəddin Mənsur Şirazi, Əmir Ne´mətullah Helli ilə birlikdə sədarətə şərik oldular. Mir Ne´mətullah xatəmül-müctəhedin (Kərəki) Əli Əbdüləla ilə düşmənçiliyinə və xatəmül-müctəhedinin düşməni olan şeyx İbrahim Qətifi ilə dostluğuna görə sədarət vəzifəsindən çıxarıldı və Helləyə getdi. Əllamətül-üləma bundan sonra sədrliyi tək idarə etməyə başladı. Amma onunla xatəmül-müctəhedinin arası pozuldu. Mir onu dinsizlikdə, o isə mirzəni etinasızlıqda təqsirləndirdi. Bir gün şahın hüzurunda onların arasında elmi bir mübahisə düşdü və savaşla nəticələndi. Həmin savaş get-gedə möhkəm söyüşə çevrildi. Həzrət şah xatəmül-müctəhidinin (Kərəkinin) tərəfini tutdu və mirzə sədarətdən azad edildi. O, həmin bir neçə gündə icazə almadan Şiraza getdi. Sədarət mənsəbi isə müctəhid Mir Müizzəddin Məhəmməd İsfahaniyə verildi.[395]

---

[395] İskəndər bəy Türkmən "Tarixe-Ələmaraye-Abbasi", çevirən Şahin Fazil, "Şərq-Qərb" Bakı-2010, s.272.

Kərəki ölkənin əsas söz sahibi olaraq istədiyi adamı dini qurumun başına, digər baxanlığa və ordu komutanlığına gətirməkdə “mənəvi” səlahiyət sahibi olmuşdu. Şah İsmayıl ortaya çıxdığı andan qızılbaşlar qeybə çəkilmiş olan 12-ci imamın naibliyi haqqında heç bir şey bilmirdilər. Naib-ul imam, yəni imamın xəlifəsi, qeybə çəkilmiş imamın işlərini bu dünyada yürüdən adam. Qızılbaşların bu haqda bilgisi yox idi. Onlar İsmayıla vəliullah kimi inanıb ətrafına toplaşmışdılar. Ancaq indi Kərəki qızılbaşları bir də “naib-ul imam”lıq qurumu ilə tanış edirdi. Yəni qeybə çəkilmiş olan imamın vəkili ilə tanış etməkdə idi. Kərəki özünü naib-ul imam olaraq təqdim etdi. O gündən bəri də bu ifadə qullanılmağa başlandı. Xomeyni də özünü naib-ul imam adlandırırdı. Gənc və cahil Təhmasib üçün Kərəki özünü qeybə çəkilmiş imamın nümayəndəsi kimi qəbul etdirdikdən sonra ölkənin gerçək sahibi o və onun qurumu olmuşdu. Əlinin altında çalışan şeyxlər. Təhmasib çox gənc idi. On yaşında səltənətə çıxmışdı. Onu tərbiyə edən də bu dini qurumlar idi. Təhmasib bu dini qurumdan həm də qorxmaqda idi. Çünkü həm bu dünyanın zənginliyinə sahib olaraq feodallaşmış, həm də o dünyanın sahibləri olmuşdular.

Şeyx Kərəki və Lübnandan gələn çevrəsi yeniyetmə Təhmasibə və qızılbaşlara anlatdılar ki, gerçək səltənət qeyblərə çəkilmiş olan imam Mehdinindir. Padşah öz səltənətinin məşruiyətini Mehdi gələnə qədər ondan almalıdır. Kərəkinin öyrətilərinə görə Mehdidən məşruiyət alınmazsa, o səltənət batil sayılar. Kərəki və

çevrəsi bu inancı qızılbaşlara və yeniyetmə Təhmasibə qəbul etdirdi. Şah İsmayıl isə, Mehdinin özü idi. Böylə inanılırdı. Təhmasib səltənətinin məşruiyətini birbaşa Mehdidən ala bilmədiyi üçün onun naibindən, yəni vəkilindən almalı oldu. Bu üzdən də Səfəviyətə məşruluq verən Mehdinin naibləri idi. Böyləcə türk tarixində ilk kəz olaraq sultan səltənət məşruiyətini şeyxdən alası oldu.* Əsası

---

* 1992-ci ildə prezident seçilən Ə. Elçibəy ölkəsinin sekular anyasası olmasına, anayasaya and içməsi gərəkməsinə rəğmən, bunun dışında bir də şeyxin önündə əyilərək onun əlindəki Quranı öpdü. İqtidarının məşruluğunu (legetimliyini) xalqdan aldığını yetərli bilməyib bir də mollalıq qurumundan legetimlik istər oldu. Bu, prezindetin öz ölkəsində mollalıq qurumunun yenidən dirilməsi üçün imkan sağlaması idi. İrançı kimliyin Azərbaycan ölkəsində baş qaldırmasına tarixi dəstəkdən başqa bir anlam daşımamışdır. Laik anayasası olan bir ölkənin cümhurbaşqanı Qurana and içməz, ana yasaya and içməsi yetər. Milli siyasətin Quranı o ölkənin anayasasıdır. Qurana and içəcək olsa da, Quranı əlində tutan adamın mollalıq paltarı geyinməsinə gərək olmamalı idi. Ölkənin milli-dini dəyərlərinin təmsilçisi olan ağsaqqal bir kişi, ya da ağbirçək qadın da Quranı məclisin kürsüsünə çıxara bilərdi. Çünkü İslamda mollalıq adında bir qurum və bu paltar olmamışdır. Azərbaycanda Səfəviyət və İrançı molla kimliyi bu şəkildə yasallaşmışdır. İslam tarixində, yalnız Səlcuqlar dönəmində bir tək adama, Qəzzaliyə fəxri höccət-ül islamlıq adı verilmişdi. Onun da yasal bir yönü olmamışdır. İslamda əsla “ruhaniyət” adında bir qurum olmamışdır. Elçibəy, Səfəvi mollalıq qurumunun bu yolla Azərbaycanda dirilib çağdaşlaşmanın önündə əngəl olmasına yaşıl ışıq yaxmışdır. İşin çox maraqlı yanı budur ki, mollalıq qurumu Bütöv Azərbaycan düşüncəsinə

Təhmasib Səfəvi tərəfindən qoyulan bu sürəc günümüzə qədər davam etmişdir. Böylə bir inanc şəkilləndi ki, imamın vəkili olan mərcə´in razılığı olmadan səltənət məşru və halal sayılmaz. Bu, 20-ci əsrdə Xomeyninin "vilayəti-fəqih" olaraq tanımlayıb dövlətin yönətim şəklinə gətirdiyi anlayışın ilkin ortaya çıxış şəkli olmuşdur. Yəni şiə şəriəti bütün durumlarda siyasəti öz gözətimi altında saxlamalı idi. Qızılbaş dövləti bu şəkildə mollalarla paylaşıldı. İlk zamanlarda Səfəvi aristokrasisi dörd mərhələdən oluşmaqda idi: Saray, ordu, mollalar, xalq. Daha sonrakı dönəmdə Saray və mollalar eyni statusa sahib oldular. Hətta saray məşruiyətini Mehdinin təmsilçisi olan mollalıq qurumundan aldığından dolayı, mollalıq qurumu birinci statusu yüksəldi. Mollalıq qurumu Mehdi adına xalqın malına, namusuna hakim oldu. İstədikləri zaman xoşlandıqları qadını ərlərinə haram edə bilirdilər və əri qadına yaxınlaşsaydı zina adına öldürülürdü. Bunun örnəklərinə günümüz Xomeyni səfəviliyində də tanıq olmaqdayıq. Bu çirkin əməllərinə bəraət qazandırmaq üçün peyqəmbərin öz oğulluğu olan Zeydin qadını Zeynəbdən xoşlandıqdan sonra onu boşatdırıb və Zeynəblə evlənməsini örnək göstərərlər. Sanki bunlar da peyqəmbərmişlər! İslam dininin qurucusu böylə etmişsə, İslamın qoruyucuları da böylə etməlidir

---

qarşı da dərin tarixi təcrübəyə sahibdir. Önəmli olan budur ki, Quran and içmək üçün deyildir, oxumaq üçündür. Nə Quranda, nə də hədisdə siyasət qurumu başçılarının Qurana and içməsi gərəkdiyi ilə bağlı bilgi yoxdur.

görüşünü yayqınlaşdırmışlar. Quranda “sözləri dinləyib və ən yaxşısını seçərək onu qəbul edənlər Tanrı tərəfindən hidayətə ərmiş olanlardır, bunlar ağıllı adamlardır”[396] söylənməkdədir. İslam tarixində qurumsallaşan mollalıq qurumu quranın bu hökmünə qarşı çıxaraq özlərini naib-ul imam sandıqlarından dolayı xalqa dinlədikdən sonra seçmə və ağlını qullanma haqqını tanımamışdır. Onların dediklərinə əməl edilməli idi. Təqlid kültürü bu şəkildə oluşdu. Xalqı təqlidə zorlamışlar, təqlid etməyənlərin də təbərrayan tərəfindən başı kəsilmişdir. Şiə şüubiyə kölələr yetişdirmək üçün qızılbaş gücünü qullanmışdır. Qızılbaşlar mollaların dillərini bilmədikləri üçün nələrin olub bitdiyindən xəbərsiz qalmışdılar. Çünkü qızılbaşların farscası yox idi. Günümüzdə yayqın olan “mirzə”[*] sözü də qızılbaş mirasıdır. Qızılbaşlar fars dilini bilib dəftərdar işləyənlərə və ya din bilgisi olanlara mirzə deyirdilər. “Mirzə” sözünün iki anlamı olmuşdur. “Mir” və “zadə” sözlərinin birləşərək oluşdurduqları “mirzə” seyd soyundan olma mənasındadır. “Mir”, yəni seyid, yəni peyqəmbər soyundan! “Mirzadə” asanlaşdırılaraq “mirzə” olmuşdur. Peyqəmbərin oğlu olmazkən soyunu ona bağlayan bir sürü adam ortaya çıxdı Səfəvilərdən günümüzə. Oğlu olsaydı nələr olardı? Oğlu olsaydı, İslam yox olardı və günümüz şiəsində olduğu kimi İslam tam olaraq

---

[396] Quran 39-cu surə (Zümər surəsi) 18-ci ayət.

[*] Azərbaycanda dilin ahəng qanununa uyqunlaşdırılaraq “mirzə” tələffüz edirlər, ancaq sözün kökü “Mirza”dır.

irqçi bir dinə dönüşərdi. Peyqəmbərin soyu olmaz. Peyqəmbər soyundan olmanın heç bir üstünlüyü yoxdur və heç bir imamın həyatı müsəlmanlar üçün örnək olamaz. İmam Hüseynin oğlu Zeynəlabidin Yəzidə biət etdi. İmam Rza da Abbasilərin Xorasandakı vəliəhdi idi. Allah peyqəmbərə vəhy göndərmiş və vəhyin ürünü olan Quran müsəlmanların hidayət kitabıdır, peyqəmbərin soyu deyil. “Mirzə” sözünün ikinci anlamı “Əmir” və “zadə”dən törəmişdir. “Əmirzadə” asanlaşaraq “mirzə” tələffüz edilmişdir, yəni əmir və hökmdar soyundan olan. İsimdən sonra gəldiyində şahzadə anlamında olmuşdur: “İsmayıl Mirzə” kimi. İsimdən öncə gəldiyində seyid anlamında qullanılmışdır. Qızılbaşlar İrani kimliyin memarlığı ilə məşğul olan iki mirzə anlayışının əlində asanca qullanılan vasitəyə dönüşmüşdülər. Çünkü dillərini bilmir və onların nələr planladıqlarından xəbərsiz idilər. Kor bir inanışın bağnaz (fanatik) savaşçılarıydılar yalnız. Qızılbaşlar, sadəcə düşünmədən və sormadan təqlid etməliydilər. Onlar savaşlarda qullanılan materiala dönüşdürülmüşdülər. Yeni mollalıq qurumu düşüncəni qapadır, yasaqlayır və mütləq təqlid kültürünü dövlətin əzici gücü ilə ölkədə yayqınlaşdırırdı. Düşüncəsi qapadılmış sürülərin bir mollanın əmri ilə başyarmaları, sinə vurmaları, sürülər biçimində ağlaşmaları və nədən ağlaşdıqlarını sormamaları normal olacaqdı. Şüubiyə şəriəti üzərinə təsis edilən Səfəvi dövlətinin onun qurucusu olan qızılbaşların əlindən bu qədər asanca çıxmasının macərası budur.

Səfəvilərlə Avropanın ilişkisi çox yaxşı idi. Rözəxanlıqdan sorumlu Səfəvi vəziri Doğu Avropa ölkələrinə göndərilir. Onların dini mərasimlərinə qatılıb incələmələrdə bulunur. Həvarilər və xristianlıq tarixində şəhid olanlarla ilgili keçirilən yas törənlərini olduğu kimi gətirib şiə yas mərasimlərində tətbiq edirlər. Camilərdə kollektiv növhə törənləri, aşura şəbihçiliyi, oyunları və ağlaşmaları kimi törənlər tamamən xristianlardan alınmışdır.[397] Şiə-fars şəriəti üzərinə qurulan Səfəvilərin dövlət budcəsi Kərəki kimi naib-ul imamların əlində idi. İstədikləri hökmü çıxarıb, istədikləri fərqli məzhəbi düşüncəni yerindəcə boğa bilirdilər. Bu qorxunc tətbiqat üzündən Səfəvilərdən öncə əhalisinin tam əksəriyəti sünni olan Azərbaycanda bir tək sünni qalmadı, hamısının kökünü qazdılar. Çünkü sünni təlimləri şiə şəriətinin "naib-ul imamlıq" qurumu və dini anlayışı ilə ziddiyətdə idi. Böyləcə Azərbaycanın öz soyundan və tarixi anılarından qoparılaraq başqa bir istiqamətə yönləndirilməsi başarı ilə gerçəkləşdi.

**Millətlər məzhəb və din dəyişiminə girdiklərində onların kollektiv və tarixi bilincaltı böyük zərbə alır. Millət əski ulusal xatirələrindən qopmaq zorunda qalır. Səfəvi-şüubiyə tətbiqatı nəticəsində Azərbaycan türklüyünün ortaq əski türklük xatirələrindən qopması hızlandı. Səfəvilərdən öncəki kollektiv bilincaltı silindi. Səfəvilər öncəsi ortaq tarixi**

[397] Əli Şəriəti "Ələvi şiəsi və Səfəvi şiəsi" s. 20.

**bilincaltında hansı xatirələr var idi? Bayındırlı mədəniyyətinin anıları, Səlcuqlu yayılımcılığı, Dədə Qorqud dastanları. “Bayındır”, “qorqud”, “qazan”, “əlvənd”, “göyxan”, “dənizxan”, “ayxan” kimi anlamlı adlar məsxərə edildi və yerinə “fəramərz”, “fərrux”, “sam”, “qismət”, “qənimət”, “əntiqə”, "zəqifə", "səfihə", "zabitə" kimi gülünc adlar yerləşdirildi. Çünkü artıq Azərbaycan türklüyü öz milli kökündən qoparılmış və fars milliyətçiliyinin hədəfi yolunda hərəkətə keçirilmişdi.** Bu gün İranda iki milyon civarında olan, ancaq məzhəbini dəyişdirməyən Xorasan türkmənləri öz əski tarixi anılarından qopmadıqları üçün asimilə olmurlar. Ancaq Azərbaycan türklüyü asimilasion yoluna qoyulmuş. Çox qolayca farslaşır. Farslaşmasında əngəl yoxdur. Türkmənlərin farslaşmasını önləyən fərqli inanc amili var.

Kərəki şiə fiqhini dövlətin omurqası halına gətirdikdən sonra xanigahlara qarşı savaş açdı. Səfəvi dövlətini quran Ərdəbil xanigahı idi. Bütün xanigahlar qapadıldı. Mal varlıqlarına əl qoyuldu və şiə mədrəsəsinin hesabına keçirildi. Xanigahları ibtal edib “hüseyniyə”yə dönüşdürdülər. Xanigahlarda səmazənlik, sufi davranışları da yasaqlandı və hər şey “hüseyniyə”lərə devr edildi. Şah İsmayılın zamanında “hüseyniyə”lərə rast gəlinməməkdədir. Bu dönəmdə xanigahlar aktivdir. “Hüseyniyə” Pəhləvilər dönəminə qədər sünni düşmənliyini bərkişdirən mərkəzlər idi.

Burada ağlaşırlar, Hüseyni xatırlayıb və onu öldürən "sünni!"lərə lənətlər yağdırır sonra da coşaraq sinə və zincir vurur, baş yarırdılar. Xanigahların hüseyniyəyə dönüşmə macərası da qızılbaşlığın tarixdən dışlanmasına yol açırdı. Xanigahlarda ifa edilən muğamlara da yasaq gətirildi. Muğamlar hüseyniyyələrin mərsiyə mərasiminə tabe edildi. Üzeyir Hacıbəyli bunu "qina"nın yasaqlanması olaraq nitələr. Qina, yəni həzz doğuran zəngulə. Qina xanigahlarda sərbəst ikən hüseyniyyələrdə yasaqlandı.[*]

Kərəki Bayındırlılardan və Qaraqoyunlulardan qalan cami memarlığını ortadan qaldırmaq fikrinə düşdü. Bir fətva çıxardı ki, sünnilər müsəlman olmadıqları üçün qibləyə önəm verməmişlər və camilərin qibləsi yanlışdır. Bütün camilər sökülməlidir. Ancaq Kərəkinin bəzi fətvaları müxaliflərinin və rəqiblərinin etirazları ilə qarşılaşırdı. Onu yeni məzhəb gətirməkdə suçladılar və onu "məzhəb ixtiraçısı" adlandırdılar.[398] Kərəkinin məğlub edib Qəzvindən uzaqlaşdırdığı rəqibləri deyirdi: Qibləni bəlli etmək fəqihlərin işi deyil, mühəndislərin işidir.[399] Kərəki isə, deyirdi ki, mən naib-ul imamam. İmam Mehdi bu bilgiləri

---

[*] Üzeyir Hacıbəyli: "Qina"nın nədən ibarət olduğu haqqında müxtəlif şərhlər verilir. Məşhuru budur ki, "qina" səsin boğazda qaynatılıb zəngulələr əmələ gətirməsindən ibarətdir. Hər halda qina haramdır-deməkdən məqsəd budur ki, oxuyan şəxs öz təğənnisinə dünyəvi təğənniyə məxsus rəng vermyib dini bir üslub ilə oxusun. (Üzeyir Hacıbəyli, Seçilmiş əsərləri II cild, s. 382, "Şərq-Qərb", BAKI-2005).

[398] Məhəmmədrza Həkimi, "Tarix-ulüləma" s. 408.

[399] Riyaz-ül üləma, 3-cü cild s. 453.

mənə verir və bu bilgilərin qaynağı haqdır. Kərəkinin bu sözlərindən qorxan Şah Təhmasib də onun tərəfini saxlayırdı və ölkədə təxribatlar davam edirdi. Qızılbaşların tək düşmənləri sünni idi. Ona görə də zeydiyə, ismailiyə kimi digər şiə məzhəblərinə toxunmazdılar. Ancaq Kərəki və çevrəsi imperatorluqda bulunan bütün zeydiyə və ismailiyələrin cəfəri şiə məzhəbinə keçmələri üçün fətva çıxardı. Çox qısa sürədə imperatorluqda onlardan əsər-əlamət qalmadı. Səfəvi dövləti isna-əşəri şiə üzərində qurulma sürəcini tamamladı. Yəni isna-əşəri məzhəbi içində bütünüylə İrani kimliyə təslim edildi. Kərəki tətbiqatında sərbəst olsun deyə Şahdan onun tətbiqatını təyid edəcək bir əmr çıxarmasını istədi. Şahın bu yöndə bir əmri qızılbaşlar arasında və ölkədə yayıldı:

Kim Xatəm-ul müctəhid, seyidlər elminin və naib-ul imamın varisi olan Şeyx Kərəkinin buyuruqlarına təslim olmazsa, mürtəddir və cəzalanmaldır.[400] Kərəki Şahın bu hökmünü əldə etdikdən sonra öz şiə devrimlərinə davam edəcək və rəqibləri olmayacaqdı. Bu fərman çıxdıqdan sonra rəqiblər ya susmaq, ya da fərar etmək zorunda qalacaqdılar. Camilərdə, məscidlərdə dini təbliğata göndərilənlər artıq qızılbaşların kontrolundan çıxmış və ölkənin dini işlərini əlində bulunduran Kərəkinin kontroluna keçmişdi. Xanigahların yerinə yeni məscidlər yapılır və yeni şiə bilgiləri təbliğ edilirdi. Kərəki tam yeni kadrları ilə dövləti ələ keçirmiş və özündən öncəkiləri uzaqlaşdırmışdı. Əski

[400] Məhəmmədrza Həkimi “Tarix-ul üləma” s. 408.

xatirələri olmayan kadr yetişdirmək üçün yeni yöntəm gəlişdirildi. Ata-analarını təbərrayan dəstələrinin öldürdükləri balaca uşaqları yetimxanaya alıb onları həm şiə tərbiyə edirlər, həm də olqunlaşdıqlarında bir kadr olaraq təbliğat üçün ölkənin dəyişik yerlərinə göndərirdilər.

İskəndər bəy Türkmən bu olayı anlatmışdır: Şiə ölkələrində, xüsusilə Məşhəddə, Səbzəvarda, Astarabadda, Qumda, Kaşanda, Yəzddə, Təbrizdə və Ərdəbildə şah qırx nəfər yetim qıza və oğlana libas verir, ehtiyaclarını təmin edirdi. Onları şiə məzhəb müəllimlər və əməli saleh xidmətçilər vasitəsi ilə tərbiyələndirir və həddi-büluğa çatanları bir-biri ilə evləndirirdi.[401] Kadrlar tərbiyə olduqdan sonra onların kiminlə evlənmələrinə də İskəndər bəyin anlatdığına görə dövlətin dini qurumu qərar verməli imiş. Çünkü dövlət onları bəlli amaclar üçün tərbiyə edib yetişdirmişdi və dövlətin dini politikasının xidmətində olmalı idilər. Əli bomboş Lübnandan Qəzvinə gələn Kərəki öldüyündə var-dövləti şahınkına bərabər idi. Kərəkinin ölümündən sonra özünü seyyid olaraq tanıdan Kərəkinin qız nəvəsi Mirseyid Hüseyn Cəbəlamil iş başına gəldi.

Mirseyid Hüseyn Cəbəlamil xatəm-ul müctəhidin (Kərəkinin) qız nəvəsidir. Şah zamanında (Şah İsmayıl) Lübnandan gəlib, bir müddətdə Ərdəbildə tədrislə, şeyx-ul islamlıq və şəri işlərin həlli ilə məşğul oldu. Sonra ali

[401] İskəndər bəy Türkmən “Tarixe-Aləmaraye-Abbasi”, çevirən Şahin Fazil, “Şərq-Qərb” Bakı-2010, s. 242-243.

dərgaha gələrək müctəhidlik iddiasında oldu. Şahın diqqətini özünə cəlb etdi.[402]

Kərəki və varislərinin Şah Təhmasibin 52 illik uzun sürəli səltənəti zamanında tərtib və tətbiq etdikləri teoriləri toplumda yeni bir qatman, yeni bir nəsl oluşdurdu. Özləri üçün intizamlı bir sistem qurmuş olan şeyxlər insanların ruhunu dəyişdirmək və onlardan düşünməyən itaətkar məxluqlar oluşdurmaq üçün bütün yöntəmləri denədilər. Dövlətin içində dərin bir dövlət qurmuş, gerçək söz sahibləri özləri olmuşdu. Səfəviyə dövlətindəki dini yapılanma bütünüylə Sasani dövlətinin dini qurumlarına uyqun olduğundan, bir çox orientalistlər Səfəvi dövlətini bu baxımdan İran-Sasani kimliyinin dirilişi kimi dəyərləndirmişlər. Fars tarixçiləri də Səfəvi dövlətinin quruluşunu İran tarixində istisna dönəm kimi dəyərləndirir və İranın bütünlüyünü quran ideolojinin bu dönəmdə şəkilləndiyini vurqularlar. Səfəvi dövlətində şiə kimliyi ilə İrani kimlik bir-birinə öyləsinə hörüldü ki, türk və ərəb kimi başqa yan amillər tamamən iqtidarsızlaşdırıldı, yox edildi. Azərbaycan türkləri Səfəvilər dönəmindən devşirilərək şüubi-İrani kimliyin kor fədailərinə dönüşdürüldülər. Sadəcə 19-cu əsrin ortalarından modern İrani kimliyin fəlsəfəsini yazmadılar. 1979-cu ildə İranda inqilab olduğunda ortaya çıxan boşluq üzündən Xorasan türkmənləri milli haqlarını istər oldular. Xomeyninin istəyi üzərinə Təbrizin İnqilab Ordusu gedib Xorasan türkmənlərini boğub,

---

[402] Eyni qaynaq s. 274.

öndərlərini də qətl etdi. İran-İraq savaşında ortada qullanılan və İranı bütünlüyünə qovuşduran yenə də Səfəvilər zamanından başlayaraq devşirilən Azərbaycan türkləri oldu. Bu baxımdan səfəvilik sasaniliyin dirilişi kimi görülə bilər. Çünkü Sasani sayağı İslama yorum gətirildi. Kitabları, düşüncə öndərləri və vizionları olmayan qızılbaşlar bu şəklidə İran milliyətçiliyinə yem oldular. Tarixdə bir xəbər olaraq, sadəcə adları miras qaldı. Əməklərinin məhsulu kimi öz soylarına heç bir şey miras qalmadı. Bayındır-Dədə Qorqud mədəniyətini Təbrizdə devirib yox etdilər, ölkəni də farslara buraxıb tarixin qaranlıqlarında itib batdılar. Qızılbaşların bu qədər yüksəliş həyəcanlarına rəğmən, kitabsız, dilsiz və vizionsuz olduqlarından necə də qolayca tarixdən dışlanmaları çox ibrətverici bir örnəkdir.

Kərəki "təvəlla-təbərra" qavramlarını da dərinləşdirdi. Bu haqda "Nəfəhat-ul lahut fi lə´n-ul cebti vəl tağut"* (Cebt və tağutun lənətlənməsində ilahi qoxular) adlı bir kitab da yazdı. Kərəkiyə görə cənnətə getmək üçün cebt və tağuta sürəkli lənət göndərmək gərəkir. Cebt və tağut Quran dilində Məkkədəki bütlər olaraq bilnir. Kərəki isə, Əbubəkiri cebt və Öməri tağut adlandırır. Kərəki bu əsərində Əbubəkir və Ömərin münafiq olduğunu deyir. Onlar Kərəkiyə görə peyqəmbərdən sonra İslamı parçalayıb sünni məzhəbinə çəkmək üçün müsəlman olmuşlar. Sünnilər də bunları peyqəmbərin yavəri qəbul etdikləri üçün kafir və dinsizdilər.

* نفحات اللاهوت فى لعنِ الجبت و الطّاغوت

Quranda keçən “cihad” hökmünün də sünnilərə qarşı savaş olduğunu açıqladı. Bu əsərində Şah İsmayılla Şah Təhmasibi də yeddinci imam Musa Kazimin soyundan olduqlarını yazır və onlara qeyblərdən bərəkət və yardım gəldiyini savunur. Namaz bitdikdən sonra Əbubəkir və Ömərə lənət göndərmənin gözəlliklərini anladır. Günümüzə qədər davam edən bu ənənə “aşura ziyarəti” adlanır. Hər namaz sonrası, özəlliklə aşura namazlarında Əbubəkirə, Ömərə, Osmana, Müaviyəyə, Yəzidə lənət göndərilməzsə, şiə əhlinin namazı qəbul edilməz. Cəfər Sadiqin də namaz sonrası onları lənətlədiyini söyləyir. Əbubəkir və Ömərdən təbərra etməyənin cəhənnəm atəşində yanacağını yazır. Onlardan təbərra etmək hər müsəlman üçün vacibdir. Qiyamətdə lənət göndərməyənlər Allaha cavab verməli olacaqlar. Əbubəkirin peyqəmbərə maddi yardım etdiyini söyləyirlər. Bu, açıq yalandır. Peyqəmbər hicrət etdiyində (Məkkədən Mədinəyə getdiyində) Əbubəkir ona dəvəsini para ilə satdı. Bütpərəst olan Əbubəkir necə peyqəmbərin dostu ola bilərdi? Tanrı düşməni olan Əbubəkirlə peyqəmbər dostluq etməzdi. Əli isə, heç bir zaman bütpərəstlik etməmişdi və Allah onu peyqəmbərin canişini etmişdi. Əbubəkir zalim və məlun idi, sünnilər də onun arxasınca getdiklərindən zalim və məlundurlar.[403] Daha sonra Ayişə haqqında yazır. Sünnilərcə Ayişə öz ictihadına görə davranmış. Ayişənin öz ictihadına görə davrandığı iddialarını kötüləyir.

---

[403] Nəfəhat-ül lahuti fi lə´n-ül cibti vət tağut 7-36.
نفَحاتُ اللاهوت فى لعنِ الجِبتِ و الطّاغوت 7-36

Sünnilərin bu iddiası batildir. Çünkü Ayişə Əliyə qarşı savaşdığı üçün məlu´n idi. Bir halda ki, Ayişə peyqəmbərin Əliyə “səninlə savaşan kim olursa olusn mənim də düşmənimdir” söylədiyini bilirdi. Daha sonra imamın seçilməsinə qarşı çıxır. Çünkü Kərəkiyə görə imam seçilməz, Tanrı tərəfindən təyin edilər. Səqifə-i Bənisaidə´də Əbubəkirin seçildiyini şeytan işi sayır. Çünkü Əlinin eşi və peyqəmbərin qızı Fatimə bu seçimi qəbul etməmişdi. Kərəki daha sonra Təlhə və Zübeyr məsələsinə keçir və onların da kafir və mürtəd olduqlarını yazır və lənət edilmələrində xeyirlər olduğunu savunur.[404] Uzun-uzun əfsanələr anladır ki, şiənin tək düşməni sünnidir və başqası deyildir. Kərəkinin sistemələşdirdiyi bu görüşlər axundlar və mollalar tərəfindən əzbərlənərək kənd məscidlərində bilə, əhaliyə söylədiləcəkdi. Günümüzdə bu təbliğat hələ də davam edir və məhərrəmlik törənlərində, Əbubəkirə, Ömərə, Ayişəyə camilərdə bir ağızla lənət göndərirlər. Bu, 500 illik uzun bir zaman içində alışqanlıq halına gəlmişdir, tərk edilməsi çətin məsələdir. İnsanların ruhuna əkilmiş səfəvi nifrət teorisi qolaylıqla ortadan qaldırılamaz. Kərəkinin bu görüşü İran şiə inqilabının öndəri Xomeyni tərəfindən də dilə gətirilmişdir. Xomeyni “Ömər kafirliyin, fəsadın və pisliklərin qaynağıdır”[405] yazmaqdadır.

Bu tarixin sonucu isə, bizik. Biz türklər. Daha doğrusu əskidən türk olub və səfəviyətlə türksüzləşən, nifrət teorisinin zindanında həbs

---

[404] Eyni qaynaq 71-99.
[405] Xomeyni, Kəşf-ul əsrar, s. 119.

ediləræk farslaşan biz türklər. Zaman keçdikcə Kərəkinin teoriləri İrani kimlikdən yana olanlar tərəfindən daha da fərqli şəkildə təfsir edildi. Üzərinə bolca ədəbiyat yapıldı. Bir sürə sonra fars dilinin uzmanları olan türklər özləri də bu türk düşmənləri qatarına qatılaraq özlərinə qarşı bilgilər ürətməyə başladılar. Nədən? Çünkü şiə-şüubiyə inancı toplumun yaşam biçiminə dönüşmüş də o üzdən. Toplumların mədəniyətləri bəlli ortaq inanc odaqlı olaraq şəkillənər. Bu inanc isə, fars kimliyi ilə özdeşləşdiyindən ona bərk-bərk sarıldıqca bir o qədər də türksüzləşmə və farslaşma gerçəkliyi ortaya çıxmışdır. “Bir toplumun siyasi və iqtisadi orqanizasionu çökərsə, onun mədəniyəti yaralanar, ancaq çökməz. Bir toplumun inancı çökərsə, onun mədəniyəti yox olar, çünkü mədəniyətin orta dirəyi inancdır.”[406] Bu gün İranda türklərin dilsizləşməsi, düşüncəsini və dilini itirməsinin səbəbi Dədə Qorqud kimi kitabın ortaya çıxmasına imkan sağlayan Bayındırlı mədəniyətinin inancından qopması və şüubiyə inancının içində ruhunu həbs etməsidir. Bir toplum öz fitrətini buraxıb yabancı və özgə bir fitrəti yaşamağa başladığında zaman axışı içində tarixdən silinib yox olar. Qızılbaşlıq və səfəvilik yabancı bir fitrət olduğundan ona uyum sağlamaq farslaşma ilə bənzər anlam daşımışdır.

Təhmasibin ölümündən sonra qanlı iqtidar savaşı başladı. İkinci İsmayıl, Təhmasibdən sonra taxta çıxdı. İkinci İsmayıl doğası etibarı ilə

[406] Yılmaz Özakpınar “Kültür və mədəniyet anlayışları ve yeni bir medeniyet teorisi” Ötüken yayınlar 1999.

barışcıl adam idi. Ölkədə sünni öldürmənin qarşısını almaq istədi. Bu üzdən təbərrayanın küçələrdə bir daha Əbubəkirə, Ömərə,, Osmana, Ayişəyə lənət göndərmələrini yasaqladı. Ancaq onun bu istəyi qızılbaşların və mollaların etirazı ilə qarşılaşdı və 15 aydan artıq iqtidarda qala bilmədi. İsmayıl Mirzənin yeməyinə zəhər qarışdırmışdılar. Bu zəhərdən öldü.[407] Çox mürəkkəb bir fitnə ilə öldürüldü və kor oğlu Məhəmməd iqtidara gətirildi. Səfəvi xanidanından hər kəsi öldürdülər və yalnız bu kor Məhəmməd diri qaldı, onu taxta çıxardılar. Mollalıq qurumu öyləsinə güclənmişdi ki, onun istəyinə qarşı gələn şah da ortadan qaldırılırdı. Kor padşahın da edəcəyi bir iş yox idi. Müqəvva kimi taxtda oturmuş və bütün səlahiyyətləri buraxmışdı dini quruma. Daha sonra Şah Abbas bütün qardaşlarını öldürüb iqtidarı ələ keçirdi. Şah Abbasın xoşbəxtliyi onda idi ki, İngiltərə dünyanın super dövləti kimi ortaya çıxmışdı. İngiltərə Osmanlının arxasında güclü bir dövlətin olmasından yana idi. İngiltərənin dəstəyi ilə Səfəvi dövləti güclənməyə və Osmanlıya qarşı savaşlara hazırlanmağa başlayacaqdı. Təbriz və Həmədan kimi şəhərləri Osmanlıdan geri alacaq və Təbriz İran Səfəvisinin işğalında qalacaqdı. Şah Abbas dönəmində İngilis casusların Səfəvi sarayında sərbəst dolaşdıqları haqda bir sürü bilgilər vardır. Ancaq bu qonunu burda durdurub və İkinci Şah İsmayılın təbərra dəstələrini

---

[407] İskəndər bəy Türkmən “Tarixe-Aləmaraye-Abbasi”, çevirən Şahin Fazil, “Şərq-Qərb” Bakı-2010, İsmayıl Mirzənin ölümün ayrıntılı bilgisi bu səhifələrdə: 385, 386, 387, 388.

ibtaletmə girişimi üzərində bir az duralım. İskəndər bəy Türkmən bu haqda yazır: İsmayıl Mirzə küçələrdə təbərraçıların Əbubəkirə, Ömərə və Ayişəyə lənət göndərməsini yasaqlayır. Bunun üzərinə mollalar və qızılbaşlar arasında Şahın sünni olduğu söz-söhbəti dolaşır. Şah İsmayıl Mirzə və´z məclisinə on iki qorçi göndərdi ki, təbərra dilini açan hər kəsi cəzalandırsınlar. Bir cümə axşamı və´z məclisi quruldu məclisin sonunda Dərviş Qənbər Təbərrayi bu beyti oxudu:

Əli və soyuna salavat göndər,
Əli düşməninə daim lənətlər!

Mirzə Məxdum bu kinayəyə dözdü, amma çox keçmədi ki, qorçilər Dərviş Qənbəri elə kötəklədilər ki, başı bir neçə yerdən yarıldı. Bu məsələni bildikləri zaman şiələrin gözlərindən həsrət yaşları axmağa başladı. Bu hadisədən sonra İsmayıl Mirzənin sünniliyi barədə camaatın gümanı daha da çoxaldı, araya gizli danışıq düşdü, bu məsələdən qızılbaş əqidəsi zərərə düçar oldu, amma heç kimdə bu barədə danışmaq curəti yox idi. Bütün üləmalardan bədgüman olan İsmayıl Mirzə Mir Seyid Hüseyn Müctəhidə, Mir Seyid Əli Xətibə və şiəlikdə və təbərrada üstün olan bütün astrabadlılara başqalarından daha çox iltifatsızlıq göstərdi və onların bəzisini ordudan çıxardı. O, Mir Seyid Hüseynə bütün elmi kitablarının bir evə toplanıb möhürlənməsi əmrini verdi. Onu yaşadığı mənzildən çıxarıb, evini müsadirə etdilər. İsmayıl Mirzə buyurdu ki, ömürləri boyu "əşərə-i mübəşşirəni" (peyqəmbər tərəfindən cənnətlə müjdələnən on kişi) lənətləməyən islam əhlinə

müəyyən məbləğ pul nəzir olsun. Mirzə Məxdum Şərifi o adamları müəyyən etməyə başladı. Tamahkar adamların çoxu özlərinin sünni olduqlarını bildirdisə də, qəbul edilmədi. Bütün ömürləri boyu əshabələrə qarşı özlərinın lənət ağızlarını açmayan bir dəstə Qəzvin camaatı adlarını yazdırdı. Qədim zamanlardan bəri şafei məzhəbindən olan bir dəstə qəzvinlini Mirzə Məxdum təsdiq etdi və onlara iki yüz tümənə qədər pul verdi. Amma, həmin məbləğ pul İskəndər şanlı nəvvabın hakimiyyəti vaxtı onlardan geri alındı və onların etibar kisələrində sünnilik bədnamlığından başqa heç nə qalmadı. Xülasə, İsmayıl Mirzənin sünnilərə rəğbəti barədə türk və tacik camaatı arasında fikir yarandı, amma onun qorxusundan heç kəs bu haqda bir söz deməyə cürət etmədi. Cənnətməkan şahın hakimiyyəti vaxtı təbərra xüsusunda söz danışan və indi də öz sözlərindən dönməyən bəzi üləmalar sakitcə dayandılar, etibardan düşdülər, onların xidmətləri qadağan edildi və çağrış olmadan saraya gəlmək hüququndan məhrum oldular... Amma, qızılbaş əmir və əyanları söhbətin belə aparılması ilə qətiyyən razılaşmırdılar. Bir gün isə onun məclisində dedilər ki, məscidlərdə şeir demək və divarlara şeir yazmaq haramdır, Qəzvin məscidinin divarlarısa, camaatın yazdığı şeirlərlə doludur. İsmayıl Mirzə həmişə şiəlik tərəfdarı olan Mir Zeynalabdin Möhtəsib Kaşiyə məscidlərə gedib, divarlardan şeirləri pozmaq əmrini verdi. O da, gedərək, İsmayıl Mirzəyə xoş gəlsin deyə, Əli və məsum imamlar barədə yazılmış mədhiyyələri də pozdurdu. Bu iş bəzi

adamların xoşuna gəlmədi, türklər arasında söz-söhbət yarandı. Bəzi əmirlər və əyanlar "Baği-Səadətabad" sarayında yığışıb belə dedilər: "Camaat Şahın doğma oğlu və Şeyx Səfi və Əli ibn əbu-Talib fərzəndi olan mürşidimizin və vəlinemətimizin məzhəbi barədə qəribə söhbətlər danışır və onu şahın düşmənləri ilə dostluqda günahlandırırlar. Bu, çətin ki, belə olsun. Bilmirəm ki, belə söz-söhbətə səbəb nədir? Camaatın belə danışığına səbəb nə olmuşdur? Bizim sədaqətimiz və sufiliyimiz müşkülata düçar olmuşdur. Bu müşkülatın həll olunması üçün Şahın yanına getməyə cürətimiz yoxdur. Bəzi ağsaqqallar və ağıllı adamlar deyirlər ki, belə söhbətlər qızılbaş etiqadı ilə düzgün gəlmir və bu ailəyə qarşı küfrdür. Niyə biz bu xüsusda olan ehtimallara inanaq? Yox, əgər Şah tərəfindən bəzi məsələlər ortaya çıxmış və boşboğaz adamların tə´nəsinə səbəb olmuşsa, bunun özü də əsassız deyildir. Bu xüsusda heç danışmamaq məsləhətdir, çünki padşahın hüzurunda bu haqda söhbət etmək biz bəndələr tərəfindən ədəbsizlikdir. Ayrıca, kimin həddi vardır ki, bu barədə ondan bir söz soruşa bilsin?”[408] Daha sonra Şah haqqında söz-söhbət böyüyür və sonunda şahın öldürülməsi ilə nəticələnir. Anlaşılan budur ki, təbərraçılar o qədər güclənmişdilər ki, dövlətin başçısı bilə, onlara batışa bilməmiş.

Təbərraçılar böyləliklə tarixdən silinmədilər. Gündən günə gücləndilər. Günümüzdə də camilərdə onların lənət yağdırmaları davam

---

[408] Eyni qaynaq s. 378, 379.

etməkdədir. Əhməd Kəsrəvi Məşrutə hərəkəti zamanında da onların aktiv olduqlarını yazmaqdadır: Səfəvilər zamanından Təbrizdə mövcud olan təbərraçı dərvişlər məşrutə zamanlarında da aktiv idilər. Bunlara həm də "lənətçi" deyilir. Lənətçilər, özəlliklə məhərrəm ayında İslamın ilk çağlarındakı peyqəmbərin yaxın yandaşlarına yüksək səslə lənət göndərirlər.[409]

Şah Abbas dönəmində Lübnandan molla axını nisbətən dursa da, Şah Abbasın ölümündən sonra yeni axınlar başladı. Ancaq xürafat yuvalanmışdı və Şah Abbas özü də bunlardan biri idi. Möhtəşəm Kaşani Şah Abbasın özəl şairlərindən biri olmuş. Şahın səfərlərində yanında bulunur və onu farsca yazdığı şeirlərlə mədh edirdi. Bir gün Şah Abbasa yazdığı mədhiyəsini oxuyur. Şah əsəbləşir və deyir: Nədən məni "kəlbəli" (Əlinin köpəyi) deyə vəsf etməmisən? Mən Əli qapısının köpəyiyəm. Bir daha məni "kəlbəli" olaraq mədh etməsən ağzını qaynar qurşunla doldurram. Kaşani cavab verir ki: Mən bir şairəm. Fərq etməz, Siz kimi istəsəniz onu mədh edərəm.[410]

Bu molla axınının içində Molla Məhəmməd Baqir Məclisi də var. "Bəhar-ul ənvar", "Haqq-ul yəqin" və "Helyət-ül müttəqin" kitablarının yazarı olan Məclisi, Kərəkinin xürafələri üzərinə başqa xürafələr artıracaq və bu xürafələrindən dolayı da dövlət tərəfindən ödüllənəckdi. 110 cilddən ibarət olan "Bəhar-ul ənvar"ın bir tək

---

[409] Əhməd Kəsrəvi, Tarixi-məşrutə, s. 131.
[410] Əli Şəriəti "Ələvi şiəsi və səfəvi şiəsi" s. 17.

cildi bir milləti tarixin qaranlğına gömməyə yetərlidir. Zâtən tarixin qaranlığına gömülüşümüzün də nədəni bu xürafələr oldu. İslamiyəti öz ana qaynağından ayırıb irqçi bir təfsirə tabe etdilər. Molla Məhəmməd Baqir Məclisinin İslam anlayışına baxalım:

Öncə siratın (yolun) doğru olduğuna inanmalısınız. O da cəhənnəmdə bir körpüdür ki, bütün yaranmışlar qiyamət günündə onun üstündən keçəcəklər. Onu sirat körpüsü olaraq açıqlayırlar. Qıldan incə, qılıcdan kəsərli və atəşdən yaxıcıdır. Mömin olanlar ılıdırım hızı ilə bu körpünün üstündən keçib cənnətə girəcəklər. Suçluların ayaqları titrəyəcək cəhənnəmə düşəcəklər. Cəhənnəmin yeddi qatı var. 1- Cəhənnəm. 2- Sə´ir. 3- Səqər. 4- Cəhim. 5- Ləza. 6- Hətəmmə. 7- Haviyə. Cəhənnəmin içkisi isti həmim və qətran, yeməyi də zəqqumdur. İsti həmim çirk və irindən ibarətdir. Bu, elə bir içkidir ki, ondan bircə damla dənizə düşərsə, dəniz suyundan içən bütün canlılar məhv olar. Cəhənnəmdə içində 70 min ev olan bir zərrə var. Hər evin də içində 70 min otaq. Hər otaqda 70 min əfi´ ılan. Hər əfi´nin qarnında 70 min zəhərli saxsı qab var. Cəhənnəmin atəşinin hərarəti 70 dərəcə bu dünyanın atəşindən artıqdır. Ayrıca, cəhənnəmin 40 bucağı var. Hər bucaqda 40 ılan var. Hər ılanın qarnında 330 əqrəb var. Hər əqrəbin ağzında 330 zəhərli diş var. Cəhənnəmdə dərin bir quyu var. Bu quyunun qapağı çəkildiyində atəş püskürür. Səud adında misdən bir dağ var. Bu dağın içində qaynar misdən oluşan bir axar çay var. Cəhənnəm əhli bu dağın içindəki qaynar misdə

yanmaqdan əzab çəkəcəklər. Cəhənnəm əhlinin ayaqlarında atəşdən buxov var. Bu buxovun hərarətindən başlarının içi qaynayır.[411] Səfəviyənin mötəbər qaynaqlarından olan biri də Məclisinin "Həq-ul yəqin" əsəridir. Bu kitab da xurafatdan əlavə Əbubəkir və Ömər düşmənliyi üzərinə yazılmışdır: İmam Cəfər Sadiq demişdir ki, cəhənnəmin yeddi qapısı var. Bu qapının birindən Ferun, Haman və Qarun girəcək. Bunlar əslində Əbubəkir, Ömər və Osmandan başqa kimsə deyillər...[412] Fələq cəhənnəmdə dərin bir quyudur ki, cəhənnəm əhli orada əriyəcəklər.[413] Əbubəkir, Ömər, Osman, Müaviyə, İbni-Mülcəm cəhənnəm atəşində yanacaqlar...[414] Cəhənnəmdə bir atəş var ki, Ömərdən başqa kimsəni yandırmaz, çünkü Ömər Hz. Əlinin haqqını yemişdir və Əlinin peyqəmbərin varisi olduğunu təkzib etmişdir.[415] Allah Hz. Adəmi yaratmadan iki min il öncə yazmışdı ki, Məhəmməd rəsullahdır, Əli onun yardımcısıdır və Əbubəkirlə Ömər onların düşmənidir.[416] Peyqəmbər buyurmuşdur ki, kim Əlinin imamətini inkar etsə, məni inkar etmiş olur, məni inkar edən Allahı inkar etmiş olur.[417] Peyqəmbər buyurmuşdur ki, Əli ilə savaşan mənimlə savaşmış kimi olur. Bizim etiqadımız

---

[411] Məhəmməd Baqir Məclisi "Həqq-ül yəqin", M. F. Axundov "Məktubati-Kəlamləddövlə" s. 27.
[412] Məhəmməd Baqir Məclisi, "Həqq-ul yəqin" Zəviəlqurba nəşriyatı, s. 606.
[413] Eyni qaynaq, s. 609.
[414] Eyni qaynaq, s. 610.
[415] Eyni qaynaq, s. 616.
[416] Eyni qaynaq, s. 617.
[417] Eyni qaynaq, s. 628.

bunadır ki, bu dörd erkək və qadın bütdən uzaqlaşıb onlara lənət göndərmək gərəkir: Əbubəkir, Ömər, Osman, Müaviyə, Ayişə, Həfəsə, Hind və Ümmülhikəm.[418] Rəvayətdir ki, Əbuhəmzə Səmali İmam Sadiqdən Əbubəkir və Ömər haqqında sormuş. Cəfər Sadiq buyurmuş ki, Əbubəkir və Ömər kafirdirlər. Onları qəbul edənlər də kafirdir.[419] İmam Mehdi zühur etdiyində Ayişəni dirildib onu qırmaclayaraq cəzasını verəcəkdir.[420] Səfəviyədən sonra bir sinif halına gələn mollalıq öz seksual ehtiyacları üçün də qaynaq oluşdurmağa başlamışdır. Əllamə Məclisi şiənin ən önəmli alimlərindən biri kimi bilinməkdədir. Onun bütün kitablarında seksoloji haqqında bilgi vardır. Qadınların bacaqlarının arasının yalanıb yalanmaması haqqında da imamlara istinadən bilgi oluşdurmuşlar: "İmam Cəfər Sadiqdən sordular: Qadınların bacaqlarının arasını yalamaq olarmı? İmam Cəfər Sadiq buyurdu: Saqıncası yoxdur, yalaya bilərsiniz. İmam... Cəfər Sadiqdən sordular ki, eyni anda iki kənizlə seks yapmaq olarmı? İmam buyurdu: Eyni anda iki kənizlə seks yapa bilərsiniz, amma eyni anda iki azad qadınla seks yapmanın saqıncası var."[421] Əslində seks haqqında bu qədər utanmazcasına açıqlamalarda bulunan Səfəvi mollası nə etmək istəmişdir? Feodallaşaraq azqınlaşan və evini kənizlərlə dolduran mollalar cinsi azadlıqları və

418 Eyni qaynaq, s. 629.
419 Eyni qaynaq, s. 632.
420 Məclisi, Bəhar-ul ənvar, 13-cü cild, s. 576.
421 Məclisi, "Hilyət-ül muttəqin", Pəyami-ələmdar yayınları, 5-cı baskı, Qum-1391-ci il (h.ş), s. 92.

azqınlıqları üçün imamlara dayanan qaynaqlar oluşdurmaq istəmişdir. Hz. Ömərin yasaqladığı mütə də (qadınların məta və əşya kimi istifadə edilməsi) şiənin vaz keçilməz qurallarından biridir. 500 ildir Türk insanınlın qanı və əməyi ilə mollalıq qurumunun süfrəsi nemətlərlə zənginləşmişdir.

16-cı əsrdə Avropa Orta Çağ qaranlığından ayrılıb aydınlanma rönesansına girdiyi bir zamanda bizim ağlımızı bu kimi xürafələrlə qaranlığa gömmüşlər, Doğu Orta Çağının qorxunc qaranlığına. Bu qaranlıqda doğrunu görmək olmaz. 16-ci əsrdə insan ağlının önündəki əngəllər Qərbdə qaldırılmağa başlarkən, bizdə insan ağlının həbs edilməsinə fərman verilmişdir.

Osmanlı dövlətinin gətirdiyi sünni şəriəti qəbul etməyən Ələvi türkmənlər dövlətləşdikdən sonra şiə şəriətini mənimsəyən Səfəvilər tərəfindən də dışlanaraq yalnızlaşdılar. Yoxluğa tərk edildilər. Varlıqları bilə, tarixdə qalmaz oldu.

## Səfəvilərin sonu

Səfəvi dövləti böyük bir həyəcanla və ələvilərin böyük ümidləri ilə qurulmuşdu. Ələvilər sünni və şiə şəriətinə dayanmayan bir dövlət qurmaq istəmişdilər. Ancaq dövlətin hüquq düzənini və ilkələrini oluşduracaq kitabları yox idi. Yalnız saz çalıb şeir söyləməklə də dövlət idarə olmaz. Yan tərəfdən kitabı və hüquq ilkələri olan biriləri gəlib dövləti qapar. Faruq Sümər kimi bəzi tarixçilər Səfəvi dövlətinin qurucu başının Ərdəbildə və vurucu qollarının Anadoluda olduğunu savunarlar. Ancaq tarixi gerçəklər bunun tərsini göstərir. Səfəvi dövlətinin həm qurucu başı və həm də vurucu gövdəsi hər ikisi də Anadoluda idi. Səfəvi dövlətinin quruluş şəklini təsvir edən Şeyx Bədrəddin olmuşdur. Bədrəddindən 27 il sonra Anadolaya gedən Şeyx Cüneyd sadəcə Bədrəddinin kitablarındakı açıqlamalara uyum sağlamış, nə o, nə də Heydər və İsmayıl özlərindən bir açıqlama kitabı miras buraxmamışlar. Səfəviyəni quran da Bədrəddinin öyrətilərinə uyum sağlamış ələvilər olmuşdur. Azərbaycan isə, açıqca Səfəvilərə dirənmiş, ancaq Bayındırlı dövlətindəki iç savaşlar və güclü bir liderin Bayındırlılar içindən çıxa bilməməsi dövlət boşluğu yaratmış. Bu boşluqdan İsmayıl kimi kimliyi bəlli olmayan karizmatik bir gənc yararlanaraq Səfəvi dövlətinin quruluşuna girişmiş. Daha sonra Anadoludan Azərbaycana axın edən Anadolu qızılbaşları.

Səfəvilər hızla başlayıb, hızla da yox oldular. Qızılbaşlar özlərindən heç bir miras

buraxmadan tarixdən çəkildilər, həm də çox acıverici şəkildə çəkildidlər. Qurduqları dövləti İranlaşdıraraq çəkildilər. Türküstan və Anadolu arasında ideolojik bir sınır oluşduraraq tarixdən çəkildilər. Türkləri İrani-Sasani kimliyə təslim edərək çəkildilər. Tarixdə belə bir örnək olmamışdır. Min fədakarlıqla dövləti qurub başqa etnosa buraxmaq örnəyi, yalnız qızılbaşlara özgüdür. Səfəvilərdən miras qalan sadəcə yas və ağlaşma, şaxsey-vaxsey törənləri oldu. Bir daşı daşın üstünə qoyub yapdıqları bir şey olmadı. Bayındırlıdan və əskilərdən nə qədər memarlıq abidələri vardısa, hamısını yox etdilər. Sanki türk yurdlarını, türk kimliyini yox etməklə görəvlənmiş bir hərəkət imiş. Ölkəni imamzada məzarları ilə doldurub yoxa çıxdılar.

Səfəvilərin bitişindən sonra Nadir Şah iqtidara gəldi. Əfşarlarda Səfəvi gələnəyinin tərsinə olaraq "şah" sözü isimdən öncə deyil, isimdən sonra gəlmişdir. "Şah" sözünün isimdən öncə gəlməsi fars dilinin tərkibi və isimdən sonra gəlməsi türk dilinin cümlə yapısıdır. Nadir Şah iqtidara gəldikdən sonra türk-İslam Birliyi qurmaq yolunda bir işlər görmək istər. Bu yolda Osmanlıdan yardım bəklər.

Nadir Şah, Osmanlı hökmdarı Birinci Mahmuda göndərdiyi məktublarda Osmanlı və özünün türkmən qövmünün ən böyük ailəsi olmasından yazar və tez-tez qövmi qohumluqdan bəhs edər. Osmanlı divanından alınan məktublarda Nadirin duyqularına laqeydlik vardır.[422] Osmanlı da özünə türk

[422] Faruq Sümər "Oğuzlar" Bakı-Yazıçı nəşriyatı 1992.

deməkdən hürkməkdə idi. Səfəvilik şüubiyənin saxta hədislərinə uyub tarixdən silindiyi kimi Osmanlı da Əməvilərin saxta hədislərini doğru olaraq qəbul etdiyindən türk dilinə ehtiyac duymamaqda idi. Əməvilərin saxta hədislərində cənnətin dilinin Ərəbcə olacağı vurqulanırdı. Əməvi-ərəb irqçiliyinin uyduruq hədisləri qarşısında Osmanlı təslim olmuşdu. Cənnətin dili ərəbcə olacaqsa, nədən bu dünyanın da dilini ərəbcə etməyəlim düşüncəsi saxta “Osmanlıca” dili doğurdu. Birdən-birə “cənnət dili!!!”nə keçmək mümkün deyilsə, o zaman yavaş-yavaş keçilməli idi. Osmanlıca deyilən və heç bir dilbilgisinə tabe olmayan saxta dil, saxtakarlığın və Əməvi-ərəb irqçiliyinin oyunbazlığından başqa bir şey deyildi. Doğru olmayan tarixdən silinir, tarix özü saxtakarlığı qəbul etmir. 600 il tarix qarşısında çox da uzun bir zaman deyil. Ancaq gəl gör ki, Osmanlını da tarix öz məzarlığına sürüklədiyində bu 600 ildən heç bir şey miras qalmadı. Nə bir Hafiz, nə bir Əttar, nə bir Mövlana. Heç bir şey. Qara rüzgar kimi əsib keçmişlər.

Cənnətin dilinin Ərəbcə oluşu kimi önəmli bir qonunu Tanrı açıqca Quranda nədən duyurmamışdır? İbni-Ərəbi deyirdi ki, peyqəmbər öz dönəminin tibbi, fiziki, kimyəvi bilgiləri haqda heç bir bilgisi yox idi. Buna görə də İbni-Ərəbini təkfir edən, kafir sayan olmadı. Quranda açıqca söylənir ki, “Səndən ruh haqqında sorarlar. De ki, ruh Tanrının biləcəyi işdir. Sizə bu haqda çox az bilgi verilmişdir.”[423]

[423] Quran 17-ci surə, 85-ci ayət.

Cənnət-cəhənnəm ölümdən sonra isə, ruhlar dünyasına aid isə, bu haqda Quranın möhkəm ayətləri ortada ikən peyqəmbər Qurana tərs olan sözləri necə söyləyə bilərdi? Cənnətin dilinin ərəbcə olacağını necə söyləyə bilərdi? O zaman cəhənnəmin dili hansı dil olacaq? Yoxsa cəhənnəmdə dil lazım olmayacaq? Cənnətin dilinin ərəbcə olacağını söyləmişsə, cəhənnəmdə hansı dilin olacağını nədən söyləməmiş? Əslində suçlular sorqulanacaqsa, dil cəhənnəmdə lazım olar, cənnətdə deyil. Günahlarına insanlar cavab verməlidirlərsə, bunu bir dildə anlatmalıdırlar. Yoxsa cənnətə gedənlərə dil lazım deyil, sorulara da cavab yox, hər şey Tanrı qatından bilinməkdə. Keşkə bu Osmanlıda ağıl olsaydı və "cəhənnəmin dili türkçə olacaq" deyə bir hədis uydursaydı. Ərəblər daxil bütün müsəlmanlar türk dilini öyrənərdilər. Çünkü müsəlmanların çoxunun yerinin cəhənnəm olacağı bəlli. Nə kitab oxuyan var, nə elmlə uğraşan var. Tanrının verdiyi ağıl imkanlarını qullanan yoxdur. İslam "oxu!" ilə başlarkən, oxuyan yox. Bu necə müsəlmanlıq? Allah o dünyada sormazmı ki, bu ağılı nədən o dünyada düşünsəl çalışmalara adamayaraq geri gətirdin? Ancaq nə etmək olar ki, insan bir yanlışa da inandığında ondan vaz keçməsi çətin işdir. Osmanlı bu batilə iman gətirmişdi. Batil inanclar həm Osmanlının, həm də Səfəvinin soyunu qurutdu. Səfəvi şüubiyə batilinə, Osmanlı da Əməvi irqçiliyinin uyduruq hədislərinə iman gətirmişdilər. Bütün dillər Tanrı iradəsinin ürünü deyilmi? Nədən Tanrının yaratdığı türk dili xor görülmüşdür? Bu, Tanrı

iradəsinə qarşı açıqca savaşmaqdan başqa bir şey deyildir və Tanrı da onları tarixdən öyləsinə sildi ki, heç bir izləri qalmadı. Tanrı iradəsinə qarşı çıxdıqlarından dolayı o dünyada cəhənnəm atəşində yaxılıb yaxılmadıqlarını bilmirik. Hər şeyi bilən Allahdır. Ancaq suçlular cəzalanmalı. Osmanlı da Səfəvi kimi tarixdən silindi. Heç bir iz buraxmadan tarixdən yox oldular. Qalan izlərinin dilini onun varisləri bilməməkdədir və heç bir zaman da bilməyəcəklər. O saxta dili bilməyə gərək qalmamışdı. Ayrıca, o saxta dildə ərəb-Əməvi və Osmanlı devşirmələrinin xəstə xəyallarından başqa heç bir şey yoxdur. Əslində Səfəvi dövlətinin quruluşu və Azərbaycanda türklüyün İrani kimliyə təslim edilişinin ana səbəbi Osmanlının öz soyunu sevməməsi idi. Osmanlının bu soy sevməzliyi üzündən Əmir Teymur da Anadoluya saldırdığında Anadolu bəylikləri Teymurdan yana oldular, çünkü Əmir Teymurda milli şərəf və qürur hissi var idi. Osmanlının dilini Anadolu türkmənləri anlamırdı. Dilini anlayacağı bir dövlətə ehtiyac duymuşdu. Başında devşirmələr durmayan və devşirmə katiblərin qullandığı saxta bir dil olmayan dövlət düzəninə türkmənlərin bilincaltında bir ehtiyac var idi. Olayların ortaya çıxış qaynağı bu ehtiyac idi. Ancaq Osmanlı sarayında əməvi irqçilyinin uydurduğu hədislər yuvalanmışdısa, Səfəviləri də 700 yüz illik təcrübəsi olan şüubiyə ələ keçirdi. Anadoluda hər etnos öz haqqını istərkən türklərə qarşı nifrət duyqusu əsasında teorilər ürətdilər. Müsəlman ərəblər bilə, türkləri sevməz oldular. Bu olaylar Osmanlıda türklük bilincinin doğuşuna gətirib çıxaracaqdı. Ancaq Səfəviyədə

bu ehtimal da olmadığından sonuc fərqli oldu. Türklüyün belini səfəvilik qırdı. Milli oyanış Qərbdə dini mətnlərin ulusal dillərə tərcüməsi ilə başlamışdır. Bu açıdan və sözün renesans anlamında Bayındırlı dövləti türk ulusal oyanışının başlanqıcı idi. Çünkü ilk dəfə olaraq Quran bayındırlı dönəmində türk dilinə tərcümə edildi. Şah İsmayıl adlı bir dəlinin Təbrizdə sünni əsərləri yandırma sırasında bu tərcümə də digər türkçə ədəbiyatla bir yerdə yanıb yox oldu.

Nadir Şahın girişimlərinə işarə etmişdik. Nadir Şah Osmanlıdan yardım gəlmədiyini görüb tək başına bu işi çözməyə girişdi. İslam Dünyasının sünni və şiə alimlərini dəvət etdi. Onlar üçün hər türlü rahatlıq və qolaylığı sağladı. Əmr verdi ki, oturub dartışsınlar və vardıqları sonucu ona bildirsinlər. Əgər şiə İslam kökənli isə, onu beşinci məzhəb olaraq duyuralım, yox deyildirsə, ortadan qaldıralım. Şiə və sünni alimlər dartışdılar. Bu dartışmalar "Hücuci-qətiyyə" adı ilə kitablaşdırıldı. Şiə alimlərinin söyləyəcək sözü qalmamışdı. Sonucu Nadir Şaha bildirirlər və Nadir bu elmi dartışmaya dayanaraq "Fərmani-Şahi" adında ölkəsində bir genəlgə yayımladı. Bu genəlgədə Əbubəkiri, Öməri, Osmanı, Ayişəni sövmək yasaqlanır və Şah İsmail kötülərin kötüsü olaraq duyurulurdu. Bu genəlgəni olduğu kimi burda verəlim:

**Fərmani-Şahi**

Öncə Allah təalaya sığınıram. Biliniz ki, Şah İsmayıl Səfəvi, 1501-ci ildə zühur etdi. Cahil xalqdan bir qismini yanına topladı. Bu alçaq dünyanı və nəfsinin istəklərini ələ keçirmək üçün müsəlmanlar arasına fitnə və fəsad soxdu. Əshabi kirami söyməyi, şiəliyi ortaya çıxardı. Böyləcə müsəlmanlar arasına böyük bir düşmanlıq soxdu. Münafıqlik və düşmənlik bayraqlarının açılmasına səbəb oldu. Öylə oldu ki, kafirlər, rahat və qorxusuz yaşayır, müsəlmanlar isə, bir-birlərini yeyir. Bir-birlərinin qanlarını, namuslarını tələf edir. İştə bunun üçün, Muğan meydanındakı toplantıda, böyük-kiçik həpiniz, məni şah yapmaq istədiyiniz zaman bu istəyinizi qəbul edərsəm, siz də, Şah İsmayıl zamanından bəri, ölkəmizdə yerləşmiş olan pozuq inançlardan və boş sözlərdən vaz keçəcəyinizi bildirmişdiniz. Qiymətli dədələrinizin məzhəbi olan və mübarək adətlərimiz olan, dörd xəlifənin haqq və doğru olduğuna qəlb ilə inanacağınızı və dil ilə də söyləyəcəyinizi, bunları söyməkdən, kötüləməkdən saqınacağınızı və dördünü də sevəcəyinizi söyləmişdiniz. Iştə bu xeyirli işi qüvvətləndirmək üçün seçilmiş alimlərdən, dininə bağlı yüksək zâtlardan soruşdurdum. Həpsi dedi ki, Peyqəmbərimizin haqq yoluna çağırdığı gündən bəri, səhabe-i raşidin olan dörd xəlifənin hər biri, dini-mübinin yayılması üçün canlarını və mallarını fəda etdilər. Bu uğurda çoluq-çocuqlarından, əmi və dayılarından ayrıldılar. Hər sözə, iftiraya, oxa qatlandılar. Bundan dolayı, Rəsulullah əfəndimizin xüsusi söhbətləri ilə şərəfləndilər. Böyləcə

(mühacirlərdən və ənsarlardan, irəli olanlar) məalindəki ayəti-kərimə ilə mədh və sənaya qovuşdular. Yaxşıların əfəndisi vəfat etdikdən sonra ümmətin işlərini görən, Əshabi-kiramın böyüklərinin sözbirliyi ilə xilafətə gəldilər. Birinci xəlifə mağara arxadaşı Əbubəkr Sıddıq oldu. Bundan sonra xəlifənin təyini və Əshabi-kiramın qəbul etməsi ilə Ömər Faruq oldu. Ondan sonra altı kişi arasından sözbirliyi ilə Osman ibni-Əffan oldu. Daha sonra Allahın aslanı, arayanların aranılanı, şaşılacaq şeylərin xəzinəsi Əli ibni Əbutalib xəlifə oldu. Bu dört xəlifədən hər biri kəndi xilafətləri zamanında bir-biriləri ilə uyqun, hər türlü ayrılıq ləkəsindən təmiz idi. Qardaşlıq və birlik üzərə idilər. Hər biri İslam məmləkətlərini şirkdən və müşriklərin kinindən qorudular. Bu dörd xəlifədən sonra müsləmanlar iman və etiqadda birlik idi. Hər nə qədər zaman və əsrlər keçməsi ilə islam alimlərinin oruç, həc, zəkat və başqa yapılacaq işlərdə ayrılıqları oldusa da, fəqət inanılacaq şeylərdə və Rəsulullahı və onun Əshabını sevməkdə və həpsini xalis olaraq tanımaqda heç bir qüsur, əksiklik və pozuqluq olmadı. Şah İsmayılın ortaya çıxmasına qədər bütün İslam məmləkətləri böylə saf və təmiz idi. Sizlər səlim ağlınızla və təmiz qəlblərinizin irşadı ilə sonradan çıxarılan Əshabı-kiramı söymək və şiə olmaq yolunu çox şükür buraxdınız. Dini-islam sarayının dörd təməl dirəyi olan dört xəlifənin sevgisi ilə qəlblərinizi süslədiniz. Bunun üçün mən də bu söz verdiyimiz beş qərarımızı göylər kimi yüksək, qaraların və dənizlərin xaqanı, hərəmeyni-şərifeynin xidmətçisi, yer üzünün

ikinci Zülqərneyni, böyük İslam padşahı, qardaşımız, Rum məmləkətlərinin sultanına bildirməyi söz verirəm. Bu işi arzumuza uyqun olaraq bitirəlim. Bu yazdıqlarımız Allah təalanın yardımı ilə çabuq meydana çıxsın! Şimdi bu xeyirli işi qüvvətləndirmək üçün Mollabaşı Əli Əkbər və başqa yüksək alimlərimiz bir təzkirə yazdılar. Böyləcə bütün şübhə pərdələrini yırtdılar. Yaxşıca anlaşıldı ki, bütün bu iftiralar, bidətlər və ayrılıqlar, Şah İsmayılın çıxardığı fitnələrdən doğmuşdur. Yoxsa ondan öncəki zamanların hiç birində və İslamın başlanqıcında bütün müsəlmanların imanları, düşüncələri tək bir yolda idi. Bunun üçün Allah təalanın yardımı ilə və Onun qəlblərimizə sunması ilə bu şərəfli və yüksək qərarı almış bulunuruq. İslamiyyətin başlanğıcından ta Şah İsmayılın çıxmasına qədər bütün müsəlmanlar, xüləfayi-raşidini haqq, doğru xəlifə bilirdi. Hər birini haqlı olaraq xəlifə oldu bilirlərdi. Bunları söyməkdən, kötüləməkdən çəkinirlərdi. Xətib əfəndilər və böyük vaizlər minbərlərdə və dərslərdə bu xəlifələrin yaxşılıqlarını, gözəl hallarını, üstünlüklərini söylərlərdi. Mübarək ismlərini söylərkən və yazarlarkən ehtiramla yad edilərdi. Dərin alim və üstünlərin özü (Mirzə Məhəmməd Əli) həzrətlərinə əmr eylədim ki, bu Frmani şahimizi bütün ölkə şəhərlərinə yaysınlar. Millətim də eşitsin və qəbul eyləsin. Buna uymamaq, qarşı gəlmək, Allah təalanın əzabına və şahənşahın qəzəbinə səbəb olacaqdır. Böylə bilələr.[424]

[424] Hücuci-Qətiyyə- “Hak sözünün vesikaları” Hakikat Kitabevi, İstanbul-2008, s. 42-43-44.

Ancaq nə Səfəvilrdən, nə də Nadir Şahdan və nə də digərlərindən gələcək nəsillər üçün heç bir maddi-mənəvi sərmayə miras qalmamışdır. Savaşlar və yağmalarla dövlət budcəsi doldurulmuş və türklər sərmayə ürətimi qonusunda heç bir təcrübəyə sahib olamamışlar. Çünkü sərmayə ürətimi başqalarına buraxılmış və türklər, yalnızca savaş makinası kimi qullanılmışlar. Savaş teknolojisi gəlişdikdən sonra da türklərin qılıc savaşmalarına ehtiyac qalmamış, əlində heç bir sərmayə olmadan yazqısızlığa tərk edilmişlər. Günümüzdə də əlində sərmayə olan türklər sərmayə qazanımı sürəcində asimilə olmuşlar. Çünkü sərmayənin qazanım dili türkçə olmamış, türkçəyə ehtiyac bilə duyulmamışdı. Ona görə də qurduğumuz böyük dövlətlərin ürətim etkəni ya olmadı, ya da türklər orada yer almadılar. Modern tarixə girdiyimizdə əllərimiz bomboş idi. Nə əlimizdə bir şey var idi, nə də dilimizdə. Əsarətə təslim olmanın iki qoşulları mövcud idi. Nə beyin təcrübəsi vardı, nə ticari və iqtisadi təcrübə. Hızlı asimilasionun səbəbi də bu olmuşdur. Dirənəcək maddi-mənəvi gücümüz olmamışdır. Türkçə yazanlar da adam yerinə qoyulmamış. Füzuli türk dilini yüksəltmə zərurətini anlamışdı. Osmanlı rüşvətxorları doqquz ağçasını da vermədilər. O da Sultan Süleymana gözəl türkçə də “Şikayətnamə” adında bir məktub yazdı. Məktubuna cavab gəlmədi. Ehtiyac içində eşələnsə də türkçə yazmaqdan vaz keçmədi.

## Son söz

Atalar doğru söyləmişlər: “Niyyət hara, mənzil ora.” Heç bir millət yüzillər boyu bağrında daşıdığı niyətin dışına çıxa bilmir. Bəlkə istisnalar ola bilər. Örnəyin bugünkü Azərbaycan Cümhuriyəti Rus kolonizasionunun məhsuludur. Ora da İran tərkibində qalsaydı bugün Bakının əhalisi Tehrandakı kimi Fars dilli olacaqdı. Toplumları millət yapan onların tarixi və coğrafiyasi deyildir. Bunlar yan etkənlərdir. Toplumları millət yapan onların niyətləridir. Hər kəs əkdiyini biçər. Modern türk ulusçuluğu tarixin qaranlığında qalıb eşələnməməlidir. Bunları bilgi olaraq bilmənin zərəri yoxdur. Çağdaş türk ulusçuluğu toplumun bütün qatmanlarını içinə alacaq yeni bir niyət, yeni bir amac bəlirləyərək buna görə düşünsəl ürünlərini gerçəkləşdirməlidir. Bu yeni amaca doğru hərəkətin bir tək dili olmalıdır: Türkçə. Türkçələri dəyişik ağızlarına görə fərqli adlarla

səsləndirmək türk ulusunun modern niyəti ilə bağlaşmaz. Bu, türk dilinin və türk ulusunun tarixdən silinməsinə xidmət edər. Dilimiz türkçədir. Bütün varlığımızın, duyqusal və düşünsəl amaclarımızın yansıyış yeri türk dili olmalıdır. Atatürkün türk dilini Osmanlı və Osmanlıca əsarətindən qurtarma çabası yaxşı sonuc vermiş, Anadoluda türk dili öz yapısı üzərində gəlişmə və evrənsəlləşmə sürəci yaşamışdır. Sözdağarcığı genişləmişdir. Bu, kəndiliyindən bizim üçün bir fürsətdir. Türkiyədə dilin təcrübələri göz önündə bulunaraq hızlı biçimdə tək türkçəyə doğru hərəkət edilməlidir. Bunu başarmaq çətin iş deyildir, çox asandır. Yetər ki, bunu ulusal namus və milli heysiyət kimi alqılayalım. Hansı dildə oxumağımıza baxmayaraq anlatım, anlatışım və ilətişim dilimiz türkçə olmalıdır. İslamiyət də bunu deyir. Allah insanlığı fərqli qövmlər biçimində yaratdığını açıqca söylər. Qövmü bəlirləyən ana özəllik onun dilidir. Dilini itirib başqa millətin dilində düşünən adam etnik kimliyini də itirmiş olur. Bu da Tanrı iradəsinə qarşı davranmaqdır.

Səfəviyə dönəmindən başlayaraq toplumsal inancda yayqınlaşan “təbərra”, “təvəlla”, “təqiyə” kimi qavramlar və bu qavramların kültürəl ürünləri türkün modern niyətində yer alamaz. Bu qavramlar nifrəti, düşmənliyi çağrışdırmaqdadır. Evrənsəl insan haq və özgürlüklərinə qarşıdır. Bu qavramlar və bu inanc yalançı, fitnəkar, riyakar insanlar tərbiyə etməkdədir. Bu da toplumsal psikolojinin xəstələnməsinə olanaq sağlamaqdadır. Bu qavramların keçərli olması üçün ölkədə zülm,

fəsad, diktatorluq olmalıdır. Qorxu hakim olmalıdır ki, insan təqiyəyə sürüklənsin. Bu qavramlar qorxu və cinayət üzərində qurulmuşdur. Kitabımın axışı içində bu qorxunun necə şəkillənməsinin ayrıntılarını anlatdım. Modern Səfəviyə olaraq günümüzdə hakim olan Xomeynizm qorxu üstündə qurulmuşdur. Bu, onun “təbərra” və “təvəlla” anlayışından qaynaqlanır. Təvəlla və təbərra qavramları öz etibarını tarixdə qoruduqca Şah İsmayıl və Xomeyni kimi qatillər uyqun fürsətlərdə ortaya çıxacaqdır. İslamda irqçilik yoxdur, təvəlla və təbərra isə, açıqca irqçilikdir. Allah Hz. Məhəmmədə oğul versəydi və o oğullarından da evladlar törəsəydi, təbərra və təvəlla irqçiliyi daha geniş boyutlara ulaşa bilərdi. Peyqəmbərin soyu olmaz, olamaz. Peyqəmbərin vəhyə dayanan öyrətiləri olar və önəmli olan da budur. Yoxsa hamımız adəm soyundanız. Mövlana demiş, gözəl demiş və biz də Mövlananın bu deyişi ilə bitirəlim:

Biz ki, həp adəm soyundan gəlmişiz
İlk əzəldən varlığa sərpilmişiz.*

---

* Farscadan çeviri: Güntay. Şeirin tam tərcüməsinin burda verilməsi yaxşı olar:
Söylər olmuşlar ərənlər ol nəfəs
Göylərin sonsuzluğundandır bu səs
Ol fələklər seyrinindir kim bu saz
Söylər olmuş böylə tənburla boğaz
Biz ki, həp adəm soyundan gəlmişiz
Ilk əzəldən varlığa sərpilmişiz.
Böylədir sazlardakı ol inləyiş,
Anladar bir çox anımlar, dinləyiş
Şik*lə örtmüşsə bizi torpaq və su
Köksümüzdə var əzəllik duyqusu

08.03.2012

## “Səfəvilər” kitabına tamamlama

Ən önəmli sual budur: tarix nədir? Gerçək olan budur ki, insan tarixi mövcudluqdur. Yalnız insan tarixi mövcudluqdur. Belədirsə, olayların ortaya çıxışını tarixilik planında incələmək gərəkir. Günümüzü işğal edən tarixi olaylar və tarixi şəxsiyətlərə yüklənən saxta və qeyri-tarixi dəyərlər düşünmənin, inkişafın önündə ən böyük əngəldir. Tarix ərəbcə bir söz olaraq “ibrətli keçiş” anlamındadır. Hər hansı olaydan

---

Ol əzəl gündən olan səslər gəlir
Musiqi şəklində bizdə yüksəlir.
Şik-Başqurd Türkçəsində şübhə deməkdir.

ibrət dərsi alınmamışsa, o, tarix və tarixi deyildi. Günümüzdə öz xətalarını və basqılarını sürdürməkdə olan bir hadisədir. Xalqların və fərdlərin də azadlığını məhdudlaşdıran sırf bu olaydır. Özəlliklə Şərq xalqları keçmişin nostalgiyası içində duyğulanıb durmaqdan xoşlandıqlarından gələcəyə doğru yönəlmişlikləri olmaz. Çünkü gələcəyə doğru yönəlmişlik indiki zamanda yaradıcılıq və təlaş gərəkdirər. Modernitənin əsas gətirisindən biri həm fərdə, həm də millətlərə indiki zamanda yaşayabilmə cəsarəti verməkdir. Kantın "Düşünmə cəsarətin olsun!" fikri tənqid və etiraz cəsarətini də doğurar əlbəttə. İndiki zamanda yaşaya bilmək üçün düşüncə dünyasında və tarix mövzusunda tənqidi işbirliyi gərəkməkdədir. Tarixin determinist basqılarına qarşı düşüncə azadlığı önə çıxmalıdır. Toplum üçün final bir hədəf bəlli edilməlidir. Determinizm arxadan öz iradəsini tətbiq etməyə çalışarkən, finalitə isə öndən yeni oluşum və yenilik üçün imkanlar sağlar. Determinizm olmuşları gələcəyə daşıyar, finalitə yeni oluşum sağlar. Determinizm və finalizm indiki zamanda kəsişərək qarşılaşarlar. Sosial və tarixi dialektikanın da anlamı bu olsa gərək. Dünənlə sabahın bu gündə dialoqları. Yəni tarixdən gələnlə tarixdə olacaqların qarşılaşması. Toplumu millət edən isə, nə onun təbiətidir, nə də tarixi. Toplumu modern anlamda millət edən onun final hədəfidir. Bu tarixi gerçək bizim atalar sözümüzdə "niyyət hara, mənzil ora" şəklində özətlənmişdir. Ancaq atalar sözündə yayqın olan bu fəlsəfə milli-siyasi iradəyə təsir

etməmişdi. Əsas məsələ də budur. Modern anlamda millətləşmə dalğaları dünyada ortaya çıxdıqdan sonra istisnasız olaraq tarixlə düşüncədə və inancda hesablaşma gərəyi ortaya çıxmışdır. Millətlərin təkamülündə tarixi görüşlərin, baxış açılarının dəyişməsi və modernləşməsi böyük rol oynamışdı. Japoniyada, Almaniya. Rusiyada bunun örnəklərini görmək mümkündür və bu haqda tarix sosiologiyası üzərinə yazılmış bolca kitablar vardır.

Dünya tarixində belə nümunələr ortada ikən, nədən bizim sosial gerçəkliyimizdə də bu istiqamətdə düşüncələr ortaya qoyulmamalıdır? Azərbaycan türkləri olaraq bizim gerçəkliyimiz başqa millətlərinkindən fərqlidir. Quzey Azərbaycanda fərqli sosial və siyasi pozisiya, Güney Azərbaycanda da fərqli sosial və siyasi pozisiya mövcuddur. Bəlli tarixi hadisələrdən dolayı Quzey Azərbaycan Səfəvi tarix mühitindən ayrılmışdır. Ancaq yenidən o qaranlığa düşmə təhlükəsi var. Bunu "parçalanmış Azərbaycan" mərsiyyəsi ilə xatırlamaq da doğru deyil. Çünkü İran-Səfəvi mühitindən qopuş özü-özlüyündə bir qurtuluşdur. Çünkü Səfəvi tarixi mühiti sırf fars milliyətçiliyi ilə təchiz edilmiş, donatılmış bir ortamdır. O mühitdə türk milli kimliyi və milli şüuru doğa bilməz. Doğmamışdır da. Səfəvi dövləti qurulduqdan bəri İran türklüyü fikrən, hissən və inancda məğlub duruma düşmüşdür. Fikir və inanc sahəsindəki məğlubiyyəti ortadan qaldırmaq asan iş deyil. Modern dövlətə keçiş sırasında da fars milliyətçiliyi əsasında bir ölkə

təsis edildi. Çünkü bunun əsası Səfəvi dövləti qurulduqdan sonra qoyulmuşdu. Bir də tarixə bu açıdan baxmanın bir yararı olacağına inanıram. Nədən yalnız səfəvizədə mühitdə milli türk dövləti qurulmadı? Səfəvilərdən öncə Kitabi-Dədə Qorqud kimi əsər yaradan və öz tarixi milli xatirələrini bu şəkildə canlı tutan bu xalqa Səfəvilərdən sonra nə oldu ki, bütün keçmişini unutdu? Nə oldu ki, oğuz dastanları yerini Səfəvilərdən sonra Şahnamə, Kərbəlayilik, və Məşhədilik aldı? Səfəvilərdən sonra ərənlik, alpərənlik anlayışlarının yerini nələr almış? Səfəvilər zamanında təsis edilən "Hüseyniyyə"lərdə musiqimiz yas mərasimlərinə dönüşdü. Mərsiyə və növhəxanlıq musiqimizin ruhunu işğal etmədimi? Üzeyir Hacıbəyli Səfəvilərin "Hüseyniyyə"lərində "qina"nın yasaqlandığına işarə edər. Qina, zəngulənin yasaqlanmasıdır. Yəni insanın muzikal estetik səsinin həbs edilməsi. Üzeyir Hacıbəyli bu Səfəvi tabusunu musiqimizdə qırdı. Üzeyir Hacıbəylidən sonra başqa musiqi şəkli ortaya çıxdı. Ancaq baxsaq Güney Azərbaycana və İranın dəyişik yerlərində yaşayan səfəvizədə türklərə mərsiyyədən başqa heç bir şey yox. Hara getdi Dədə Qorqud qopuzu? Nə oldusa köklü bir dəyişiklik olmuş. Bu dəyişklik haqqında kitabda bilgi verilir. Bu istiqamətdə səfəviliyin rolu nədir? Səfəviyəti doğru-dürüst incələdiyimizdə dilimizin, kimliyimizin sapmasında onun böyük rolunun olduğunu görürürk. Millət olaraq bu istiqamətdə düşünməyimiz bizi modern dünyanın bir parçası edə bilər. "Səfəvilər" kitabı bu zərurət üzündən

yazılmışdır. İçinə düşdüyümüz bu kötü durumun tarixi kökləri bu kitab araşdırılmışdır. Gerçəkdən Səfəvilər adında “möhtəşəm!” bir Azərbaycan-Türk dövləti olmuşsa, o zaman nədən biz bu gündəyik? Haradadır Səfəviliyin mədəni, mənəvi və dil mirası? Nələr qalmış o möhtşəm tarixdən? 4-5 “Mən Heydər oğluyam” demək ədəbi miras sayılarmı? Haradadır gerçəkdən o “möhtəşəm!” səfəvi ədəbi, mədəni mirası? Hansı inanc şəklini bizə miras buraxmış Səfəvilər? Onların mirası üzərinə biz bir projə gəlişdirmək istəsək, İranda olduğu kimi farslaşarıq, yoxsa modernləşərikmi? Səfəviyət Quzey Azərbaycanı içdən-içə təhlükəyə sürükləyirmi? Bu təhlükənin fərqindəyikmi? Quzey Azərbaycanda sayıları artan ağbaş mollalar bir təhdid deyilmi ölkəmiz üçün? İslamda mollalıq qurumu olmamışdır, bu, sırf Səfəvi icadıdır.

Keçən əsrin əvvəlindəki bütün aydınlarımız istisnasız olaraq Səfəviyətə qarşı çıxmışlar. S. Ə. Şirvani, Həsən bəy Zərdabi, Rəsulzadə, Əhməd Ağaoğlu, M. Ə. Sabir, Nərimanov və digər bütün aydınlar. Seyid Əzim Şirvani bir neçə qəzəlində Səfəvi kültürünü tənqid atəşinə tutar. Bir qəzlində yazar:

“**Əli vəsfin qılırsan, çəkməsən həcvi-Ömərdən əl,**
**İlahi, xəsmin olsun ruzi-məhşərdə Ömər, vaiz.**”

Bu misralarda Seyid Əzim Şirvani minbərdə Hz.Əlini alqışlayıb, Hz. Öməri sürəkli lənətləyən Səfəvi molla tayfasına üz tutaraq deyir ki, sən Ömərdən daha yaxşı işmi görürsən ey Öməri

lənətləyən molla, umarım ki, o dünyada Ömərlə qarşılaşarsan.

Hüseyn Cavid səfəviliyi "ipsiz dəlilik" adlandırmış. Bugün Azərbaycan bayrağındakı İslamlaşma da antisəfəvi və dürüst bir İslam anlayışını çağrışdırmaqdadır. Səfəvilər tərəfindən fars milliyətçiliyi ilə iç-içə girən İslam anlayışı deyildir. Müsavatçılıq Azərbaycanda yenildikdən sonra Səfəvi heyranlığı oluşdurulmuş. 70 il Səfəvi heyranlığı və tarixi gerçəklərlə bağlılığı olmayan yalan və iftiralar xalqımıza milli tarix kimi təqdim edilmiş. Bu yalanların ifşası millət olaraq inkişafımıza səbəb ola bilər. Çünkü yalanların və iftiraların mühasirəsində bulunan milli şüur heç bir zaman çağdaşlaşa bilməz. Zatən çağdaşlaşmanın əsas amaclarından biri də tarixin qaranlıqlarını elmin, bilginin, fəlsəfənin işığı ilə aydınlatmaqdır. Uluslaşmaq istəyirsək, öz tariximizlə "Türkləşmək, çağdaşlaşmaq və İslamlaşmaq" məntiqi ilə üz-üzə gəlməliyik. Bu, özəlliklə İran-Səfəvi mühitində sürətlə asimilə edilən türklüyün qaranlığa gömülmüş düşüncəsini aydınlada bilər. Çünkü indiki İran İslam Rejiminin təməlini Şah İsmayıl atmışdır. Bugünkü dini qurumların strukturu Səfəvilər dönəmində qurulmuşdu.

"Səfəvilər" kitabı metafizik sistemləşdirmədən uzaq durmağa çalışan bir yöntəm gəlişdirmişdir. Çünkü biz "Şah İsmayıl haqq idi, içində imamların ruhunu daşıyırdı" dediyimizdə, artıq ağlın sual soruşma haqqını və düşüncəni susdurmuş oluruq. Tarix fəlsəfəsi bunu qəbul etməz. 13 yaşlı İsmayıl adında bir

çocuq ortadadır. Bir insan nə qədər dahi olsa da, 13 yaşında üstün tarix bilgisinə sahib ola bilməzdi. Burada ya gerçəkdən də Şah İsmayılın imam olduğuna və metafizik güclər tərəfindən ona yardım edildiyinə inanmalıyıq, ya da tarixi olquları ağlın ışığında dəyərləndirməliyik. Birinci durumu tarix fəlsəfəsi qəbul etməz. Belə inanacaq olarsaq, artıq sual soruşmaq da yasaqlanar. Şah İsmayılın özü belə, Çaldıran savaşında məğlub olduqdan sonra yenilməz imam olmadığına, ruhunda Allah iradəsini daşımadığına inandı. Uşaq ruhuna təlqin edilən yenilməzlik duyğusunu tamamən itirdi. Allah tərəfindən yönləndirilmədiyinə inandı. Çaldıran savaşından sonra ruhən öldü və onda fövqəladə təbiətüstü gücün olmadığına inandı. Ayrıca, tarix fəlsəfəsi bu növ yanaşmanı qəbul etməz, bunu xürafat sayar. Çünkü metafizik sistemləşdirmə düşüncəni və ağlı susdurmaqdır. Sual sormağı yasaqlamaqdır. O zaman bir tək gerçək ortada qalır: Şah İsmayıl adında 13 yaşlı çocuq pərdə arxasındakı güclər tərəfindən idarə edilmişdir. Onun çocuq ruhuna doldurulan fövqəladəliyə və mütləq haqlı olmağa Şah İsmayılı inandırmışlar. Bu yolda hər növ cinayət törətməyə, hətta anasını belə öldürməyə qədər ona səlahiyyətlər tanımışlar. Ona mütləq haq yolunda bütün əngəlləri ortadan qaldırmağı ilahi missiya kimi təlqin etmişlər. Ancaq bu mütləq haq, əslində yüzillər boyunca təcrübə qazanmış, ədəbiyat oluşdurmuş şuubiyyənin irançı mənafeyindən başqa bir şey olmamışdı. Bu kitabda pərdə arxasında Şah İsmayılı hazırlayan şuubiyyə amili üzərində durulmuşdur. Şuubiyyə, dağlarda

yaşayan və öndər arayan, aşırı dərəcədə lider mərkzli davranan Anadolu qızılbaşları vasitəsi ilə İran-fars kimliyini qurmaq istəmişdi. Bu haqda kitabda ayrıntılı bilgi verilmiş. Şuubiyyənin istəkləri Səfəvilərin sonrakı tətbiqatında əməldə özünü göstərir.

Sosial bir hərəkətdə toplumun yüksələn həyəcanının tarixi önəmi olmaz. Bu həyəcanlar qısa sürədən sonra sönər. Necə ki, İran inqilabında, sovet inqilabında kütləvi həyəcanlar söndü və qalarğı olan həyəcanların arxasındakı ideyalar oldu. Necə ki, qızılbaşlardan bir qismi varsaqlar kimi peşman olub geri döndülər. Sosial bir hərəkətdə o hərəkətin məğzi olan ideya incələnməlidir, çünkü qalarğı olan ideyadır. Səfəvi ideyası İranda türk tarixini işğal etdikdən sonra ərənlik, oğuz kimliyi türklük şüurunu tərk etdi və bunun yerini şaxsey-vaxsey tutdu. Kütləni saxta vədlərlə həyəcana gətirmək mümkündür. Şuubiyyənin uyduruq ideyasına yazıb-oxuması olmayan, sosial varlığı köçəriliyə dayanan və lidermərkəzli davranan qızılbaş kütləsi inanmışdı. Bu inanışın cəzasını sadəcə özləri çəkmədi. Bizlər də çəkməkdəyik. Şuubiyyə oyuncağı olan qızılbaş kütlənin qalxınması gələcək soyların da yazqısını çıxılmaz quyuya soxdu. Qızılbaşların Şah İsmayıla qarşı çıxıb onun təyin etdiyi fars valiləri terror etmələri göstərdi ki, onlar xəta etdiklərini anlamışlar. Ancaq artıq iş-işdən keçmiş və qızılbaşlar şuubiyyə ideyasının əsiri olmuş, tələyə düşmüşdülər. Qızılbaşların duyğuları, arzuları şuubiyyə məmuru olan Şah İsmayıl tərəfindən əsir alınmışdı. Fars-şuubiyə məmuru Şah İsmayıl

qızılbaşlar vasitəsi ilə farslar üçün bir ölkə təsis etməli idi və əsas plan da bu idi. Türk tarixində bütün dövlətlər bir boyun əsasında qurulmuşdur. Səlcuqlar Qınıq boyu, Osmanlılar Qayı boyu, Ağqoyunlular Bayındırlı boyu və... əsasında qurulmuşdur. Səfəvilər bu arada istisna təşkil etməkdədir. Yalnız Səfəvi dövlətinin qurucuları soylarını türklərə bağlamamış, ərəbə-farsa bağlamış və özlərini 7-ci imam Musa Kazım soyundan bilmişlər. Bu, əslində özünü Sasani soyuna bağlamaqdan başqa bir şey deyildi. Çünkü şüubiyə inancında Əlioğlu Hüseynin güya Sasani padşahının qızı olan Şəhrbanu adında qadını olmuş və imamət də bu qadından olan soydan törəmişdir! Şiə-şüubiyə məzhəbində sasani və peyqəmbər soyu “mehdi” varlığında davam edər.

Kitabda olay fenomenoloji bir yöntəmlə incələnmişdir. Şüura görünən şeyi incələməyə çalışan fenomenoloji metodun üç prinsipi vardır: 1- Olayı bilgilərinə görə incələr. 2- Olayı davranışlarına görə incələr. 3- Olayı ülküsünə (ideyasına, amacına) görə incələr. Səfəvilər kitabında səfəviliyin bilgiləri tarixi ayrıntıları ilə incələnmişdir. Bu istiqamətdə nə qədər başarılı olunmuşdur məsələsi başqa mövzudur. Şah İsmayılın din üzərinə bilgiləri sapıq bilgilərdi. Nifrət və kin çağrışdırırdı. Bu bilgiləri 900 il zaman ərzində şuubiyyə uydurmuşdu. “Səfəvilər” kitabında şuubiyyənin ideyası incələnir. Nədir bu ideya? Gerçəkləşən bu ideyanın “təbərra” (əhli-beyti sevməyənləri sevməmək və fürst olduğunda öldürüb Hz. Hüseynin intiqamını almaq. Sanki sünnilər əhli-

beyti sevməmişlər) və “təvəlla” (Əhli-beyti sevənləri sevmək) anlayışları nələr olmuş? Şah İsmayıl Lahicanda yetişmişdi. Özünü Sasani kimliyinə mənsub bilən kiçik bir dövlətin kontrolunda olan mühitdə yetişmişdi. Yəni şüubi mühitdə. Bu inanc və ideyalarla yetişdirilir. Onun üçün tək düşmən sünnilər idi və qətl edilmələri vacib idi. Bu nifrət duyğuları ilə yetişdirilər. Müsəlman türkləri qətl edərək türksüz bir Sasani İranı oluşdumağı bir inanc kimi Şah İsmayıla aşılamışdılar. Şah İsmayılın əzbər bildiyi Şahnamə misraları da bu görüşü ona təlqin etmişdi. Şahnamə tam olaraq bir şüubi kitabıdır. Çünkü türksüz bir İran təşkil etmək şuubiyyənin əsas hədəfi olmuşdu. Türksüz İranı təşkil etmək üçün Anadoluda Osmanlı ilə sorunlu olaraq yaşayan və şüubi Şeyx Heydərin təşəbbüsü ilə özünü qızılbaş olaraq tanımlayan türkləri də istifadə etmək olardı və belə də oldu. Fars tarixçiləri Şah İsmayılı möhtəşəm Sasani dövlətini yenidən quran dövlət adamı kimi görürlər və haqlıdırlar. Hətta İslam da Sasaniləşdirildi. Davranış, bilginin və ideyanın ortasında yer alar. Şah İsmayıl bu bilgilərə və onun ruhuna doldurulmuş ideyaya görə davranmışdı. Onun Təbrizdə, Şirvanda və digər türk yurdlarında törətdiyi soyqırımlar sırf bu üzdən olmuşdur.

İstər Azərbaycanda olsun, istərsə Türkiyədə olsun bəzi araşdırmaçılar İslam öncəsi türk gələnəyinin daha çox qızılbaş hərəkətində etkili olduğunu yazarlar və milli duyğulardan yola çıxaraq şuubiyyə-fars amilini görməyərək qızlbaşlığı möhtəşəm türk tarixi kimi təqdim

edərlər. İslam öncəsi türk tarixini araşdırmanın metodu ilə İslam sonrası tarixi araşdırmanın metodu kökündən fərqli olmalıdır. Bu insanlar öncə İslam öncəsi türk gələnəyini ideallaşdırırlar. Yəni öz xəyallarındakıları tarixdə varmış kimi göstərərirlər. Əslində isə, belə deyildir. Türk milləti Ziya Göyalpın da təsbitinə görə İslamın qəbulu ilə Şərq mədəniyyətinin bir parçası olmuşdu. Ayrıca, Ələvilik və qızılbaşlıq eyni olay deyildir. Qızılbaşlıq siyasiləşmiş və içi boşaldılmış ələvilikdir. Zatən ələvilərin hamısı da qızılbaşlaşmadılar. Bu gün də Anadoluda qızılbaşlıq yox dərəcəsindədir, ancaq ələvilik yayqın bir həyat şəklidir. Türk dilində mövcud olan dərin ədəbiyatın oluşmasında qızılbaşlığın heç bir təsiri olmamışdır. Heç bir ədəbi ürün ortaya qoymamış. Kaşqarlı Mahmud, Kitabi-Dədə Qorqud, Füzuli, Nəvai, Yunis Emrə və digərlərinin qızılbaşlıqla heç bir əlaqəsi olmamışdı. Qızlıbaşlıqdan bir ovuç şüarlardan başqa heç bir estetik dərinliyi olan ədəbiyyat miras qalmamışdı. Qızılbaş ədəbi mirasında bir tür aşırı dərəcədə irqçilikdə var. Bənihaşim soyu (imamların) dərindən dərinə övülər. Bir soy lənətlənər (Bəniüməyyə), digər soy alqışlanar. Bu baxımdan bu ədəbi mirasın hümanizmlə uzaqdan-yaxından əlaqəsi yoxdur. Islamiyətlə də əlaqəsi yoxdur. Çünkü İslamda irqçilik yoxdur.

Bir acı gerçəklə qarşı-qarşıyayıq. İranda türklüyün onurqasının qırılması və farsa təslim olması Səfəvilərlə başlamışdı. Bu sürəc davam edərsə İranda türk deyə bir varlıq qalmayacaq. Səfəvilərdən sonra bir tək ədəbi örnək ortaya

çıxmamışdır. Bir Dədə Qorqud səviyəsində ədəbi və milli örnək, ya da Bayındırlı zamanında türkçəmizə tərcümə edilmiş Quran kimi bir örnək olmamışdır. Bayındırlı dövləti tərəfindən Quran türk dilinə tərcümə edilir, Kitabi-Dədə Qorqud kimi əsərlər Bayındılrı mədəniyyətinin məhsuludur. Şah İsmayılın sünni ədəbiyatı yandırdığı sıralarda bunların çoxu yox olmuş.

"Səfəvilər" kitabında tarixi sənədlər eynidir. Tarixi bəlgələri başqa kitablarda da görə bilərik. Ancaq bu bəlgələrdən yola çıxaraq ortaya qoyulan açıqlamalar modern yöntəmlə edilməyə çalışılmışdır. Bizim tarixçiliyimiz üçün də önəmli olan budur. Tarixin hermenevtiyi necə edilməlidir? Bu, çox önəmli bir sualdır və bu haqda bizim tarix bilgilərimiz modernliyə dayanmalıdır. Nədən yalnız səfəvizədə türklər milli kimlik və milli dövlətdən məhrum durumdalar? Bugünkü Azərbaycan Respublikasının milli dövlət olması da bir təsadüfün nəticəsi. Səfəvi mühitində qalsaydı bu da olmayacaqdı. Bunu Rəsulzadə açıqca etiraf edər. Ancaq tarix və zamanların axışı doğruları ortaya çıxaracaq. Kitabda bu acı gerçəyi isbat etməyə çalışmışam: Səfəvilərdən sonrakı dönəmdə ayağımızı basdığımız mənəvi məkan möhkəm olmamış, bu məkan fars duyğu və düşüncələri ilə eləsinə doldurulmuş ki, Səttar Xanlar, Xiyabanilər və digər Azərbaycan türkünün tanınmış adamları fars milliyətçliyinin yolunda canfəşanlıq etmişlər. Ancaq bu gün sadəcə İran-səfəvi mühitində Azərbaycan türkləri fars milliyyətçiliyinə yem edilmirlər. Azərbaycan Respublikasında da səfəviyət

dövlətçiliyimiz üçün bir təhdid oluşdurmaqdadır. İran, Azərbaycan Respublikasında təhlükə törədə bilməsi üçün şiə-şuubi-səfəvi geopolitikasını qullanmaqdadır. Bu, yalnızca indiki durum deyil. 1918-ci ildə Azərbaycan adında dövlət qurulduğunda Səfəvi varisi İran dövləti və hətta Səfəvi mollası Şeyx Məhəmməd Xiyabani də buna qarşı çıxdı. Bu mövzular üzərinə düşünmək “uzman” tarixçilərin işi deyildir. Bu, milli bir savaşın intellektual oluşumudur. Tarixin modern düşüncə süzgəcindən keçərək dəyərləndirilməsi modern millətləşmənin zərurətlərindən biridir. Iranda türklük şüurunun doğması və Türk Dünyası ilə inteqrasiyaya girə bilməsi üçün Səfəvi problemi çözülməlidir. Önəmli olan düşüncəmizi öz əsarətində saxlayan tabuları qırmaqdır və bu kitab sırf bu amacla yazılmışdır.

07.06.2012

## ”Səfəvilər” kitabı üzərinə söyləşi

**Səfəvilər haqqında araşdırmalara necə başladınız? Hansı ehtiyacdan yarandı səfəvi araşdırmaları?**

Ağlımda suallar var idi. Bu suallara tarix planında cavab tapmaq istəmişdim. Tarix yazarlıq Qərb aydınlanma kültürünün məhsuludur. Şərqdə belə bir olay olmamışdır. Tarix fəlsəfəsi və tarixdə ideyaların mahiyətini və gerçəkləşmə sürəcini araşdırmaq kimi bir yöntəm Şərqdə olmamışdır. Şərqdə mövcud düzəni tarixi olaylar dəstəkləyirsə, o tarixi olaydan yapışıb qopmama düşüncələri ürətilir. Düşüncəni hərəkətləndirən deyil, düşüncəni susdurucu bilgilər ortaya qoyulur. Tarix bu şəkildə insanların düşüncəsini əsir alan bir zindana çevrilmişdir. Mən, özəlliklə İranda və Azərbaycanda insanlarımızın dünyagörüşünü öz zindanında həbs edən bu tarixə qarşı etiraz etmək istədim. Bizim və insanlığın ən qorxunc

qaranlıq tarixi mərhələlərindən biri Səfəvilər dönəmidir. Çünkü bu qaranlıq həm İranda, həm də Azərbaycan Respublikasında öz təsirini sürdürməkdədir. Burada bilgi və iqtidar münasibətini ələ almaq gərəkir. İrandakı rejim Şah İsmayılın mənəvi, məzhəbi və siyasi varisidir. İqtidar imkanlarını əllərində bulunduran rejim Səfəviyətə qarşı sual sorma, sorğulama metodunu yasaqlamışdır. Çünkü bu iqtidar nemətlərini onlara Şah İsmayıl bağışlamışdır. Azərbaycanda Respublikasında isə Səfəvi qaranlığı ilə bağlı fərqli pozisionlar ortaya çıxmışdır. 1828-ci il "Türkmənçay" müqaviləsi ilə Qafqaz Rusiyanın idarəsinə keçər. Bu, Qafqazda yaşayan Türklər üçün tarixi bir şans və Səfəvi qaranlığından qurtulmaq üçün bir fürsət olmuşdur. Çünkü qurtuluş düşüncələri və görüşləri böyük qopuşlarla ortaya çıxar. Bir yerə bağlanıb qalmaqla yenilik və yeni fikirlər doğmaz. Qopuşlar aydınlanmanın şərtidir. Yeni bir pozisiona qovuşmaq üçün əski durumdan qopuş düşüncəsini ağlımızda daşımalıyıq. Bu, dəyişimin ən bəsit tərifidir. Biz əskilərdən qopa bilmədiyimiz üçün Səfəvi İranında yox oluruq. Dilimiz, kimliyimiz silinib gedir. Tarixi Səfəvi mühitindən qopuş Qafqaz üçün fərqli düşünmə imkanı yaratdı. Özəlliklə Rusiya və rus dili vasitəsi ilə Qərbləşmə meylləri ortaya çıxdı. Bizim dilimizdə Səfəvi mərsiyəsi və növhəsindən başqa heç bir şey yox idi. Səfəvilərdən qalan bu idi. Rus dilini bilmələri səbəb oldu ki, Səfəvi mərsiyə və ağlaşma ədəbiyatının dışında başqa ədəbiyat da oxusunlar, modern bilgilərlə tanış olsunlar. Bəzi aydınlar düşünməyə başladılar.

Demək olar ki, 19-cu əsrin sonlarına doğru və keçən əsrin əvvəllərində güclənərək 1918-ci ildə milli dövlət quran və ya fikrən bu quruluşda iştirak edən bütün aydınlar tarixi İran coğrafiyasında yaşayan türklərin bədbəxtliklərini Səfəvilərdə görmüşlər. H. Zərdabi, Rəsulzadə, H. Cavid, Ə. Ağaoğlu, M. Cəlil və... Onların ortaya atdıqları islamlaşma da Səfəviliyin İslam anlayışına qarşı olmuşdur. Ancaq Sovet rejimi Azərbaycanda qurulduqdan sonra tarixə milli baxış bucağı ortadan qaldırıldı və sovet görüşlərinə uyğun baxış gətirildi. Karl Marksın Şah İsmayıl haqqında anlamsız bir cümlə söyləməsi üzündən Səfəvi dövlətinin qurucusu, Azərbaycan aydınlarının tənqidlərinə baxmayaraq, göylərə qaldırıldı. Milli kimliyimizdə türklük anlayışının yerinə azərbaycanlılıq yerləşdirildikdən sonra səfəviyət daha da qabardıldı. Çünkü Azərbaycanı türklüyündən qoparmaq üçün səfəvilik yaxşı bir amil idi. Moskva bunu təşviq edirdi. Yoxsa Moskvaya zərəri olsaydı Sovet dönəmində bu qədər şah İsmayılı tərif edən əsərlər yazılardımı? Şah İsmayılın sovet Azərbaycanında şişirdilməsi, müqəddəsləşdirilməsi lazım idi. Çünkü Moskvanın Türk Dünyasını və Türk kimliyini parçalama niyyətinə Səfəvi kimliyi xidmət etməkdə idi. Sovetlər Azərbaycanı Türk kimliyi istiqamətində deyil, İrani kimliyin daxilində bilgiləndirmək istəyirdi. Bu üzdən də Şah İsmayıl adında parçalayıcı bir amili əfsanəvi qəhrəmana dönüşdürdülər. Tarixlə heç bir əlaqəsi olmayan yalan uydurub xalqa inandırdılar ki, Şah İsmayıl Azərbaycan imperatorluğu qurmuş və

”Azərbaycan dili!”ni də dövlət dili etmiş! Bunların hamısı sovet yalanı və iftirasıdır. Hardadır o dilin ədəbiyatı? Nədən bütün Səfəvi dövrünün tarix kitabları farsca yazılmış? Bir məktubun harasa Türkçə yazılması Səfəvilərdə dövlət düzənində irtibat dilinin Türkçə olması anlamına gəlməz. Sovetzədə Azərbaycan tarixçiləri, şairləri, yazıçıları bol-bol yazıb və bu yalanı xalqa doğru kimi qəbul etdirməyə çalışdırlar və başardılar. Yalan doğru kimi qəbul etdirildi. Ancaq yalan ayaq tutsa da yeriməz. Mən isə, bu yalanı ifşa etdim. Azərbaycan və İran Türklərinə dedim ki, sənin düşüncələrinin təqlidə və fars irqçiliyinin saxta İslam anlayışına gömülmə tarixi Şah İsmayılla başlamışdır. İsbat etdim ki, Şah İsmayıl dilimizi dövlət dili etməmiş. Tam tərsinə Kitabi-Dədə Qorqud kimi əsərlərimizi və Quranın Türkçə tərcüməsini sünni ədəbiyatıdır deyə hamısını Təbrizdə kitab yandıma olayında yandırmış. İsbat etdim ki, Şah ismayılın farsların əmri üzərinə yandırdığı və yox etdiyi Bayındırlı mədəniyəti səviyəsində Səfəvilər milli mədəniyətimizə yararlı olmadılar. Bütün Türk şəhərlərini yandırıb yox edib fars şəhərlərini abad etdilər. Həm də Şah İsmayılın öz zamanında. Şirvanda, Təbrizdə Şah İsmayılın Türk soyqırımı törətdiyini qaynaqlarla göstərdim. Azərbaycanın və İran Türklərinin qarşısında bir tək önəmli əngəlin Şah İsmayıl olduğu düşüncəsini şəkilləndirməyə çalışdım. Çünkü Şah İsmayıl həm İslamı parçaladı, həm də Türklüyü. Səlcuqludan Səfəvilərə qədər Türk-İslam mədəniyəti oluşmuşdu. Hamısını tarixdən

silib yerinə Sasani-İslam anlayışını və Sasani kimliyini yerləşdirdi.

**Tariximizin çoxlu araşdırılmamış sahələri var. Səfəvilər haqqında isə çoxlu kitablar, tarixi araşdırmalar var. Nə üçün siz fərqli baxış ortaya qoymağa çalışdınız?**

Səfəvilər haqqında çoxlu kitab yoxdur məncə. Səfəvilər haqqında mədhiyələr var. Bunlara kitab deyilməz. Bunların hamısı yalan və iftira. Bir tək elmi və tənqidi əsər yazılmamış Səfəvilər haqqında. Azərbaycanda Səfəvilər haqqında yazılan tarix kitabları, hətta Səfəvi qaynaqlarının verdiyi məlumatı da təhrif etmiş. Örnəyin ”Tarixi-aləm arayi abbasi”, ”Əhsən-üt təvarix”, ”Rövzət-üs Səfəviyə”, ”Şərəf namə” kimi Səfəvilərin özlərinin yazdığı qaynaqlar Şah İsmayılın öz anasını öldürdüyünü, Şah İsmayılın 12 imam adına 12 nəfərdən ibarət adam yeyən ”çegin” adlı dəstələr təşkil etdiyini yazarlar. Bunların heç birisinə Azərbaycanda yazılan kitablarda işarə edilməmişdir. Nədən? Belə tarixçilikmi olar? Gerçəkləri gizlətmək tarixçilikdirmi? Şah İsmayılın təşkil etdiyi ”təbərra” dəstələrinin Təbrizdə necə soyqırım törətdiyini Səfəvi qaynaqları özləri yazır. Bunları Sovet Azərbaycan tarixçiləri xalqdan gizlin saxlamışlar. İndi xalq da yalançı Şah İsmayıl adında bir qəhrəman surətə elə inanmış və inandırılmış ki, ona deyəndə ki, Şah İsmayıl anasını öldürmüş, soyqırım etmiş, kimsə inanmır. Ancaq həqiqəti biri çıxıb söyləməli idi. Bu üzdən də mənə görə Azərbaycanda Səfəviləri

Moskvanın istəyi üzərinə mədh etmişlər, tarix yazmamışlar. Mənsə heç bir iqtidar üçün yalan bilgi toplamayan azad Türk insanı olduğumdan bu yolda araşadırmalarımı kitablaşdırdım. Yalnız kitabı xəstə halımla yazdım. Birdən xəstəlik məni ayaqdan salar və bu düşüncə tariximizə girməz deyə kitabı doğru-dürüst redaktə etmədən çap etdirdim. Bu üzdən kitabda bəzi qüsurlar var. İkinci nəşrdə bu əksikliklər olmayacaq.

**Şah İsmayılın qəhrəman, hökmdar və mömin obrazına ciddi zərbə vurmusunuz. Sizcə buna ehtiyac var idimi?**

Bertolt Bereşt´in belə bir sözü var: ”Doğrunu bilməyən cahildir. Doğrunu bilib susan isə xaindir.” Şah İsmayıl haqqında doğruları bilmədiyim sürəcə cahil idim, deyəcək sözüm yox idi. Doğruları bildikdən sonra sussaydım öz vicdanımda bir xain kimi yaşayacaqdım. Doğru isə Şah İsmayılla Azərbaycan və İran Türklərinin tarixi yönünün sapdırlması olmuşdur. Doğru olan budur ki, Şah İsmayılla Oğuz Türklüyü parçalandı, İslama şirk qatıldı. Müqəddəslərin sayı artırıldı. İslamda tək müqəddəs olan Allahdır. Şah İsmayılla eyni zamanda hər kənddə bir pir məzarı quruldu. Millətin mənəviyatını və parasını bu yolla sömürdülər. Mirzə Cəlilin bütün yaradıclığı bunu tənqidə yönəlmişdi. Təbrizin iki dağının başına belə, iki imamzadə dəfn etdilər. Ölkəmiz imamzada məzarlığına, imamzadaların qaranlığına gömüldü. İslamda imamzada deyə bir şey varmı? Yoxdur. İslamda məzarları ibadət

amacı ilə ziyarət etmək qəbul edilməzdir. Səfəvilələr isə, bütün ölkəmizi saxta imamzadalarla doldurdular. Şah İsmayıl peyğəmbərin namusu olan Hz. Ayişəni sayqısızca sözlərlə anımsarkən ölkəmizi saxta imamzadalarla doldurdu. Şah İsmayıl bizi elə bir qaranlığa gömmüş ki, tək çarə bu saxta qəhrəmana qarşı savaşmaqdadır. Peyğmbərin ən yaxın dostları olan Hz. Əbubəkir, Hz. Ömər Şah İsmayıla görə xainmişlər, ancaq min ildən sonra imamzadalar müqəddəsləşdirilir. Şah İsmayıl bunları gətirməmişmi? Gətirmiş. Və bu, düşüncənin susduruluşu və millətin inancının sapdırılışı deyilmi? Sual budur: Qəhrəman kimdir? Qəhrəman millətin tarixinə aydınlıq saçandır, yoxsa millətin tarixini qaranlığa gömən? Kimdir gerçkdən qəhrəman? Bizim düşüncəmizin aydınlanması və cahanşümullaşması üçün önümüzdə tək əngəl bu saxta qəhrəman olan Şah ismayıldır. Ölkəmizi, dövlətçiliyimizi devirib farslara təslim edən və sadəcə İran və Azərbaycan Türklərini deyil, bütün İranı da qaranlığa gömən şah İsmayıldır. İranda təqribən 2 milyon sünni Türkmən var. Onlar asimilə olmurlar. Ancaq səfəvizədə türklər könüllü asimilə olurlar. Fars milliyətçiliyinin modern ideologiyasını da səfəvizədə türklər yazdılar. Bugünükü Xomeyni istibdadı və dikatorluğu da Şah İsmayılın mirasıdır. Sizə bir örnək söyləyəcəyəm. Baxın, Azərbaycan Respublikasında şah ismayılçılara. Çoxu bilərək və ya bilməyərək irançı. Bunun əsasını qoyan Şah İsmayıldır. Şah İsmayılın gətirdiyi düzəndə Türklüyə yer yoxdur. Bu düzən

Sasani nostalgiyası əsasında gəlişdirilmişdir. Səfəvilik kitabımda da açıqladığım kimi şüubi təcrübənin məhsuludur. Hələ Azərbaycan 20 ildir müstəqil olmuş. Bu, çox uzun zaman deyil. Qarşımızdakəı illərdə bütün şah ismayılçılar İran mollalarının könüllü əsgərləri olacaqlar. Çünkü İslamda təqlid yoxdur. İslamda "iman və seçim" var, "iman və təqlid" yoxdur. İman və təqlid kültürünü Şah İsmayıl gətirmiş. Bu inanc düzəninə görə Azərbaycan Respublikasının vətəndaşları hansısa bir İran mollasına təqlid etməlidirlər. Bu görüşlə necə milli dövlət qura bilərik? Sənin vətəndaşlarının dini duyğuları İran mollalarının əlində olacaqsa, o zaman milli dövləti hansı insanlarla quracağıq? Səttar Xan da, Xiyabani də səfəvizədə idilər. Səttar Xan da əsla qəhrəman deyildi. Bunu da sovetlər qəhrəman etmiş. Qəhrəmanın düşüncəsi olmalıdır. Səttar Xan deyirdi ki, mənim düşüncəm yoxdur, sadəcə Ayətullahlar cihad əmri vermişlər və mən sırf bu üzdən savaşıram. Belə qəhrəmanmı olar? Ya da Xiyabani bolşevik tərəfdarı idi. Güney Azərbaycanda ermənilər Türkləri qətl edirdi. Xiyabani buna etiraz etmirdi. Ancaq elə ki, Osmanlı-Türk ordusu Güneyə girdi və bu qətlləri durdurdu o zaman Xiyabani Türk ordusunu işğalçı adlandırdı. Nədən? Çünkü səfəvizədə bir molla üçün erməni, sünni müsəlmandan daha yaxşıdır. İndi bunları biz necə qəhrəman adlandıra bilərik? Xiyabani də bolşevik tərəfdarı olduğu üçün sovet zamanı qəhrəmanlaşdırıldı. Nə yazıq ki, ya da çox təəssüf ki, Elçibəy də Xiyabanini Rəsulzadə kimi milli qəhrəman adlandırır. Bunlar yanlışdır.

Rəsulzadə türkçü idi, Xiyabani irançı və farsçı. Bu üzdən də tarixi doğruları bilməyən xalq heç bir şəkildə irəliyə doğru inkişaf edə bilməz, öz tarixinin qaranlığında burxulub qalar. Düşüncələrimizlə yalanlara qarşı etirazetmə cəsarətimiz olmalıdır. Bunun üçün tariximizdəki yalan və iftiraları ifşa etmək gərəkir.

**Müasir İran reallığında səfəvilik hansı formada davam edir? Bu gün səfəvi idealogiyası davam edirmi?**

Səfəvilərdən sonra İran qaranlığa gömüldü. Ortada bir Nadir Şah bu qaranlığa qarşı çıxdı. Ancaq onun da görmək istədiyi işi yaraımçıq qaldı, öldürüldü. Bugün mənim sadəcə bir kitabıma görə bu qədər narahat olub üzülən varsa, görün Şah İsmayıl mirasını ortadan qaldıran Nadir Şah necə böyük insanmış və necə böyük iş görmək istəyirmiş. Sovetlər və İran Nadirin bu təşəbbüsünün bilinməsini istəməzdilər. Sanki tariximizdə Nadir Şah Olmamış. Çünkü Nadir Şah tam anlamı ilə şah İsmayıl düşməni idi. Nadirin işi yarım qaldı və Səfəvilik öz həyatına günümüzə qədər davam etdi. İran məşrutə hərəkəti də modern səfəvilikdən başqa bir şey deyildi. Pəhləvilər, eləcə də Xomeyni tam anlamı ilə mükəmməl modern bir Səfəvi modelidir. Çünkü İslamda mollalıq qurumu deyə bir şey yoxdur. Bunu təsis edən də Şah İsmayıl olmuş. Şah İsmayıl Livandan şiə mollalarını Təbrizə gətirib və iqtidarın mənəvi legetimliyini onlara buraxdı. Daha sonra davam edən bu molla axını Səfəvi iqtidarını paylaşdı. Özlərini güya qeybə çəkilmiş

Mehdinin nümayəndəsi saydıqları üçün Səfəvi şahları belə iqtidarlarının legetimliyini onlardan almalı idilər. Mollalar feodallaşdılar. Dövləti ələ keçirdilər. Günümüz İran molla rejiminin əsasları, dövlət və dini strukturları Səfəvilər dönəmində şəkillənmişdir. Bunu İran molla rejiminin önəmli ismləri açqıca söyləməkdədirlər. “Biz Səfəvi varisləriyik” deyirlər. Səfəvilərdən sonra düşünmək yasaqlandı. Əgər Dekart “düşünürəm elə isə varam” deyirdisə, Səfəvi mollalıq qurumu “düşünmürəm, təqlid edirəmsə varam” anlayışını yayqınlaşdırdı. Mollalar Səfəvilərdən etibarən millətin namusuna, malına sahib oldular. Millətin də tarix şüuru söndürüldü və təslim oldu. Mollaların fitvasına təslim oldu. İran-İraq savaşında Xomeyninin çağrısı üzərinə yüzminlərcə Türk könüllü olaraq gedib savaşda öldü, yaralandı, müharibə atəşlərində yanıb yox oldu? Nədən könüllü? Çünkü səfəvilik bizim düşünən ağılımızı kor etdi. Səfəvilərdən sonra biz mollalara yem edildik. Gəncliyimiz, bütün varlığımız mollaların əlində oldu. İstədikləri kimi qullandılar. Sanki biz yaradılışdan mollalara yem edilmək üçün yaradılmışıq. Əgər Şah ismayıl 1501-ci ildə Təbrizdə 20 min Türkü sünni olduqları üçün qətl etdisə, Xomeyni də 1987-ci ildə 70 min insanı fərqli görüşündən dolayı qətl etdi. İndi insan haqları təşkilatları Xomeyninin törətdiyi bu qətli araşdırır. Qətldə əli olanları imkan daxilində məhkəməyə çıxaracaqlar. Biz də modern insanlar olaraq Şah İsmayılı milli və insani şüurumuzun məhkəməsinə verməliyik. Bu qatilin gerçək kimliyini və davranışlarını ifşa

edərək bəşər tarixinə təqdim etməliyik. Bir çox millətlər bu işi görürlər. Bu işi görmənin yararı ondadır ki, gələcəkdə də Şah İsmayıl və Xomeyni kimi qatillərin tarixə girməsinin qarşısı alınmış olar. Bugünkü İran İslam rejiminin ideologiyası Şah ismayıl tərəfindən ortaya qoyulmuşdur.

**Türkiyədəki və dünyadakı ələvilərin səfəvilərə nə qədər bağlılığı var?**

Ələvilik tarixi etibarı ilə fars islamçılarından çox etkilənmişdir. Ələvilikdə əski türk gələnəyinin olmasının yanı sıra fars İslam anlayışının da etkisi çox güclüdür. Ələviliyin sadəcə dili Türkçə olmuşdur. Mahiyəti Sasani mərkəzli İslam anlayışından çox etkilənmişdi. İsmaililik ələviliyi çox etkiləmişdi. Ancaq ələvilik qızılbaşlıq deyil. Qızılbaşlıq sapdırılmış, siyasiləşmiş ələvilikdir. Ələvilər sünni şəriətinə qarşı şəriətlə yönətilməyən bir dövlətdən yanaydılar. Bunun kökləri çox əskilərə, Səlcuqlara qədər dayanmaqdadır. Ələvi İslam anlayışı ilə dövlət İslam anlayışı sürəkli toqquşma halında olmuşdur. Anadoluda ələvilərin özlərinəməxsus tarixləri var. Ələvi fikirlərinin olqunlaşmasında Şeyx Bədrəddinin böyük rolu olmuşdur. Şah İsmayıl ələvilərə xəyanət etdi. Ələvilər yurdularını buraxıb Azərbaycana axındılar. Dövlət qurulduqdan sonra 1508-ci ildə Şah İsmayıl “lalalıq” qurumunu ləğv edib yerinə farsca bir ifadə yerləşdirdi və farsları işbaşına gətirdi. Valiləri fars olaraq təyin etdi. Buna etiraz olaraq qızılbaşlar Şah İsmayılın təyin etdiyi valiləri

öldürdürlər və sonra şah İsmayıl da o qızılbaşları öldürdü. Yəni qızlbaşlar dünyagörüşü farsçılıqla təchiz edilmiş olan Şah İsmayıl tərəfindən yeni Sasani dövlətini qurmaq üçün qullanıldılar. Daha sonra da qızılbaşlardan əsər-əlamət qalmadı. Şah Abbas onları şahsevənləşdirərək saraydan uzaqlaşdırdı. Obalarda, kəndlərdə yerləşdirdi və dövlət tam olaraq farsın kontroluna keçdi. Qızılbaşların vizionu yox idi. Öndərmərkəzli düşünən bir ideologiyanı mənimsəmişdilər. Şah İsmayılı zühur edən Mehdi kimi qəbul edib ona inanmışdılar. Pərdə arxasında 13 yaşlı çocuq olan Şah İsmayılı qullanan, yönətən fars tarixi planından xəbərsiz idilər. Fars tarixi planı da Şah İsmayıl əli ilə lidermərkəzli davranan qızlbaşları qullandıqdan sonra onları tarixdən sildi. İndi qızlbaşlıq deyə heç bir şey yoxdur. İranın, Azərbaycanın dəyişik yerlərində "goran", "əhli-həq" adları ilə qeyri-siyasi və passiv həyat sürməkdədirlər. Əlbəttə qızılbaşlar bunu daha sonra anladılar. Ancaq artıq çox gec idi. İş-işdən keçmişdi. Bu üzdən də varsaqlar kimi bir qismi bu fəlakəti anladıqdan sonra Anadoluya geri döndülər. "Öfkə ilə qalxan zərərlə oturar" demişlər. Ələvilər düşüncəsizcə öfkələnib qızılbaşladılar, sonra da hər şeylərini itirib tarixdən silindilər. Heç bir mənəvi miras öz soyları üçün buraxmadılar. Tarixdə buna bənzər örnək olmamış ki, bir etnos qalxıb özünü yox edərək başqa millət üçün dövlət qurub sonra da tarixdən silinsin. Nədən? Çünkü qızılbaşlıq ideyası Türk düşmənliyi əsasında şəkillənmişdi. Şeyx Heydərin qızılbaşlıq ideyası Türkləri qəbul etməzdi. Tarixdə qurulan bütün Türk dövlətləri

bir Türk boyu əsasında qurulub böyümüşdü. Səlcuqlar Qınıq boyu əsasında, Osmanlı Qayı boyu əsasında, Ağqoyunlu bayındırlı boyu əsasında və... Yalnız Səfəvilər ortada bir istisna təşkil etməkdədir. Səfəvilər soylarını farsa və ərəbə bağlayırdılar. Çünkü onlar deyirdilər biz 7-ci imam Musa Kazım soyundanıq. İmamlar Hz. Hüseyn soyundan törəmiş. Bir əfsanəyə görə də Hüseynin Şəhrbanu adında bir fars qadını olmuş və imamlıq bu qadından törəmiş. Ancaq kimsə sormamış ki, İmam hüseyn bu fars qadınla hansı dildə danışırmış? Bunların hamısı uydurma və yalan, Hüseynin Şəhrbanu adında qadını olmamış. Səfəvilər də bu yalan üzərində bir ideologiya gəlişdirdilər və soylarını farsa-ərəbə bağladılar. Şiənin qeybə çəkilmiş imamı olan Mehdi də qanında Sasani və peyqəbər qanı daşıdığı üçün əbədiyətə qədər, ya da güya Mehdinin zühuruna qədər Sasani-Fars soyu müqəddsələşdirilir. Yəni Səfəvilik belə təhlükəli və kin dolu bir ideologiya olmuşdur. Qızılbaşlar farsların bu tarixi planını anlaya biləcək səviyyədə və bilgidə deyildilər. Onların kitbaları da yox idi. Saz çalıb oxumaqla dövlət yönədilməz ki. Ona görə də şiə fiqh kitabları qızılbaşlığı tarixdən sildi. İndinin özündə də Türkiyə ələvilərində İran simpatiyası var. İran-İraq savaşında ələvi ictimai rəyi İranı dəstəkləyirdi.

**Sizin araşdırmalardan sonra deyə bilərikmi ki, Şah İsmayıl qəhrəman deyil?**

Baxır biz hansı bucaqdan baxaq bu qəhrəman anlayışına. Fars tarixinin

qəhrəmanıdır Şah İsmayıl. Fars tarixçilər Şah İsmayılı qəhrəman görər və Şah İsmayılı Sasaniliyi yenidən dirildib və İranın bütövlüyünü bərqərar edən qəhrəman kimi dəyərləndirərlər. Mənə görə haqlıdırlar da. Fars tarixçilər Şah İsmayılı “fətrət” dövrünü qapadan qəhrəman kimi görürlər. Fətrəti də Sasani və Səfəvi arasındakı 900 illik zaman boşluğu kimi düşünməkdədirlər. Yəni bu 900 ildə İran Sasani dönəmindəki bütövlüyündən məhrum olmuşdur. Şah İsmayıl bu bütövlüyü qurdu. Haqlıdırlar. Çünkü Şah İsmayıl gerçək anlamda bir Sasani dövləti qurdu. Varisləri də bunu gücləndirdi və indiki rejim də Sasani-Səfəvi kimliyi ilə qürur duymaqdadır. Çünkü Şah İsmayıl Dədə Qorqud mədəniyətini ortadan qaldırıb yerinə Şahnamə tarix anlayışını yerləşdirdi. İddia edirlər ki, Şah İsmayıl ora-bura Türkçə məktub yazmış. Bunlar ilk günlərdə qızılbaşları aldatmaq üçün idi. Bütün Səfəvi dönəmindən qalan türkçə yazıları bir yerə yığsanız 50 səhifəlıik bir kitabça olmaz. Ancaq yüzlərcə və bəlkə minlərcə fars dilində tarixi, ədəbi, siyasi, məzhəbi, idari bilgilər kitablaşaraq miras qalmış. Türk millətinin Şah İsmayıl adında qəhrəmanı ola bilməz. Çünkü Türk Dünyası arasında məzhəb sınırı yaratdı. Anadolu və Türküstan arasında tarixi irtibatları kəsdi. Türk dilini fars dilinə təslim edən məzhəbi ideologiyanı dövlətin sınırsız gücü ilə yayqınlaşdırdı. Bunun harası qəhrəmandır? Onun qəhrəmanlığından bizə bugün bir yarar varmı? Kimdir onun qurduğu dövlətin varisi? Türkmənçay müqaviləsi olmasaydı indiki

Azərbaycan Respublikası da tarixi Səfəvi mühitində qalıb farslaşacaqdı.

**Azərbaycanda sizin kitabınızın əleyhinə xeyli yazılar yazılıb. Bu yazılara münasibətiniz necədir?**

Kitabımın iddia etdiyi görüşləri təqdir və tənqid edənlər var, qarşı çıxanlar da. Qarşı çıxanların çoxu İranın baxdığı yerdən tarixə baxmışlar. Azərbaycanda mifləşdirilən Şah İsmayıl surətinin yalan və iftira olduğunu ifşa etdiyim üçün onların çoxunun dünyaları dağılmış və sırf dünyası dağılmışların hissi münasibətidir o yazıların çoxu. Mən Səfəviləri fenomenolji bir yöntəmlə araşdırmağa çalışmışam. Yəni Səfəvi ideyasını, Səfəvi bilgisini və Səfəvi davranışını incələmişəm. Fenomenoloji yanaşmada durum “bilgi, davranış və ülkü (ideal)” üçbucağında incələnər. Nə qədər başarılı olmuşam bu başqa məsələdir. Mənim amacım ulusumuzu Səfəvi bataqlığından azad edib evrənsəl tarix anlayışına doğru sövq etmək olmuşdur. Millətləşmənin təməl şərtlərindən biri millətin öz tarixi ilə əqli baxımdan hesablaşmasıdır. Nədən çağdaş bir toplumun dünyagörüşünü Səfəvi qaranlığı doldurmalıdır? Bu kitab kimləri narahat edirsə, demək ki, düşündürür. Çünkü düşünmək rahatlığın nəticəsi deyil, düşünmək narahat ruhun işidir. Rahat adamlar və rahat toplumlar düşünməzlər, təqlid edərlər. Cahilcə inanarlar. Modernitə “mən inanıram”la “mən bilirəm”in sınırını bəlli etmişdir. Bu kitab bir çoxlarının inandığı “qəhrəman”ın gerçək üzünü ifşa etdiyi

üçün düşündürücüdür və narahat edicidir. Ona görə də belə təpkilər olacaqdı. Tarixdəki hadisələri dəyişdirə bilməyəcəyimiz bizim sual soruşmağımızı əngəlləyə bilməz. çünkü bu tarix indiki həyat tərzimizi də etkiləyir. Bu etkilərlə hesablaşmalıyıq ya yox? Keçmişi gələcəyə ülkü (ideal) olaraq göstərmək gələcəyi də qaranlığa gömmək deməkdir. Səfəvilər adında ancaq qorxunc bir qaranlıq var. Bunu nədən gələcəyə daşımalıyıq?

**Bu kitaba görə sizi "düşmən dəyirmanına su tökməkdə", xarici qüvvələrə işləməkdə günahlandırırlar. Bu fikirlərə cavabınız varmı?**

Öncə qavramların içəriyini deşmək və nə anlam daşıdığını tanımlamaq gərəkir. ”Düşmən” qavramına hansı bucaqdan durub baxmaq önəmlidir. Sovet və İran tarixçliyi bucağından baxıldığında mən gerçəkdən də düşmənəm və düşmən dəyirmanına su tökürəm. Azərbaycanın və İranda yaşayan Türklərin gələcəyi baxımından baxıldığında mən bir aydınladıcıyam. Tarixin aydınladıcısı. Yüzillərin qaranlığını aydınlatmaq toplumun alışdığı çirkin gələnəklərə qarşı gəlməkdir və bu çox təhlükəli işdir. Avropanın aydınlanma sürəcində yüzlərcə aydını sırf bu üzdən, yəni toplumun çirkin alışqanlıqlarına qarşı gəldiklərindən öldürdülər, yandırdılar. Mən özüm də İranda və ya Azərbaycanda olsaydım, bəlkə də indiyə öldürmüşdülər. Üzeyir Hacıbəylini, Mirzə Cəlili də düşmən, satılmış, kafir olaraq

görmürdülərmi? Görürdülər. Məni düşmən adlandırmaqla sorun çözülməz. Mən bu aydınladıcı çalışmalaram böyük bir sürətlə davam edəcəyəm. Gəlsinlər mənim yazdıqlarımı düşüncələri ilə və tarixi qaynaqlarla çürütsünlər. Mən bu kitabda öz açıqlamalarıma daha çox önəm verirəm. Qalan şeyləri başqa araşdırmaçılar da qaynaqlardan çxırıb tərcümə edə bilər. Ancaq tarix yazmaq sadəcə olayların zamanını təsbit etmək deyil. Üç tarix anlayışı var: 1- Nəqli tarix. Olayların gerçəkləşdiyi zamanları təsbit edib nəql edər. Azərbaycanda və İranda və Şərqdə yayqın olan tarix yazarlığı budur. Bir sürü olayların tarixini təsbit etmək. 2- Elmi tarix. Olayların səbəbini, nəticəsini və səbəb-nəticə arasında olan münasibətləri araşdırar. Bu tarix anlayışı Azərbaycanda yoxdur. 3- Tarix fəlsəfəsi. ”Tarix nədir?” sualına cavab arar və bəlli bir dönəmi tarixin bütünlüyü içində incələyər, zamanların ideyalarını araşdırararaq həm tarixi aydınladar, həm də düşüncə ürətər. İndiki zamanı aydınlığa qovuşdurmaq çox önəmlidir. Mən bu üç metoddan yararlanmışam.

**Bu yöndə araşdırmalarınızı davam etdirirsinizmi? Yeni araşdırmanız olacaqmı?**

Səfəvilər kitabım çap olduqdan sonra ortaya çıxan təpkiləri oxudum və Səfəvilər kitabımın davamını yazmağa qərar verdim. Bu kitab Səfəvilərdən günümüzə qədər kültürümüzdə, kimliyimizdə, dünyagörüşümüzdəki dəyişiklikləri

ehtiva etməkdədir. Ancaq bundan öncə Bayındırlı mədəniyəti üzərinə çalışacam. Hansı mədəniyəti Səfəvilərdən sonra itirdiyimiz gözlər önünə çıxmalıdır. Bu üzdən də Ruzbehan Xoncinin Bayındırlı dövləti və Bayındırlı mədəniyətinin tarixi üzərinə 15-ci əsrdə yazdığı ”Tarixi aləm arayi-Əmini” kitabını tərcüməyə başlamışam. Kimliyimiz və kültürümüz üzərinə ağlın və aydınlığın ışığı ilə zərrəbin tutmaq gərəkməkdədir. Rus mədəniyət tarixində Qoqolu zərrəbinə və Puşkini teleskopa bənzədərlər. Çünkü Qoqol Rus tarixindəki toplumu öz içindən çürüdən gələnəklərin üzərinə zərrəbin tutaraq onları böyüdüb ifşa edirdi. Puşkin isə, aydın bir gələcək təsvir edirdi. Mən düşünürəm ki, bu kitabımda həm zərrəbin, həm də teleskop yerləşdirmişəm. Kim hansını istərsə onu qullansın. Kitabım daha mükəmməl şəkli ilə yenidən çap olacaq. Gələcək nəsillər bunun üzərində çox dartışacaq və sırf bu kitab üzərinə yüzlərcə kitab yazılacaq. Kimiləri tənqid edəcək, kimləri də təqdir. Əminəm ki, yüzillər sonra təqdir edənlər daha çox olacaq və onlara mən indidən sayqılarımı çatdırıram, o aydınlanmaq istəyənlərə salam olsun! 2-3 aya kitaba bu qədər təpki gəlmişsə, görün yüzillərin axışı içində nə qədər təpkilərə yol açacaq. Mən bu kitabı sadəcə yaşayan nəsillər üçün yazmamışam. Çox uzaq gələcək üçün də yazmışam. Önəmli olan da bu düşüncə dartışmasını tariximizdə yaratmaqdır. Bizim tariximiz haqqında tənqidi düşüncələri özgələr yazmaz, özümüz yazmalıyıq. Gerçək anlamda

bir millət olmaq istəyiriksə, bu yolda irəliləmliyik.

Müsahibəni hazırladı: Cəlil Cavanşir.
17. 07. 2012

## Qaynaqlar


1- Oqtay Əfəndiyev, Azərbaycan Səfəvilər dövləti
2- İskəndər bəy Türkmən, Tarixe-Aləmaraye-Abbasi
3- Həsən Rumlu, Əhsən-üt Təvarix
4- Səid Nəfisi, İran ictimai tarixi
5- Qiyasəddin Xandəmir, Həbib-üs seyr
6- İsmail Mutlu, Tarihte ve Günümüzde Caferilik
7- İbrahim Əmini, Fütuhati-şahi
8- İnayət, Müasir İslamda siyasi düşüncə
9- Mahmud Xandəmir, Zili-tarixi həbib-üs seyir,
10- Qəzvini, Lobb-ul təvarix

